

**Tofiq Yusif (Hüseynov Tofiq Yusif oğlu) 1950-ci ildə Tərtər şəhərində anadan olub.**

**«Bir taleyin göynəmləri», «Tərtər şəhidləri», «Tərtər inciləri», «Qan iyi» və «Ömrümün payızı» kitablarının müəllifidir. Azərbaycan Yazıçıları Birliyinin, Azərbaycan Mətbuat Şurasının və Azərbaycan Jurnalistlər Birliyinin üzvüdür. «Qızıl Qələm» və «Məmməd Araz» mükafat-ları laureatıdır.**

*Tofiq Yusif*

# "MƏN"sizləşmə fəlakəti



*Tərtibçi və redaktor:* **Solmaz Kazımova**

Şair-publisist Tofiq Yusif «Bir taleyin göynəmləri», «Tərtər şəhidləri», «Tərtər inciləri», «Qan iyi» və «Ömrümün payızı» adlı 5 kitabın müəllifidir. Oxucuların istedadlı şair və nasir kimi tanıdığı Tofiq Yusifin **««MƏN»sizləşmə fəlakəti»** adlı yeni kitabı isə onun yaradıcılığında xüsusi yer tutur və biz burada müəllifi tam fərqli ampulada görürük.

Bu kitabda onun 1991-ci ildən üzü bəri yazdığı müxtəlif qəzetlərdə çap olunmuş satirik və publisistik yazıları toplanmışdır. Əsasən Qarabağ müharibəsinin ağrılarından bəhs edən bu yazılar həmin dövrü əks etdirən tarixi faktlara söykənməklə bu günkü və gələcəkdə yetişən gənc nəsil üçün bir dəyərli yaddaşdır.

# MÜƏLLİFDƏN

1991-1993-cü illərdə Azərbaycan elə ağır günlərə salınmışdı ki, bəlkə Allahın özü də bu vəziyyətdən baş çıxara bilməzdi. Bəşər övladının varlığında nə qədər məkr var, insanın xislətində nə qədər kin var tökülmüşdü bu ulu məmləkətin üstünə və bu yur-dun bəlası orasındaydı ki, öz övladları onu tikə-tikə doğrayıb it-lərə yem etmək istəyirdilər. Buna görə də ölkəni hərki-hərkinəlik, quldurluq, talan-qarət, cəzasızlıq, bir sözlə xaos bürümüşdü. Hansı silahlı banda nə istəsə, onu da edirdi – qardaş qırğınından tutmuş vətən torpağının alqı-satqısına qədər.

Mən həmişə real vəziyyətdən yazmağa çalışmışam – istər şeir- lərim olsun, istərsə də digər yazılarım. Amma bəzən mühit belə yazıları xoşlamır. Çünki bu mühiti formalaşdıran nankor məmur- lar istəmirlər ki, onların çirkin əməllərindən, çapıb-talamaq hə-risliklərindən, satqın mövqelərindən, xalqa vurduqları badalaq-lardan və nəhayət, öz tamahlarına bu Vətəni, bu Milləti qurban kəsmək niyyətlərindən kimsə xəbər tutsun. Lakin istəməsələr də, o zamanlar hamı xəbər tutur, hamı bilirdi ki, bu xalqın düşmən-ləri kimlərdir. Zor qarşısında fağırlaşdıqlarına görə ürəklərində-kini deyə bilmirdilər, hərəkət etməyə cürətləri çatmırdı.

Mən isə bunlardan yazmışam – bəzən satiranın dililə, bəzən bacardığım qədər ciddi.

1991-ci ildə Bahadur Tahirbəyovun baş redaktoru olduğu «Salam» qəzetində bölgə müxbiri işləyəndə mövcud vəziyyəti ye-nə olduğu kimi camaata çatdırmağa çalışmışam. Məsələn, Xocalı soyqırımından sonra, yəni Şuşa, Laçın, Ağdam və digər rayonla-rımız işğal olunmamışdan çox-çox əvvəl yazmışam ki, bu bölgələ-rimiz də əldən gedəcək, qoymayın! Amma Xocalının harayını eşitməyən qulaqlar mənim qəzetçi səsimi hardan eşidəcəkdilər ki?

Həmin illərdə (1991-1992-1993) xalqın dərdindən yazırdıq, deyirdilər ki, bunlar «Əliyevçi»lərdir, onları asmaq, kəsmək, öldürmək lazımdır və başımıza yüz oyun açırdılar. Nəticəsi isə o ol-du ki, məni Bakıdan «sürgün» elədilər, «Salam»ın redaksiyası darmadağın olundu, işgəncələrə məruz qaldıq, maşın qəzasına salındıq və s. və i.a



Bundan sonra həmişə məngənədə sıxıldım, əzildim, təqib olundum, maddi və mənəvi əzablara məruz qaldım. Nəhayət, 1996-cı ildə «Salam»ın köhnə kollektivi yığılıb Azərbaycan Vətən Müharibəsi Veteranları Birliyində «Fədai» adlı kiçik bir qəzet nəşr etməyə başladı. Bunun da ömrü çox az oldu. İndi də adımızı müxalifət qoydular. Nədir, nədir, Xalqın, Vətənin problemlərindən yazırdıq.

Düz yazdığımıza görə bizə yer olmadı. «Fədai»ni də dağıtdılar. Bizi yenə pərən-pərən saldılar.

Bundan sonra hara gedirdim, qapılar üzümə bağlanırdı, iş vermirdilər. Bir dəfə güc-bəla rayonumuzda özümə çox az ma-aşlı bir iş tapa bildim. 6 aydan sonra həmin ştatı da «ixtisara» saldılar. Halbuki mənim iki ali təhsilim vardı, iki kitab müəllifiydim, 30 ilə yaxın iş təcrübəsinə malik idim. Nə isə…

Bu yazıların çoxu həmin təbəddülatlı dövrlərə aiddir. Bə-ziləri «Salam» və «Fədai» qəzetlərində çap olunublar, bəziləri isə sonradan yazılanlardır.

Burada elə yazılar da var ki kitablar, insanlar və digər subyektlər haqqındadır.

Bu kitabın çapı mənim üçün yalnız bir məqsəd daşıyır – burada toplanan yazıların əksəriyyəti müharibə dövrünün abu-havasına büründüyünə görə bəlkə oxucu ovqatında bir Qarabağ nigarançılığı yaratdı. Yoxsa biz yaman unutqan millətik!

"Qarabağ niyə basıldı görəsən?!"



# TORPAĞIMIZIN FACİƏSİ
*(Cəbhə xəttindən xəbərlər)*

**Əcnəbi ölkələrdə adamların xəstə ürəklərini, beyinlərini dəyişirlər, bizdə isə budundan güllə yarası almış igidə qanı axıb qurtarana qədər çarə tapılmır. Dəhşətə bax, ilahi! Sovet imperiyası bizi nə yazıq günlərə qoydu!**

Dörd ilə yaxındır ki, mərkəzin əlində oyuncağa çevrilmiş manqurt «başbilənlərimiz» bostan oyuğunun – quşqorxuzanın xalqa verdiyi xeyir qədər xeyir verə bilmədilər. Nacins və namərd ermənilərin qarşısında qeyrətli xalqımızı qeyrətsiz bir buqələmuna döndərdilər. Bir gecədə yüzlərlə günahsız oğul-qızlarımızı qanlarına qəltan etmələri doydurmadı onları, güllələrlə xəlbirə döndərilmiş cəsədlərimiz vəhşilərin tankları altına salı-nıb heşan oldu, tikə-tikə doğranıb tırtılların ağzında qaldı. Əvə-zində bu kölə millətə «vəhşi» damğası basıldı.

Hələ də biri-birinin arxasınca bu ulu yurdun yurdsuz vətəndaşları öz havadarlarına arxalanıb quduran (arxalı köpək qurd basar) erməni təcavüzünün qurbanı olurlar. Öz **VƏTƏNİMİZDƏ** öz **TORPAĞIMIZI** öz **QANIMIZLA** suvarırlar. Biz isə indi də müharibəyə «milli münaqişə» donu geyindirməkdən əl çəkmirik.

Dörd ildə bizi qurbanlar verməyə elə öyrədiblər ki, insan ölümü gözümüzdə adi hala dönüb, vərdişə çevrilib. Faciəmiz də elə bundadır!

… Bir igid oğlumuz da bu günlərdə torpağımıza qurban getdi. İki körpə oğlu yetim qaldı. 27 yaşı vardı Qaçay Mehdiyevin, milisdə yenicə işləyirdi. Bu, Tərtərin 4-cü qurbanı idi.

Qaçayla səngərdə vuruşan milis işçilərindən Şahin Əhmədovun və Şahin Adıgözəlbəyovun, həmin günü onu müharibədə yoxlamağa getmiş əmisi oğlu Baloğlan Mehdiyevin və ətrafımı-za toplaşan digər doğmaların göz yaşları içində həm əsəbi, həm kövrək söhbətlərinə Qaçaygilin evlərindən gələn yanıqlı bayatı-

ların gürşad yağmurunda qulaq asdıqca adamın ürəyi göynəyir, bədəni ürpənir, nəfəsi təngiyirdi.

12 nəfər idilər. Bakıdan, Bərdədən, Yevlaxdan, Şəmkirdən

## 6
## «MƏN»sizləşmə fəlakəti

gələn el qoçaqları ilə çiyin-çiyinə yoldaşlarını əvəz etməyə, Goranboyun «Qan çanağı»na dönmüş Şəfəq kəndini yağılardan qo-rumağa könüllü yollanmışdılar. (Yevlaxdan 3 nəfəri silahsız gön-dərmişdilər, biri isə balta götürmüşdü).

Bu kənd ermənilərin yaşadıqları Qaraçinar kəndi ilə bitişikdir. Namərd qonşular Şəfəq kəndinin camaatını bütünlüklə pərən-pərən salıblar, kimin gücü nəyə çatıbsa onu götürüb evindən qaçmağa məcbur olub – mülklər sahibsiz qalıb. Burda dağılmış yurdu qorumaq üçün cəmi 10 nəfər kənd cavanı cürətli çıxıb.

Müsəlman qəbirsanlığını və oradakı künbəzi atəş məntəqəsinə çevirən erməni quldurları sentyabrın 23-dən 28-nə kimi müdafiə məntəqələrini ara-sıra avtomat atəşinə tuturdular. Məntəqə də deyəndə… Bizimkilər kənd məktəbinin həyətində açıq yerlərdə özlərinə müdafiə nöqtələri tapmışdılar. Düşmənlər həmin nöqtə-ləri ovuclarının içi kimi görürdülər. Buna baxmayaraq, hər həm-lədə layiqli paylarını alırdılar.

– 28-də müşahidə etdik ki, əks tərəfə əlavə qüvvə və hərbi tex-nika yığılır. Bu barədə kənddə dünən yaradılmış əlaqə aparatın-dan başqa heç nəyi olmayan qərargahın rəisi mayor Mövsümova (adını bilmirəm) məlumat verdik. O bu xəbəri əhəmiyyətsiz bir şey kimi qarşıladı. Gecə saat 9 radələrində gözlədiyimiz kimi bizi toplardan, «Alazan» raketlərindən və avtomatlardan 2 saata ya-xın güclü atəşə tutdular. Aparatla ön cəbhədən aralı qərargahı nə qədər köməyə çağırdıq, hay verən olmadı. Mayor qaçmışdı. Bi-zim uşaqlar, ələlxüsus Qaçayla Rafiq igidlik göstərir, erməniləri qəbirstanlıqdan bir addım belə irəliləməyə qoymurdular. Onlar indiyə kimi belə döyüşləri çox görmüşdülər, ermənilərin analarını ağlatmışdılar. (Əcəl də nədənsə həmişə yaxşıları seçib aparır!).

Şahin Əhmədov qəzəbdən boğula-boğula sözünə davam edir:

– Topun, raketin, minamyot və qrantamyotların qarşısında avtomat neyləyə bilər ki? Təşkilatçı yox, bir babat silah yox, həkim yox, dava-dərman yox. Gəl bu əclaflarla vuruş görüm, necə vuruşursan?! Bu dəfə də ermənilərin paylarını verdik.

Səhərisi günü axşam saat 5-də bizi yoxlamağa gəlmiş həmyerlimiz – xalq cəbhəçisi Əlibəy, milis serjantı Azad və Baloğlanla müşahidə yerinə getdik. Nə biləydik ki, bu gediş Qaçayın son gedişidir?!

## 7
## Tofiq Yusif

Divarın dibi ilə qısıla-qısıla geri qayıdırdıq. Məktəb həyətinin açıq darvazasının qarşısından keçəndə məndən arxada gələn Qacayın səsini eşitdim:

– Şahin, əclaflar məni vurdular, sən qaç, yoxsa səni də vuracaqlar!

Onun əlindən avtomat düşdü, səndirləyib yerə yıxıldı. İrə-lidə gedən Baloğlanı və Ərəstunu çağırdım. Qaçayı güllə yağış-ları altında divarın dibinə sürüyə bildik. O hər iki budundan ağırlıq mərkəzini dəyişən avtomat güllələrilə ağır yaralanmışdı və bulaq kimi axan isti qanın içərisində ağrıdan çabalayırdı. Onu elə güllə yaralamışdı ki, adicə yarpağa dəyəndə partlayıb qəlpələnir, vay o gündən ki, insan bədəninə dəyə! Sarğı olmadı-ğından yaranın yuxarı hissəsini kəmərlə sıxdıq ki, axan qanın qarşısı alınsın. Ermənilər indi də Qaçayı aradan çıxarmağa gəl-miş Əlibəyin maşınını güllə-borana tutmuşdular…

**Baloğlan Mehdiyev:** «Qaçay mənə maşında təsəlli verirdi: «Qorxma, heç nə olmaz, ölmərəm». Əvvəlcədən xəbər çatdırmağımıza baxmayaraq, xəstəxanada həkim yox idi, evlərindən çağırıb gətirdilər. Burada Qaçaya vurulmağa qan tapılmadı. Könüllü qan vermək istəyənlərin heç birinə məhəl qoymayan həkim təkid etdi ki, Gəncədən quru qan gətirilməlidir. Qan gələnə qədər isə Qaçay «şok»a düşüb keçindi. Ona vurulmalı olan qan Rafiqə qismət oldu».

**Şahin Adıgözəlbəyov:** «Sentyabrın 29-da, bazar günü gecə saat 10-nun yarısında erməni daşnaqları bizi yenidən güclü artilleriya atəşinə tutdular. Bütün məntəqələrimizi darmadağın etdilər. Biz geri çəkilməyə məcbur olduq. Ön cəbhədə yalnız bərdəlilər qaldılar. Düşmənlər kəndə soxulub onları mühasirəyə almağa başladılar. Bu barədə bərdəlilərə ratsiya ilə məlumat

vermək xahişimizi mayor yerinə yetirmədi. İndi də aydınlaşdıra bilmirik ki, o nə üçün belə etdi.

Bir az keçməmiş biz 5 nəfər, mayor Mövsümov və Yevlaxdan bir nəfər atəş altına düşdük. Mayor bizdən 10-15 addım aralı bir çalaya qısılmışdı. Onun üstünə hər tərəfdən od yağdırırdılar. Bizi köməyə çağırdı. Mayorun vurulacağını hiss edən patrul xidmət postunun vzvod komandiri, milis baş leytenantı



Rafiq Ağayev avtomatdan atəş aça-aça ona tərəf atıldı, ermə-nilərin diqqətini yayındırdı. Özünü su arxına tulladı, bədəni ör-tülsə də ayaqları açıqda qaldı və qəlpələr onun ayaqlarını topuq-dan yuxarı biçdi, sümüklərini parça-parça elədi. Mayor isə avto-matı tullayıb qaçdı.

Ayaqları dəridən asılıb yellənən Rafiqi güc-bəla ilə dərəyə sürüyə bildik. Gələcək bədbəxtliyinə indidən dözməyən Rafiqin gicgahına dirədiyi tapançasını əlindən zorla aldıq.

Kömək üçün maşın arxasınca gedən Rövşən Paşayev gecə saat 2-yə qədər qayıtmadı. Fikrimdən keçdi ki, onu da vurdular. Qərargaha  ratsiya ilə kömək çağırmağa gedən Etibar Hüseynov-dan və İlham Qəhrəmanovdan da xəbər yox idi. Rafiqin get-gedə ağırlaşan halı məni qorxudurdu. Onu dərdə tək qoyub yola tərəf qaçdım və qarşıdan gələn «Təcili yardım» maşını ilə rastlaşdım.

Sonradan Rövşən Paşayev danışdı ki, məni bura gələndə bir yoldaşdan xahişlə aldığım «bronjilet» xilas etdi – güllələr vıyıltı ilə ona dəyib dağılırdı. Zeyvə kəndinə qədər 7 kilometrlik yolu birnəfəsə qaçdım. Xilas etdiyimiz mayor orada idi. Kömək xahi-şimə onun: «Bir nəfərdən ötrü on nəfəri qırğına verə bilmərəm» – cavabı qanımı dondurdu. Goranboyun «Təcili yardım»ından  başqa oraya yığılan 100-ə yaxın maşının sürücülərindən heç biri gəlmək istəmədi.

Rafiq yol boyu da, xəstəxanada olanda da bütün ağrılarına kişi kimi dözdü, ağlayıb-sızlamadı. Lakin Qaçayın ölüm xəbərini eşidəndə hönkür-hönkür ağladı.

Onun 27 yaşı vardı. Ağdamın Paprəvənd kəndindən idi. Tər-tərdə milis şöbəsində işləyirdi. Bir aydan sonra isə toyu olası idi. Nişanlısı gözü yaşlı qaldı».

**Taleh Adıgözəlbəyov:** «Rafiqdən soruşdum ki, niyə mayoru xilas etmək üçün özünü ölümə atdın? O dedi: «Belə etməsəydim, özümü ömrüm boyu bağışlaya bilməzdim».

* * *

Ölümü gözləri ilə dəfələrlə görmüş bu «ciyərli» oğlanlar əlavə edib dedilər ki, onlar döyüşdə bərdəlilərdən 5 nəfərinin ağır yaralanmasını, 4 nəfərinin isə Bərdə Rayon Daxili İşlər Şöbəsinin rəis



müavini Aydın Qasımovun xilas etdiyini sonradan eşidiblər. Öyrəniblər ki, Yevlaxdan bir nəfər cəbhədaşları həlak olub. Dedilər ki, Şəfəqin müdafiəsi başlı-başına buraxılıb, döyüşü təşkil edən yoxdur, kim nə cür bacarır, elə də vuruşur. 9 saat davam edən qanlı vuruşmaya arxadan heç bir kömək göndərilmədi. Müdafiə üçün gətirilmiş 5 topdan 2-sini işlətmək mümkündür. Komandir isə bu toplardan atəş açmağa icazə vermir, deyir ki, döyüş mərmisinin birini 1000 manata, «yalançı» mərmini isə 300 manata alırıq, biz onları ata bilmərik. Təsadüfi hallarda atılan mərmilər isə ermənilərdən xeyli aralı – dağlara, təpələrə düşür. Dedilər ki, erməni təcavüzündən xilas olmaq üçün bizə yalnız öz milli ordumuz kömək edə bilər. Bu ordunu yaratmaq istəməyənlər isə millətin düşmənləridir.

Biz öz torpaqlarımızı qanımız bahasına qoruyuruq, ancaq kimlərəsə «Babək», «Cavanşir» adları verilir. Qanlı müharibələrdə yaralanan və ölən igidlərimiz haqqında «Məmməd Murad televiziyası» hissiz və soyuq bir cümlə işlətməklə bizim milli qürurumuzu təhqir edir. Yaxşı olar ki, heç belə məlumatlar verilməsin, getsin tərifləldiyini tərifləsin.

* * *

Görəsən ana torpağımızın bu ağır faciəsinə göz yuman yuxarı postlarda oturmuş vəzifə və pul düşgünlərinin birinin övladının biləkdən aşağı əlini bir erməni kəssə (öldürülməsini demirəm hələ), yenəmi kreslosundan bərk-bərk yapışıb, öz balasının intiqamını almaq üçün haradansa əmr gözləyər?

**«Salam» qəzeti,**

1991-ci il.



## KƏRƏMLİ YANĞISI

*(Cəbhə xəttindən xəbərlər)*

Kərəmlini də əlimizdən belə verdik getdi. O Kərəmlini ki, indi adını İmarət-Qərvənd qoyublar və əhalisi 3 il yarımdır respubli-kanın güman gələn bütün yuxarı instansiyalarına müraciət eləyib yalvarır: «Bizə kömək edin!». Bu ərazidə indi bircə Umudlu kən-di qaldı. Bu gedişlə onu da verəcəyik ermənilərə. Allah bilir, tari-ximizdə bu neçənci Azəri Yurdudur ki, Zəngəzurdan tutmuş İrə-van mahalına qədər, Göycədən başlamış Qazax, Laçın, Kəlbəcər dağlarına kimi gözümüz görə-görə düşmənlər qamarlayıb özü-nünküləşdiriblər. Biz isə dözürük. Daşımız, torpağımız, elimiz, obamız od tutb yanır, ata-analarımızı, qardaş-bacılarımızı yağı gülləleri doğrayıb biçir, dözürük. Arvadlarımızı, uşaqlarımızı di-ri-diri, zülümlə yandırırlar, dözürük. Evimizin içində başıqapazlı, gözüqıpıq olmuşuq, isti ocağımızdan qovulub meşələri, dərələri ailələrimizə sığınacaq seçməyə, kol-kosa pənah gətirməyə məcbur edilmişik! Kölə psixologiyamız isə sabunlu kəndir olub keçib bo-ğazımıza, nə bir yolluq ayağımızın altından kətili itələyib bu kən-dirdən cəsədimizi asmırıq, nə də qeyrətimiz çatmır ki, ana yurdu-muzu ilanxislətli namərd düşməndən təmizləyək!

Ata-baba yurdlarından qovulub Azərbaycana pənah gətirən yüz minlərlə didərginlərin dərdi az imiş kimi Azərbaycanın özün-dən özünə qovulan didərginlərin də dərdi bir yandan ürəklərimizi yara eləyib.

Ağdərəni Mardakertə döndərən naxələf ermənilərin yaşadıq-ları kəndlərlə – Zəriflinin qışlağı ( Zərdəxaç), Cəfərin çəpəri ( Ça-par), Qozlu körpü ( Qetalan), Həsən İrzlə (Haterk) – dövrələnmiş Kərəmlidə 205 ev, 360 təsərrüfat, 1300 nəfər əhali vardı. İndi isə «lələ köçüb, yurdu qan ağlayır». Sentyabrın 25-dən 30-na kimi – cəmi 5-cə gün ərzində 90-dan çox bina yandırıldı, camaatın mal-mülkü quldurcasına talan-qarət edildi.

… Çapar kəndinin erməniləri Kərəmliyə xəbər göndərdilər ki, imkan varkən başınıza çarə qılın. Onsuz da Kərəmli ilə bərabər Ağdaban, Yanşaq və Zallar kəndlərini Vardenisə ( Basarkeçərə) qatıb Qarabağın dərsini verəcəyik. Qaçanda Kürün bəri tərəfində



bənd almaq ağlınıza gəlməsin, o yana qaçın. Bu gün-səhərdə özümüz Bərdədə «Anahidin bulağı»ndan (?), donuzumuz isə Kürdən su içəcəkdir.

Kərəmlilər qaçmadılar. Ermənilər Dönməz Əzizovu güllə-ləyib öldürdülər. 95 yaşlı Zeynəb Əliyevanı evi qarışıq yandır-dılar. Aldıqları zəhərli güllə yaralarından Dilşad Alıyevanın ayağını kəsdilər, Mənzər Alıyeva da şikəst oldu, 13 nəfər kə-rəmlilinin qanı torpağa qatıldı, amma qaçmadılar. Ümid bəslə-dilər ki, özlərini millət qəhrəmanı sayan yumşaq kreslo sahib-ləri onlara arxa duracaq, heç olmasa vəd etdikləri kimi patron göndərtdirəcəklər. Ümidlər boşa çıxdı. Ağzından od püskürən silahların qarşısında əliyalın canlı sədd neyləyə bilər ki?

Yeddi milyonluq bir ölkə yəni o günə qaldı ki, altmış min nəfərlik quduz erməni ordusunu heşan eləyən bir Sultan bəyin təpərini özündə tapa bilmədi?!

Sutkalarla güllə və mərmilərin ölüm xofu altında «akop»-larda gözlərini bir kirpik çalımı belə yummayan, dodaqları susuzluqdan partlayıb çat-çat olmuş, ayaqları şiş gətirmiş Kərəmli oğullarından Pəhləvan Əliyevin, Sülfüdar Qarayevin, Famil Quliyevin, Yusif Həsənovun, İdris, Oqtay Əliyevlərin və onlarla digərlərinin başlarına gələnlərin qarşısında «dəhşət!» sözü zəif səslənir.

Gecə-gündüz gah bu evin, gah o birisinin qəfildən partlayıb yanmasından səksəkəyə düşmüş, hər addımlarını ölüm, qan iz-ləyən məsum arvad-uşağın girov düşəcəyindən ehtiyatlanan kərəmlililər, nəhayət, kəndi boşaltmağa məcbur oldular. Vəli Həsənovun oğlu ilə Vəkil Qarayevin qızının toy süfrəsini düş-mən

güllələri dağıtdığına görə yarımçıq məclis Tərtərdə davam olundu.

Kərəmlilərin ümidləri qırıldığından, inamları itdiyindən indi nə prezidentə, nə Ali Sovetə, nə təşkilat komitəsinə, nə də daxili işlər nazirliyinə inanmırlar. Çünki kömək görmədilər, çünki Haterk kəndində erməni quldurlarına bir dəfəyə bir «BTR», bir «ZİL-131», bir bortlu «UAZ» avtomaşını, 45 avtomat, 2 pulemyot, 2 qranatamyot, 6 aylıq hərbi sursat «bağışlayandan» sonra «girov düşən» əsgərləri yalvar-yapışla geri aldılar, hərbi




texnikanı və döyüş sursatını isə ermənilərə dədə malı elədilər ki, gedin bunları azərbaycanlıların üzərində sınayın, ermənilər də indiyə kimi «bu sözdən çıxmırlar». Haterkin sabiq kolxoz sədri, qatı cinayətkar İsgəndər İsgəndəryanı tutub milisə təhvil verdilər, onlar da bu dığadan «üzr istəyib» buraxdılar getdi baş kəsməyinə. 1923-cü ildə nəsli güllələnmiş, milis mayoru Şahlar Şükürovu və Aşıq Şəmşirin qızını namərdliklə öldürən Henrik Tamrazyanın bandasına dağlarda, dərələrdə at oynatmağa hələ də imkan verirlər, hələ də kolxoz sədri Gesonun, sovet sədri Razmi-kin qulaqları babaları Andranikin qulağı kimi kəsilməyib.

**GİLEY-GÜZARLAR, TƏKLİFLƏR.**

Təşkilat komitəsindən Kərəmliyə tez-tez gələn mayor Dadaş Rzayev hər dəfə də bizi silah göndərəcəyi vədi ilə aldadırdı.

* * *

Erməni deputatları Yerevandan Haterkə gəlib rus zabitləri ilə görüşüb söhbət aparırdılar, bizim deputatlar isə…

* * *

Azərbaycan televiziyası və mətbuatı döyüşlər haqqında çox vaxt yalan məlumatlar yayırlar.

* * *

Vəziyyəti sahmana salmaq üçün hərbi hissələr mütləq DQMV-dən çıxarılmalıdır. Onlara çəkilən xərc bizim özümüzə sərf edilsəydi, məsələ çoxdan həll olunmuşdu.

* * *

Bizə nə qənd, nə ət, nə də yağ lazımdır. Torpağımız olandan sonra hər şeyimiz olacaq. Silah verilsə biz dura-dura yurdumuzun ruslar tərəfindən qorunmasına ehtiyac qalmaz.

* * *

Volski yaramaz adamdır.

* * *

Biz suvereniksə mütləq milli ordumuz da olmalıdır.

* * *




Hərbi hissələrdə olan silahlar və texnika Azərbaycanda qalmalıdır, çünki indiyə kimi biz ruslara milyonlarla pul vermişik.

* * *

İndiki çağırışçılarımız mütləq Azərbaycanın ərazisini qorumalıdırlar.

* * *

Pasport rejimini yoxlayan zaman çox vaxt azərbaycanlıların silahlarını da yığırdılar.

* * *

DQMV-dən qovulan azərbaycanlıların hamısı öz ev-eşiklərinə qaytarılmalıdırlar.

* * *

Qan düşmənləri ilə barışıq baş tutan iş deyil. Bizi qovaladıqları kimi onlar da Azərbaycandan qovalanmalıdırlar.

* * *

Hazırda Kərəmlidə 200 nəfər silahlı əsgər, 2 «BTR» görəsən kimi qoruyur? Niyə onlardan soruşulmur ki, törətdikləri bu azğınlıqların qarşısında ermənilərə neyləyiblər?

**BƏZİ SOVET ƏSGƏRLƏRİNİN NAMƏRDLİYİ**

Düzdür, əsgərlərin də içərisində ermənilər tərəfindən öldürülənlər çox olub, onların ailələrinə «qara kağızlar» göndərilib, lakin namərdləri də az deyil.

Kərəmlilər danışırlar ki, bizim evlərin çoxunu sovet əsgərləri dağıdırdı. Onlar kolxoz texnikasını söküb hissələrini ermənilərə satırdılar, kəndə su çəkilişi üçün gətirilmiş boruları, tikinti materiallarını da onun kimi, kolxozun və məktəbin arxivlərini, poçtu əsgərlər darmadağın etdilər. Hərbiçilərin köməyilə ermənilər hazırda Kərəmlidə ev əşyalarını, binaların tirlərini, üst dəmirlərini söküb aparırlar. Qapılarda toyuq-cücə qalmayıb.

Sentyabrın 27-də evlərinə qayıtmaq istəyən kənd camaatını məhz əsgərlər kəndə buraxmayıblar. Yerli milis işçisi Elçin Almazovun həmin gün silahını, vəsiqəsini kobudluqla əlindən al-





dılar, formasını soyundurdular, həbs etdilər.

Kəndin boşaldığı günün səhərisi  öz evlərindən uşaqlarına yorğan-döşək götürmək üçün kəndə qayıdan Vəli Həsənovun, Bəhlul  Süleymanovun, Təvəkkül Qəhramanovun və Famil Zey-nalovun qarşılarını «BTR» – lə kəsən, avtomatlı əsgərlərdən ikisi onların gözləri qarşısında Vəkil Qarayevin evinin qapısını sındır-dılar, sahibsiz otaqlarda axtarış apardılar, sonra digər həyətlərə
soxulub, qalan toyuq-cücəni tutub apardılar.

Oktyabrın 16-da Tərtər şəhərinin sakini Yaqub Nəsibov ma-yor Dadaş Rzayev və qardaşı oğlu Tofiq Cəfərov bir nəfər ser-jantla Kərəmlidə vertalyotdan düşən kimi əsgərlər onları mühasi-rəyə alır, üst-başlarını axtarırlar və azərbaycanlıların ünvanlarına nalayiq söyüşlər söyürlər. Yaqub müəllimgil görürlər ki, ermənilər əsgərlərin gözü qarşısında evləri söküb dağıdır, mağazadakı un taylarını daşıyıb bölüşürlər.

Komendanta müraciət edirlər ki, bu vəhşiliyin qarşısını alsın. Komendant isə: «Ermənilər sizdən yaxşı adamlardır» – deyərək, əhəmiyyət vermir.

Arvad-uşaq çıxarıldığı gün Oktay Əliyevlə bərabər 8 nəfər kənddən uzaqlaşmağa macal tapmırlar. Onlar rus mayorundan xahiş edirlər ki, əsgərlərin yaşadıqları məktəb binasında gecələməyə icazə versin. O isə qəzəblənir: «Burdan elə rədd olun ki, gö-züm sizi görməsin!». Onlar gizlicə kəndin kənarında bir evdə qall-malı olurlar. Əsgərlər bunu bilib həmin evi atəşə tuturlar. Oktay-gil  qaçıb səngərlərdə gizlənirlər. Səhərə yaxın kənddən çıxanda evlər yanırdı…

## QAÇQINLARIN AĞIR VƏZİYYƏTİ

Azərbaycanın Gəncə, Mingəçevir, Ağdam, Bərdə, Yevlax, İmişli və digər bölgələrinə səpələnmiş Kərəmli qaçqınlarının yaşayış vəziyyətləri dözülməzdir. Hazırda Tərtərdə100-ə yaxın Kərəmli ailəsinin 400 nəfər üzvü dost-tanışlara, qohumlara sığınıb.

Elə ev var ki, 40 nəfər bir yerdə yatıb-durur. «El elə sığar, ev-evə sığmaz» deyiblər. Bunlardan biri də Şirinəli Hüseynovun Tərtərin H. Aslanov küçəsindəki 32№-li evidir. Ailənin ağbirçəyi





Saray xala ağlaya-ağlaya bildirir ki, kişi də, mən də aldığımız təqaüdlə güc-bəla dolanırıq. İndi vəziyyətimiz daha da ağır-laşıb. 40 nəfərin heç çayını çatdıra bilmirik. Allah mərdüməzar-lara lənət eləsin! Camaatı isti yuvalarından ayaqyalın-başıaçıq perik salıblar. Dolanışıq üçün heç nə götürə bilməyiblər. Qış da ki, qapının ağzını kəsib…

Kərəmlilər deyirlər ki, biz gec-tez öz kəndimizə qayıdacağıq. Amma indi silahsızıq. Müvəqqəti də olsa pasport qeydiyyatına alınmadığımıza görə bizi işə götürmürlər. Uşaq pulu, təqaüd be-lə ala bilmirik. Ərzaq malları almaq üçün bizə talon da vermir-lər. Çörəyə belə pulumuz çatmır. Sığınacaq üçün bir yer tapmı-rıq, yardım göstərilmir. Qarabağa Yardım Komitəsinin sədr müavini, Respublika Ali Sovetinin deputatı Cümşüd Nuriyevin isə Kərəmlinin bu hala düşməsindən guya ki, xəbəri yoxdur, mövcud vəziyyəti parlament də təkzib etmişdir. Ağlar günlərə qalmışıq. Elə bil bu yurdun övladı deyilik, hamı bizə kinayə ilə baxır…

Görəsən mikrofonlardan «mənim xalqım!» deyə qışqıran söz ustaları nə vaxtsa bu əzabkeş xalqın ağır dərdinə bir əncam çəkəcəklərmi?! Əlbəttə, yox. Çəksəydilər, çəkərdilər də!

**«Salam» qəzeti,**

31. 10. 1991-ci il.



*VƏHŞİLİK*

# YENƏ DƏ ÖLÜM…

Noyabrın 18-də Tərtər – Goranboy şosse yolunun 20-ci kilo-metrliyində saat 16 radələrində Sovet hərbçilərinin zirehli maşını Tərtərdən olan «D 94-77 AQ» nömrəli «Jiquli» markalı şəxsi maşını altına salıb əzmişdir. Maşının içində olan Tərtər şəhər 1№-li orta məktəbinin müəllimi, AXC Tərtər Şöbəsi Məclisinin üzvü Əvəz Əli oğlu Quliyev, şəhərin Sülh küçəsində yaşayan Eldəniz Calal oğlu Səmədov hadisə yerində həlak olmuş, şəhər sakinləri Şahin Hüseyn oğlu Abdullayev və Namiq Eldar oğlu Həsənov ağır vəziyyətdə xəstəxanaya aparılmışlar.

Hadisəni törədən hərbçilər «BTR»-i belə saxlamamış, heç nə etməyiblərmiş kimi həmin sürətlə də çıxıb getmişlər.

Onların hara getdikləri, zirehli maşının içərisində kimlərin olduqları həmişəki kimi yenə də naməlum qalır.

**«Salam» qəzeti,**
**19. 11. 1991-ci il.**



*YENƏ KƏNDİR MƏSƏLƏSİ*

# ÇİDAR

Bəzi şəhər «ceyilləri»nə əvvəlcə bu çidarın nə olduğunu izah edim ki, sonra mənimlə dava-dalaş salmasınlar və deməsinlər ki, hərəniz özünüzdən bir söz icad eləyib dilimizi korlamayın.

Təsəvvürünüzə belə bir mənzərə gətirin: dağ döşündə gözəl xalıya bənzər əlvan çəmənlik. Həmin çəmənlikdə qoyun və mal-qara sürüləri, onların yanında alov yalmanlı atlar. Atların qabaq ayaqları kəndirlə biri-birinə möhkəm bağlanıb. (Ona gö-rə bağlanıb ki, uzağa getməsinlər, həm də istənilən vaxt onları asanlıqla tutub minsinlər). Bax, həmin atların ayaqlarını biri-birinə bağlayan o kəndirə çidar deyirlər. İndi ki, çidar məsələsi aydın oldu, keçək məqsədimizə.

Bu zəhrimar pambıq yığımı gələr-gəlməz bir çox rayon mər-kəzlərinə girib-çıxan yolları başbilənlərin göstərişilə milis işçiləri (indisə polislər) kəndirlə, məftillə elə «çidarlayırlar» ki, nəinki maşınlar və piyadalar, hətta quşlar belə qorxularından oyana keçə bilməzlər. Bu yerdə mənim nəzərimə həmişə çidarlanmış atlar gəlir və bu şəhərləri də həmin atlara bənzədirəm – çidar-lanmış şəhərlər. Görəsən, bu binəva şəhərlər də yəni o atlar ki-mi harasa qaçıb gedə bilərlər ki, onları da çidarlayıblar? Və ya-xud

görəsən, ayə, bu çidarların pambıq yığımına bir xeyri var, ya yox? Bu sualı məndən soruşsalar, əlbəttə, deyəcəyəm ki, yoxdur. Çünki, gözlərimin şahidiyəm, məsələn, deyək ki, sən şəhərə girən kəsə yolu kəndirlə kəsmisən və məni qoymursan ki, şəhərə gedim. Deyirsən, get, pambıq yığ. Mən də pambıq yığmaq istəmirəm. Belə olan halda, sənin kəsdiyin kəsə yolla getməyəcəyəm, bir az əziyyət çəkib, o biri yolla çıxıb gedəcəyəm istədiyim yerə, amma səni söyə-söyə gedəcəyəm. Bir az yorulacağam, bir az vaxt itirəcəyəm, əgər maşınlayamsa, br az da benzin yanacaq və nəhayət, gəlib çıxacağam o yerə ki, ora gəlmək istəyirdim. Amma dərd orasındadır ki, xeyli əsəb korlayacağam. Sənin də pisliyin qalacaq özünə.

Bir də ki, soruşan gərəkdir, qağa, əgər pambıq yığımını təş-



kil elətdirə bilmirsənsə, kolxoz, sovxoz, (Allah bu «…xoz»ların evini yıxsın!) idarə, müəssisə, və təşkilatların ağalarına qarşı tələbkarlıq göstərib, el malının toplanmasına səfərbərliyə almağı bacarmırsansa, bu yazıq şəhərlərin günahı nədir ki, onları çidar-latdırırsan? Və yaxud xəstəxanaya gedən ağır xəstənin günahı nə-dir ki, onu şəhərin başına dolanmağa məcbur edirsən? Vallah, elə kəndlərin özündə avara-avara gəzib tüfeylilik eləyən cavanları bir yerə toplaşan pambıq yığmaq üçün sənə heç bir əlavə qüvvə lazım olmaz. Daha ehtiyac qalmaz ki, şəhərləri çidarlayasınız.

Caizdirsə, bir söz də deyim: «İşin təşkilini bacarmırsınızsa, elə özünüzü çidarlayıb oturun evinizdə, qoyun başqaları gəlib bu hoqqabazlığı nizama salsın.

Mənim deyəcəyim bu qədər, vəssəlam.

**«Salam» qəzeti,**
**1992-ci il.**



# DAĞITHADAĞIT

Dünən, yalan olmasın, hərənin – kolxozun sahə zootexnikindən tutmuş rayonun zınqrovlu vəzifə sahiblərinə qədər – altında bir dövlət maşını var idi. Saymaqla qurtarmaq olmurdu. Adları «dövlət maşını» olan, türklər demiş, bu dördtəkərli arabaların dörd təkəri də dövlət üçün deyil, onları minənlərin özləri, arvad-uşaqları və qohum-əqrəbaları üçün fırlanırdı. Bu gün də elə həmin qaydada fırlanır, amma azacıq «düzəliş» ediblər, yəni bu dövlət maşınları dönüb olub şəxsi maşınlar və əvvəlcə bircə qırıq da olsa qorxu-ürkü varıydısa, o da aradan götürülüb. Bu kəlmələri oxuyanlar təəccüblə sual edə bilərlər: «Burada qəribə nə var ki? Hamımız bir ağızdan demirik ki, özəlləşmə olsun? Bu da özəlləşmə, daha nə istəyirsiniz?». Bəli, haqlı suallardır? Amma mənim sözüm onda deyil. Sözüm ondadır ki, vallah, lap Göygöz Kosanın özü də dirilib gələrək ismiəcəm oxusaydı belə gözümüzü yumub-açınca bu boyda dövlət maşınını döndərib şəxsi maşın eləyə bilməzdi.

Deyirlər, pul kəsdiyi başa Əzrayılın da sorğu-sualı olmur. Babalı söz gəzdirənlərin boynuna, danışırlar ki, pul necə eləyibsə, qəttəzə dövlət maşınları da keçi qiymətinə satılıb (peşkəş verilsəydi bundan yaxşı olardı!) tamahı qılıncdan iti naxələf

adamlara, əksəriyyəti də ki, əməlli-başlı vəzifə və pul sahibləridir. Pah atonnan, xalqın düçar olduğu fəlakətlərdən də öz mənfəətləri üçün istifadə etməkdən çəkinmirlər! Ermənilərlə bacarmağa nə var ki?! Dad içimizdə olan naxələflərin əlindən!

Bir tərəfdən fikirləşirəm ki, elə yaxşı eləyib satıblar həmin maşınları, çünki onların dövlətə bir qəpiklik də xeyirləri-zadı yox idi. O biri tərəfdən fikirləşirəm ki, yuxarılardan him-cim olmasa, aşağılarda kim qurd ürəyi yeyib belə yekə qələtləri eləyərdi? Digər tərəfdən də fikirləşirəm ki, bəs bunların öz vicdanlarına, öz qeyrətlərinə nə gəlib? Axı, belə dağıthadağıt olmaz! Kim necə istədi və neçəyə istədi dövlət maşınını alıb eləsin dədəsinin malı?! Vallah, bu işin axırı yaxşı olmayacaq! Ya bu gün, ya sabah bu ölkənin yiyəsi gəlib dayanacaq həmin adamların başlarının üstündə və soruşacaq ki, balam, bu necə bazardı,



bu necə alqı-satqıdır? Onda bu sualın cavabı ağır bir daş olub düşəcək xalq malına xor baxan vicdansız nanəciblərin başına. Vallah, düşəcək! Onda Bərdənin, Ağdamın, Tərtərin, nə bilim da-ha haraların belə işbazları dönüb olacaqlar, necə deyərlər, «quş-baz» və gurumbultuyla gedəcəklər «quş quşlayıb, ov ovlamaq-larının» dalınca. Yedikləri də burunlarından fitil-fitil gəlib tökü-ləcək qənşərlərinə. Onda biləcəklər ki, ərən-ərən igidlərini torpaq uğrunda, namus, qeyrət uğrunda könüllü qurban verən Azər-baycan xalqının bu qara günündə elin malını, dövlətini öz kisə ciblərinə təpişdirən bişərəflərin aqibətləri necə olur.

Vallah, bu ölkənin yiyəsi gəlib çıxacaq! Yox, əgər mən deyən olmasa… onda daha bu hökumətin əvvəlki hökumətlərdən nə fərqi varmış ki?!

**«Salam» qəzeti, 1992-ci il.**



# CƏBHƏ XƏTTİNDƏN XƏBƏRLƏR

Ermənilər Tərtərə xəbər göndərmişdilər ki, onların müsəlman bayramlarını yasa döndərəcəyik. Döndərdilər də. Quldurlar martın 18-də ilin axırıncı çərşənbə axşamının gecəsi saat $3^{00}$ radələrində Ağdərə rayonu ərazisindən Tərtər şəhərini «Qrad-2» və «Kristal» tipli raketlərlə güclü atəşə tutdular. Bir dəqiqənin içərisində 20-yə qədər ev və inzibati bina dağıdıldı, 3 nəfər həlak oldu, 6 nəfər ağır yaralandı.

İndi erməni başkəsənlərinin Azərbaycan torpağında apar-dığı qanlı və təcavüzkar müharibənin ən qaynar və ən qorxulu nöqtələrindən biri də Tərtərdir. Rayonun Ağdərə ilə həmsərhəd məntəqələrinə düşmənlərin güclü döyüş texnikasının və silahlı birləşmələrinin cəmləşməsi davam edir.

* * *

Tərtər rayonunun hərbi komendantı Məhəmməd Hatəmi-nin əmrləri ilə 17 mart 1992-ci il tarixdən rayonda hərbi vəziy-yət

tətbiq olunmuş və 15 nəfərdən ibarət qərargah yaradıl-mışdır. Qərargahın rəisi vəzifəsinə podpolkovnik Yunis Bayra-mov təyin edilmişdir.

Hazırda rayon ərazisində saat $22^{00}$-dan $6^{00}$-dək komendant saatı həyata keçirilir. Rayonun giriş və çıxış nöqtələrində nəzarət məntəqələri yaradılmışdır. Yeməkxanalarda spirtli içkilərin satılması qadağan olunmuşdur. Rayon ərazisində yerləşən bütün müdafiə qüvvələri hərbi komendantlığa tabe edilmişdir.

Hərbi komendantlığın əhali arasında belə bir müraciəti yayılmışdır: «Şəhər və kəndlərdə erməni xofu ilə adamları qorxudur, yer-yurdlarından didərgin salırlar. Belə diversiyalara inanmayın. Əhalinin təhlükəsizliyini qorumaq üçün kifayət qədər qüvvələrimiz vardır. Qeyrəti olan şəxs öz doğma evini qoyub qaçmaz».

* * *

Azərbaycan Respublikası Ali Sovetinin sədri Yaqub Məmmədovun və Müdafiə Naziri Rəhim Qazıyevin Tərtər rayonuna



gəlişlərindən keçən dövr ərzində əhalidə müəyyən ümid yaransa da, hər gecə döyüş gedən cəbhə xəttində hələlik elə bir müsbət dəyişiklik nəzərə çarpmır.

* * * * *

Rayon idman komitəsinin sədri Sabir Zeynalovun iştirakı ilə istehlak cəmiyyətinin işçisi Azər Bayramov və ət tədarükü idarə-sinin işçisi Dəyanət Məhərrəmov öz vəsaitləri hesabına Tərtəri er-məni təcavüzündən müdafiə edən Gəncə ərazi-müdafiə batalyo-nunun və Milli-Qurtuluş batalyonunun döyüşçülərinə 2000 qutu siqaret alıb paylamış və 80 kq ətin xörəyini hazırlatdırıb vermiş-lər.

**20. 03. 1992-ci il**

Benzin qıtlığı Tərtərə də çatmışdır. Bəzi pulgirlər 20 litr «A-72» markalı benzini 150 manata, hətta 170 manata satırlar.

Bazarda bir hünduşkaya 450 manat, bir çolpaya 120 manat qiymət qoyulmuşdur və onları həmin qiymətlərə almışlar.

* * *

Bir neçə gün əvvəl erməni quldurları Ağdərə (keçmiş Mardakert) rayonu ərazisindən Tərtər şəhərinə 3 raket atmışlar. Raketlərdən biri elektromexanika zavodunun həyətinə, biri yaşayış evinə, biri isə çoxmənzilli yaşayış binalarının qarşısına düşərək partlamışlar. Ölüm olmamışdır. Lakin azyaşlı uşaqlar möhkəm qorxduqlarına görə raket düşən sahələrə yaxın evlərdə səhərə qədər heç kim yatmamışdır.

* * *

İki aya yaxındır ki, şəhərin kasıb məhəllələrinə qaz buraxılmır, «yüksək zümrədən» olanların yaşadıqları küçələrdə isə öz əvvəlki qaydası ilə az qalır ki, boruları partlatsın. Qaz istismarı idarəsinin başbilənləri məsləhət görürlər ki, kasıblar da köçüb həmin küçələrdə yaşasınlar. Camaat məcbur qalıb çoxmərtəbəli ev-



lərdə odun peçi qurublar. Odun isə tapılmır. İşıqlarda ki, o söz… Buna görə elektrik peçləri də kara gəlmir.

Əlavə: atalar məsəli: «Qorxma qışdan, çünki qarşıdan yaz gəlir».

* * *

Yanvarın 20-də şəhidlərin 2-ci ildönümü ilə əlaqədar olaraq Tərtərdə də matəm mitinqi keçirilmiş, abidə önünə əklillər qoyulmuş və ehsan verilmişdir.

**20. 01. 1992-ci il**

Erməni quldurları Tərtəri əsl döyüş meydanına çevirmişlər. Şəhər son günlərdə raketlər, top mərmiləri və başqa döyüş silahları ilə müntəzəm atəşə tutulur, evlər, sənaye obyektləri dağıdılır, günahsız adamların qanı axıdılır. Təkcə fevralın 26-da ermənilər raket və mərmilərlə şəhərin bir neçə obyektini dağıtmış,

nəticədə 4 nəfər (Tərtərdən, Bərdədən, Yevlaxdan və Bakıdan) ölmüş, onlarla adam yaralanmışdır.

Məktəblər və uşaq bağçaları 2 aya yaxındır ki, işləmir.

İndi bütün azərbaycanlılar kimi tərtərliləri də bir ciddi sual narahat edir: «Respublikamızdakı rus ordusunun silahlarından və əsgərlərindən kefi istədikləri kimi istifadə edən erməni quldurlarının bizə hər gün vəhşicəsinə divan tutmalarına nə vaxt və kimlər son qoyacaqlar?».

* * *

Ağdərə rayonu ərazisindən erməni vəhşilərinin Tərtəri raketlərlə və top mərmilərilə güclü atəşə tutmalarından, göydə silah və erməni yaraqlıları ilə dolu hərbi vertalyotların fasiləsiz və sərbəst uçaraq ermənilər yaşayan torpaqlarımıza maneəsiz enmələrindən qorxuya düşən bəzi həmyerlilərimiz ev əşyalarını, qiymətli ayın-oyunlarını, hətta arvad-uşaqlarını da «xata ocağı»na dönən Tərtərdən uzaqlaşdırmışlar.

## 24
## «MƏN»sizləşmə fəlakəti

Bəlkə də bu köçhaköçdə heç kimin günahı yoxdur. Axı, Qara-bağın Tərtər boyda neçə-neçə məskəni, o cümlədən Xocalı şəhəri ermənilər tərəfindən dağıdılaraq yerlə yeksan edilmiş, minlərlə arvad-uşaq, qız-gəlin əzabla öldürülmüş və girov götürülmüşdü. Onların harayına isə nə əvvəl, nə də sonra heç kim yetməmişdir.

* * *

İçimizdəki bəzi satqınlar haranı daha çox bombardıman etmək lazımdır o yerləri fişənglə üç addımlığımızda olan Marquşe-van kəndində səngər qurmuş toplu-tüfəngli ermənilərə isnad ve-rirlər.

İndiyə kimi bu satqın əclafları aşkar edib üzə çıxaran yoxdur.

* * *

Son günlərdə Tərtərdə 1 kq-lıq / ? / çörəyin qiyməti 3 manat 50 qəpikdən aşağı düşmür.

* * *

Rayonda mövcud olan iki benzindoldurma məntəqəsində tapılandan-tapılana dizel yanacağından da keyfiyyətsiz olan benzinin litrini 3 manatdan satırlar, hamı da ağzına su alıb susur.

* * *

Son bir ayda Tərtərdə qoyun və mal ətinin qiyməti həndəsi silsilə ilə artır. Mütəxəssislər belə güman edirlər ki, bu artımla Novruz bayramına qədər 1 kq ətin qiyməti bəlkə də 150 manatı ötüb keçdi.

* * *

Tərtərin bazarında indi yumurtanın birinin qiyməti onu yumurtlayan toyuğun bir az əvvəlki qiymətindən bahadır.

* * *

Kasıblar şikayətlənirlər ki, Tərtərdə yağ, qənd, şəkər tozu, pendir və daha nələr tapılmır. Yalan deyirlər, bazarda hər şey var, özləri ala bilmirlər.

* * *

## 25
## Tofiq Yusif

Deyirlər ki, heyvanlar tısbağanı içməli su dalınca göndərir-lər. Bir neçə saat keçir, tısbağadan xəbər-ətər çıxmır. Dostları bu ləngliyinə görə onun qarasına gileylənirlər. Bu zaman tısba-ğa kolun arxasından çıxıb deyir: «Siz ki, beləsiniz, onda mən heç su gətirməyə getmirəm, özünüz gedin».

Tərtər rayon məscidinin təmir olunub məscid halına salınması işi bu əhvalata bənzəyir.

**1992-ci il.**

# PƏRAKƏNDƏLİK

Tərtər rayon ərazi müdafiə batalyonu döyüşçülərinin yanlarında oldum. Onların postlarda gecə və gündüz, qarda, yağışda, güllə qabağında xeyli əzab-əziyyət çəkdiklərini, hərbi sursatlarının çatışmadığını müşahidə etdim. Amma hər gecə Tərtərdə havayı yerə atılan, onsuz da səksəkə içində yaşayan camaatı qor-xuya salan güllələrin də şahidi olmuşdum.

Döyüşçülərlə söhbətimizdən məlum oldu ki, hər üç nəfərdən birinə silah çatır, ya çatmır. Gəncədən və Bakıdan köməyə gəlmiş milli müdafiə dəstələrinin, rayon daxili işlər şöbəsinin və ərazi müdafiə batalyonunun döyüşçüləri arasında pərakəndəlik var, onların vahid müdafiə və əməliyyat planları yoxdur. Bu qüvvələri birləşdirib, real olaraq vahid bir komandanlığa tabe etmək, dö-yüşçülər arasında ciddi hərbi intizam yaratmaq indi əvvəlki gün-lərdən daha çox vacibdir.

Məhz bu pərakəndəliyin nəticəsidir ki, ermənilərin hücumun-dan müdafiə olunarkən döyüşçülər arasında xeyli ölüm və yara-lanma halları baş verir. Gecə hədər yerə atılan güllələr də özba-şınalığın nəticəsidir.

Ərazi müdafiə döyüşçülərinin sosial təminat məsələləri hədd-dindən çox yarıtmazdır. Onların özləri bir yana, uşaqları üçün qanunla nəzərdə tutulan ödənişlərin verilməsində belə süründür-məçilik və bürokratçılıq təzahürlərinə son qoyulmur, aylarla bu müavinətləri ala bilmirlər. Döyüşçülərə heç bir iqtisadi yardım göstərilmir.

### ƏSİRLİKDƏN BURAXILMIŞDIR

Fevral ayının əvvəllərində Tərtər rayonunun Cəmilli kənd sakini Komandir Rüstəmov özünə məxsus 64 baş qoyununu otardığı yerdə ermənilər tərəfindən girov götürülmüş, 14 gün Çaylı kəndində əsir saxlanmış, yalnız kənd camaatının topladığı 40 min manat pulu aldıqdan sonra onu geri qaytarmışlar.

K. Rüstəmovun bəxti onda gətirib ki, «OMON»çu olmayıb, yoxsa ermənilər onu həmin günlərdə toyları olan bəylə gəlinin ayaqları altında qurban kəsəcəkmişlər.



### QULDURLAR KƏNDİ TƏRK ETMİŞLƏR

Martın əvvəlində Tərtər rayonunun müdafiəçiləri ilə bir-likdə Ağdamın milli qüvvələri Ağdərə rayonunun Seysulan kən-dində yuva salmış erməni quldur ocağını ləğv etmişlər. Hər iki rayon üçün həmişə ciddi təhlükə törədən bu strateji nöqtəni tərk edərkən erməni yaraqlıları 4 nəfər müdafiəçimizi öldürmüşlər. Yaralananlar da olmuşdur.

### BAŞ SAĞLIĞI VERMİŞLƏR

Tərtər rayonunun ərazi müdafiə batalyonunun şəxsi heyəti baş leytenant Axundov Talıstan Cahangir oğlunun erməni yaraqlıları ilə döyüşdə qəhrəmancasına həlak olduğuna görə mərhumun ailəsinə dərin hüznlə baş sağlığı vermişlər.

### BİLDİRİŞ

Bütün qohumlarımın, dostlarımın, tanışlarımın və həmkarlarımın nəzərinə çatdırıram ki, bu günlərdə bizə qonaq-zad gəlib eləməsinlər, yoxsa bunu düşmənçilik hesab edərəm. Çünki ermənilərin Tərtəri topa, raketə tutmasından başqa 180 manata ət, 180 manata yağ, 70 manata düyü, 80 manata qənd, 210 manata çay, 2 manat 50 qəpiyə yumurta, dəstəsi 3 manata göy, 10 manata kələm və sizin üçün mütləq açılmalı olan süfrəyə daha nələr almağa imkanım yoxdur. Belə getsə, deyəsən, əziz bayramımız olan Novruzu da əli boş qarşılayacağıq.

**P. S. Tərtər əhlinin çoxu mən günlüdür.**

**ELAN**

8 Mart Beynəlxalq Qadınlar Bayramı münasibətilə hədiyyə almaq imkanı olmayan tərtərli kişilərə məsləhət bilinir ki, maaşlarına qənaət edib indidən heç olmasa kişi odekalonu alsınlar ki, gələn il bəlkə o da tapılmadı.

**mart, 1992-ci il.**



Milli Ərazi Müdafiə Batalyonun döyüşçüsü, tərtərli Eldar Məmmədov kəşfiyyatdan qayıdarkən quldurların mühasirəsinə düşdü, ağır döyüşdən sonra düşmənlərin əlinə düşməmək üçün sonuncu gülləsini özünə sıxdı. Sağ-sağ əsir düşmək istəməyən Eldar öləndən sonra əsir düşdü. Onun meyidi ermənilərdən çox çətinliklə alındı. 2 oğlu indi də atalarını gözləyir!

Ali təhsilli müəllim, həmyerlimiz Əvəz Quliyevi getdiyi maşında, üç nəfər yoldaşı ilə birgə rus ordusunun zirehli döyüş maşını qəsdən altına salıb xıncım-xıncım etdi. Üç körpə qızı, cavan yoldaşı və qoca anası ağlar qaldı.

Bu sonu görünməz «Qara siyahı»nı Tərtərdə şəhid olanların adları hesabına xeyli uzatmaq da olar. Lakin adamın ürəyi gəlmir, göz yaşları imkan vermir.

Martın 18-də (axırıncı çərşənbə gecəsi) Tərtərin dinc əhalisinin başına gətirilən müsibət az imiş kimi, aprelin 9-u gecəsindən başlayaraq bu günə kimi Mardakert (indi guya adını Ağdərə qoymuşuq) rayonun Qırmızıkənd, Marquşevan, Marağa, Çaylı kəndlərindən erməni quldurları başımıza od ələyirlər. Ölənlərin, yaralananların, itkin düşənlərin sayı bilinmir.



*MÜHARİBƏ MEYDANLARINDA*

## NİYƏ KÖMƏK ETMİRSİNİZ?

Hazırda müharibə meydanına çevrilmiş Tərtərdə Vətən torpa-ğı uğrunda ömürləri yarımçıq qalan oğul və qızlarımızın, öz yurd-larında qanları axıdılan, öz dədə-baba ocaqlarında düşmən güllə-lərindən, raket qəlpələrindən qolları, qıçaları üzülən, işıqlı həyatı görmək səadətindən məhrum olan igidlərimizin sayı faciəli gün-lərimizin sayı qədər çoxalır.

Milli Ərazi Müdafiə Batalyonunun zabiti, Tərtərin Borsunlu kəndindən olan Talıstan Axundov «Seysulan əməliyyatı» zamanı ermənilərin yaşadıqları Marquşevan kəndi yaxınlığında qətlə yetirildi. Kiçik yaşlı bir oğlu yetim qaldı.

Tərtərin müdafiəsi üçün köməyə gələn «Milli Qurtuluş» batal-yonunun zabiti, yevlaxlı Cahangir həmin döyüşdə erməni qul-durları tərəfindən öldürüldü. 2 kiçik yaşlı oğlu atasız qaldı.

Hanı bəs yuxarı kürsülərdə əyləşib: «Vətən, Vətən!» – de-yən, qeyrətdən, namusdan dəm vuran kişi qırıqları?! İtirdiyimiz Vətən torpaqları, Qarabağın başına gətirilən müsibətlər onlara bəs eləmirmi? Bu xalqın daha hansı qara günlərini görmək istəyirlər?

Bunlar bir yana, müharibədə ölüb-itən qəhrəmanlarımızın ailələrinə xarici dövlətlərdənmi kömək gözləyək? Niyə onlara kömək etmirsiniz? Sizin yüksək mərtəbələrə çatdıran, gen-bol və ehtiyacsız həyatınıza qabarlı əlləri ilə təminat yaradan, qay-ğısız yuxularınıza bal qatan həmin ailələr deyilmi?

Yenə sağ olsun kasıblar!

Tərtər rayon Əhalinin Məşğulluq Mərkəzi işsizlərin təqaüdləri və müavinətləri hesabına onların öz təşəbbüsləri ilə Tərtərin müdafiəsi uğrunda şəhid olanların uşaqlarına bu ilin fevral ayından başlayaraq yetkinlik yaşlarına çatana kimi hər ay 100 manat məbləğində yardım göstərməyə başlamışlar. İmkansız işsizlərin özlərinə kömək lazım olduğu halda, bu xeyirxahlıqlarından görəsən varlı təbəqələrimiz bir nəticə çıxaracaqlarmı?

Hər ehtimala qarşı, yetim qalan bəzi uşaqların siyahısını və hesab nömrələrini sizin nəzərinizə çatdırmağı lazım bilirik.

1. Quliyeva Fidan Əvəz qızı – Tərtər Əmanət Bankı, №3542, əmanət kitabçasının №si 116.
2. Quliyeva Mehriban Əvəz qızı --------------- 117.
3. Quliyeva Firuzə Əvəz qızı --------------- 115
4. Axundov Orxan Talıstan oğlu --------------- 119
5. Məmmədov Seymur Eldar oğlu --------------- 120
6. Məmmədov Sərdar Eldar oğlu --------------- 118
7. Kərimov Fuad Cahangir oğlu – Yevlax Əmanət Bankı, №3541, Əmək kitabçasının №-si N-326
8. Kərimov Elçin Cahangir oğlu ------------- N-327

**«Salam» qəzeti,**
**13. 04. 1992-ci il.**



***OXUCULARDAN KÖMƏK İSTƏYİRƏM***

# QARABAĞIN SUALLARI

Hörmətli oxucular!

Mən indi ən təhlükəli müharibə rayonlarından biri hesab edi-lən Tərtərdə yaşayıram və hər gün Qarabağın döyüş gedən rayon-larında oluram. Yanımda mərmilər partlayıb, başımın üstündən vıyıltı ilə güllələr şütüyüb keçib, ölənlərin, yaralananların ətürpə-dən fəryadlarının şahidiyəm, uçan «Alazan»ları, evləri-eşikləri dağıdan «Qrad»ları, «Kristal»ları öz gözlərimlə görmüşəm. Bu ərazilərdə yaşayan qardaş-bacılarımızın indiki ürəkgöynədən dər-di də, kədəri də mənə çox yaxındır, doğmadır. Başlarına yüz faciə gətirilən saysız-hesabsız yurd-yuvalarımız, ölənlərimiz, itənləri-miz bir yana, Xocalı soyqırımı, Xocalı dəhşəti, Xocalı genosidi, Xocalı faşizmi, Xocalı xəcaləti Qarabağın hələ qaysaq tutmağa macal tapmayan sinə dağlarının üstündən yenidən elə çalın-çarpaz dağ çəkdi ki, yaralı sinəsindən al qan fışqırdı, hikkədən oğullarının gözlərinə qırmızı pərdə gəldi, əlacsızlığın xəcalətindən başlar kökslərə endi, naləsi, fəryadı göylərə bülənd oldu Xocalının, lakin harayına heç kim yetmədi, köməksiz qaldı, zirehli tora salındı Xocalı. Cavan oğullarımıza, qızlarımıza, ağsaqqal-ağbirçəklərimizə, hətta qundaqda olan körpələrimizə vəhşiliklə divan tutdular.

Mən də bilirəm, siz də bilirsiniz ki, müharibə ölüm deməkdir. Lakin Xocalı qırğınındakı ölüm müharibə ölümü deyildi, bu, dəhşət idi, bu, bir xalqın bəşər tarixində görünməyən qanlı-qadalı faciəsi idi! Mənə elə gəlir ki, «dəhşət», «faciə», «qırğın», «vəhşilik» sözləri xocalıların başına gətirilənlərin yanında heç nədir. Azərbaycan dilində Xocalı dəhşətini ifadə edən söz yoxdur.

Nəhayət, inanıram ki, Azərbaycanı Xocalı namussuzluğuna düçar edənləri bu xalq bağışlamayacaq! Xalq bağışlasa da, Allah bu intiqamı yerdə qoymayacaq! Həm də inanıram ki, bu gün Xocalının başına gətirilən müsibətlər sabah bu faciəni törədənlərin də, onlara şərait yaradıb köməklik göstərən qeyrətsizlərin də mütləq öz başlarına gələcək! Öz başlarına gəlməsə də, oğullarının, qızlarının başlarına gələcək! Tanrının səbri genişdir.



Möhtərəm oxucular!

İndi Qarabağda bir çox ağrılı suallar dolaşır ki, onların məchul cavablarını tapmaqda acizəm. Bəlkə siz mənə kömək edəsiniz?

1. Xocalını qəsdən qırğına verən başbilənlərimizdən birinin qızı, bacısı həmin şəhərdə mühasirədə qalsaydı, görən yenədəmi əhali köməksiz qalacaqdı?
2. «Namusu itə atıblar yeməyib» – deyən dədələr bütöv bir xalqın namusuna təcavüz etmək üçün yağı və qəddar düşmənlərə şərait yaradanlara nə ad verərdilər?
3. Bu respublikanın başında nə vaxt qeyrəti və ağlı olan bir adam dayanacaq?
4. Qarabağı qəsdən əldən verəndən sonra hay-küy qaldırıb: «Düşmənlər tərəfindən zəbt olunmuş torpaqlarımızı mütləq qaytaracağıq!» – deyənlər iş-işdən keçəndən sonra tuman bağını bərkidən qarıya oxşamırlarmı?
5. Qarabağın başına bu müsibətlərin gətirilməsinə şərait

yaradan, Azərbaycan xalqını düşmənlərdən də betər ağlar günlərə qoyan, onun qeyrətinə, namusuna qara ləkə salan respublikanın keçmiş başbilənləri görəsən daha nələr etməliydilər ki, bugünkü parlamentimiz onlara ayda 5 və 10 min manat deyil, 20 və 30 min manat «zəhmət haqqı» ayıraydı?

6. İndiki prezident aparatı ilə keçmiş Mərkəzi Komitənin arasında hansı fərqlər vardır və indi orada kimlər işləyir?

7. Köhnə hamamın içində dəlləklik eləyən və köhnə hamamda köhnə tasla çimməyə öyrənmiş dəvələrin «Dəyirman öz işində, çax-çax baş ağrıdır» şüarı bu başıbəlalı xalqın başının üstündən nə vaxt götürüləcək?

8. Bu gözləməklə Xocalıdan sonra daha hansı namussuzluğu gözləyirik?

**«Salam» qəzeti,**
**25. 03. 1992-ci il.**



***KİMİN XƏTRİNƏ DƏYSƏ, SU İÇSİN***

# NANKOR MİLLƏT

***Bizi özümüzdən qoru, ilahi!***

Dünya üzünə gələndən biz müsəlmanlar hamımız deyirik: «Bu erməni milləti ki, var, çox nankor millətdir». Sonra da hərəmiz onların anadangəlmə nankor olmalarını sübut eləyən yüzlərlə mi-sallar gətiririk və başlayırıq sözdə kölgələrini qılınclamağa. Bəzi-lərimiz deyirik ki, özümüzü fağır göstərib, qudurtmuşuq bunları, ona görə də vədə çatan kimi rəhmətlik Molla Nəsrəddinin eşşəyi tək başlayırlar şıllaq atmağa. Bəzilərimiz də deyirik ki, yox, gü-nah bizim ta keçmişimizdən bu günə qədər hakimiyyətə atgetməz yollarla gəlmiş cəllad, sonra müti, sonra yaltaq, satqın, şöhrətpə-rəst, daha sonra pulgir və rüşvətxor başbilənlərimizdədir, üz ve-rib, boylarını sevib başımıza çıxarıblar, indiyə kimi on min hek-tarlarla gözəl torpaqlarımızı hərrac bazarına qoyub satıblar bu köpəkuşağına! Onların da tamah dişləri qaban dişlərinə dönüb, elə hey deyirlər ki, yenə verin, yenə satın torpaqlarınızı. Nəyinizə lazımdır ki? Siz də bizim kimi «Böyük Ermənistan» yaratmaq istəmirsiniz ha!

Biz də onların bu sözlərindən utanıb, yenə satırıq torpaqlarımızı və elə belə də fələyin çərxi kimi ta yaranışımızdan dövr eləyir bu alqı-satqı və o qeyrət ki, bizdədir, elə belə də dövr eləyəcək.

Bəzilərimiz də deyirik ki, yox, günah xalqımızın özündədir, anadangəlmə dərimiz qalındır, isti çox gec keçir bədənimizə, ya qanmırıq, ya da qana-qana qeyrətsizlik eləyirik. Ermənilər isə yüz illər boyudur hər dəfədə bir bəhanə ilə al qanımızı torpağımıza qarışdırır, yurdlarımızdan didərgin salıb, öz doğma elimizdə, obamızda qəribə, qaçqına döndərirlər bizi. Sonra da yerlərimizə erməni adlarını damğa basıb eləyirlər öz dədə malları.

Bunun hayıfını çıxmaq üçün biz jurnalistlər başlayırıq ağlımıza kərə də gəldi döşəməyə, kürə də. Avropalılardan sözlər oğurlayıb, «erməni» sözündən sonra yazırıq: «lobbi», «diaspor»,



«terror», daha nə bilim nələr. Bunlarla da ürəyimiz soyumur, döşəyirik ermənilərin qabırğalarına o ki var: «quldurlar, nankorlar, əclaflar, nədən əmələ gəlmişlər!» və sair və ilaxır. Beləliklə hayıfımızı çıxırıq bu köpəkuşağından. Onlar bizi silahnan məhv eləyir, biz də qələmnən, özü də öz respublikamızın qəzet-jurnalında. Əcnəbi qəzet-jurnalları ilə nə işimiz var ki? «Qarabağ daxili problemimizdir», daxilimizdə də yazıb-pozmalıyıq. Qanırıq ki, söz qılıncdan kəsərlidir – bunu atalarımız deyib. Qoy ermənilər avtomat atsın, raket atsın, top atsın, lap istəsələr atom bombası atsınlar, uşağımızdan tutmuş böyüyümüzə qə-dər, ağsaqqalımızdan tutmuş ağbirçəyimizə qədər qırsınlar bizi tarakan kimi, söznən elədiklərimizin heç onda birinin əvəzini çıxa bilməzlər. 5-10 il əvvəl yaza bilmirdik, indisə «müstəqil respublikayıq», kimin nə həddi var deyə ki, elə yazma, belə yaz, qələmnən gözlərini çıxararıq.

Amma, deyəsən onlar da yazırlar, özü də biz hələ yuxuda xorna çəkən vaxtlardan üzü bəri yazırlar. Həm öz daxili kağız-

kuğuzlarında yazırlar, həm də özləribininki elədikləri dünyanın kağız-kuğuzunda. Hələ kino-zad da quraşdırıb bizim necə vəhşi millət olduğumuzu aləmə «dokumentalnı-sübutalnı» göstərirlər. Cəhənnəmə ki! Bizə çata bilməzlər.

Biz isə yazdıqca əllərimizdən bir-bir doğma obalarımız gedir. Əvvəllər çox torpaqlarımızı vermişik. İndi isə Qarabağın dağlarını verəcəyik, necə ki, veririk, sonra kecəcəyik Qarabağın aranlarına. Belə-belə yavaş-yavaş çəkiləcəyik Kürdən o yana, sonra isə Allah bilir hara. Dərindən fikirləşəndə başa düşürük ki, bu erməni köpəkuşağının günahları bir qırıq da yoxdur. Nə olar erməni olanda, onlar da canlıdırlar da. Niyə biz müsəlmanlar imkan vermirik ki, bu yazıqlar da kefləri istədikləri kimi gen-bol yaşasınlar? Vallah, mən bu xalqın yerinə olsaydım, elə ilk günlərdən Qarabağı verərdim onlara. Torpaqdır də, özümüzlə qəbrə aparmayacıq ki! Ölmək üçün bir parça torpağımız oldu nəyimizə bəs deyil? Həm də indiyə qədər niyə Göyçəni, Dərələyəzi, Zəngəzuru, onlarla bahəm Tovuzu, Qazağı, Laçını, Kəlbəcəri, Zəngilanı, Qubadlını bütünlüklə və ya hissə-hissə ermənilərə verə bilirik, amma Qarabağı yox? Bu torpağın





nəyi və harası o torpaqlardan artıqdır ki? Atalar məsələsidir: «Dost-dosta tən gərək, tən olmasa gen gərək». Yəni ki, Azərbay-canı tən yarı bölüb verməliyik ermənilərə, vəssalam! Sonra yenə istəsələr, lap bütövlükdə verərik. Belə üzüyolalıq əvəzinə xalqımız cığallıq eləyir, özlərinə «seçdikləri» başçıların istədiklərinin əley-hinə gedirlər. Gəlin «prob» üçün ermənilərin dediklərini eləyək – Kürdən bu yananı verək onlara, nə vaxt bir müddət, yəni 5-10 il bizə dəyib-dolaşsalar, nə deyirsiniz, deyin mənə. Vallah, billah, doğru sözümdür, ya gərək torpağı verək, ya da ona-buna baxma-yıb, gördüyü hər deşiyə soxulmağa öyrənmiş burunlarını ovub, kəsək qulaqlarını bu köpəkuşağının – babaları Andronikin qula-ğı kimi. Yoxsa günümüz-güzəranımız belə zəhər-zəqquma dönə-cək.

Rəhbərimiz deyir ki, «Qarabağdır də, elə də olar, belə də…» (Televiziyadakı çıxışdan). Yox, qardaş, bu nankorluq ki, bizdədir, Qarabağ, deyəsən, elə onların dediyi kimi olacaq, çünki həm bizimki, həm onlarınkı ola bilməz axı! Bizim indi iki yolumuz var – ya sel kimi gələn puldan-paradan, zəhmli vəzifə kreslosundan əl çəkib, xalqı siz rəhbərlərin düçar etdiyi bəladan xilas etməliyik, ya da əksinə, xalqı da, torpağı da qurban verməliyik, vəssalam!

Bir tərəfdən də fikirləşirəm, qırğın yəni ayrı cür də olur? Daşaltıda, Xoramurdda, Fəruxda, Xanabadda, Malıbəylidə, Xocalıda, Şuşada, Şəfəqdə, daha haralarda igidlərimizi gülləborana verdiyimiz bəs deyilmi? Axı xalqın da səbr kasası daşa bilər (və bu dəhşətə çox qalmayıb). Bir tərəfdən rəhbərlərimiz, bir tərəfdən ermənilər, bir tərəfdən içimizdə anası erməni olanlar, ya da atası da, anası da müsəlman olan, özləri isə erməni köpəkoğlundan betər satqın «şpionlar» xalqın canını boğazına yığıblar. Burda tək səbir gətirəndə erməni həmin saat da orada bilir və başlayır bizi topnan, raketnən atəşə tutub qırmağa, çünki eşidib ki, tək səbir müsəlmana düşmür.

Sözümün qüvvəti, Tərtərin milis işçilərinin əldə gəzdirdikləri hava telefonlarında (ratsiya) ermənilər hər gecə olmazın nalayiq sözləri ilə sulayırlar bizi. (Bu aparatlar vasitəsilə onlar bizi çox yaxşı eşidirlər, biz də onları, söyüşürük özümüz üçün). Bir də eşidirsən ki, ermənilər deyirlər: «Ara, gic musurman, onsuz da





Qarabağı Mutalibov satıb biza, çıxıb gedin buralardan, yoxsa, mazhab haqqı, başınızı azacağıq». Bir də eşidirik ki, yeyib-içmək süfrəsindən qışqırırlar aparata: «Ara, elə bu bakallarımızı da içirıx Şuşa qalasında qırdığımız musurmanların sağlığına». Sonra başlayırlar danışmağa ki, dünən gecə hansı «türk» (yəni azərbaycanlı) nə iş görüb, hansı «türk» hara gedib, hardan gəlib, kim evində necə soyunub, necə yatıb. Deyirlər ki, sizin bir belə «raqatkanız» var, bir belə də «sapandınız», bir belə də ortada gəzəniniz. Yoxlayıb görürük ki, düppədüz deyirlər. Biz də özümüz haqqında bilmədiklərimizi əməlli-başlı öyrənirik onlardan. Sağ olsunlar, hərdən bir onu da deyirlər ki, ara, ela Allah sizi bizdən yox, ozunuzdan qorusun. Fikirləşəndə görür-sən ki, düz deyirlər bu köpəkuşağı. Çünki, Qarabağda igidləri-miz qırılır, Bakının televizorunda konserti konsertə calayırlar. Burda qan su yerinə axır, başbilənlərimizin cibişdanlarına isə rüşvət. Qarabağda ermənilərdən qorunmaq üçün silah çatışmır, bakılılarda 200 min

(«Azadlıq qəzeti») silah var. Burda düşmən gülləsindən qurban gedən igidin anası şəhərdə sevimli pişiyi ölən madmuazeldən az ağlayır.

Bizi özümüzdən qoru, İlahi!

**«Salam» qəzeti,**
**1992-ci il.**



***KİMİN XƏTRİNƏ DƏYSƏ, SU İÇSİN***

## BALQABAQ MÜSƏLMANLARIQ

***Harda müsəlman görürəm,***
***qorxuram.***
***M. Ə. Sabir***

Biz müsəlman milləti çox balqabaq millətik. Ona görə balqa-baq millətik ki, 200 ildir dədələrinin layiq olduğu palanlarla bizi alıqlayıb minənlərə deyə bilməmişik: «Ağalar, belimiz ağrıyır, siz Allah, zəhmət olmasa, bir anlığa düşün aşağı, qəddimizi düzəl-dək, nəfəsimizi dərək, yerinizi rahatlayaq, sonra yenə minərsi-niz». Bunun əvəzində ağrıyan boynumuzu zorla geri döndərib yaltaqlanmışıq: «Ağalar, siz Allah, yeriniz narahat deyil ki? Bir-dən belimizdə haranızsa ağrıyar, bizdən gizlədərsiniz ha!». Onlar da belə balqabaqlığımızdan istifadə eləyib hüquqlarımızı, qüru-rumuzu, sərvətimizi əlimizdən alıblar, hesabımıza yeyib-içib şi-şiblər – qozun qabığını deşib, içinə girən qurd kimi. Sonra da bi-zə lağ eləyiblər. «Baran» medalı»nı yapışdırıblar sinəmizə. Qaba-ğımıza da yediklərindən artıq qalan sümükləri atıblar ki, gəmi-rək, acından ölməyib onlar üçün işləməkdə davam edək.

Ona görə balqabaq millətik ki, vəhşiliklərinə, xainliklərinə, tülkü olduqlarına görə öz yerlərindən qovulan köçəri erməni dığalarına və haxçiklərinə gözəl dağlarımızı, meşələrimizi, bulaq-larımızı bağışlayıb demişik: «Yeyin, için, kef çəkin! Sizin əvəzi-nizə də biz işləyəcəyik. Doyandan sonra siz də minərsiniz belimiz-dəkinin tərkinə». Onlar da yeyib, içib, kef çəkiblər, sonra da mi-niblər belimizdəkinin tərkinə. Bu, onlara bəs eləməyib. Balqabaq olduğumuza görə 70 ildə neçə min hektarlarla torpağımızı qa-marlayıb «gözlərinə soxublar». «Böyük Ermənistan imperiyası» yaratmaq eşqinə düşüblər, indi də Qarabağı yemək istəyirlər, çünki qeyrətimizə bələddirlər. Biz isə hələ də yalvarırıq ki, ay «hingerlər», siz Allah, belə eləməyin, yazığıq axı! Azərbaycanı rahathulqum kimi tikə-tikə udub qurtarandan sonra biz bəd-bəxtlər gərək ya ulu babalarımızın «yaşadıqları» Xəzərin dibinə çəkilək, ya da ulu nənələrimizin «peyklə uçub gəldikləri» Marsa



gedib çıxaq. Üç il yarımdan çoxdur ki, beləcə yalvarırıq. Hələ də baş barmağımızı şəhadət barmağımızla orta barmağımızın arasından çıxarıb biryolluq deməmişik ki, alın bu da Qarabağ! Buna görə də onlar qudurub 200 mindən çox müsəlmanı öz də-də-baba yurdlarından namərdliklə qovaladılar, didərgin saldı-lar. Biz isə buradakı «kirvələrimizi» az qala bağrımıza basıb, gözlərimizin üstündə saxlayırıq ki, ayıbdır, eşidən-bilən nə de-yər? Qoy harınlayıb öz torpğımızda igidlərimizi qanlarına qəl-tan eləsinlər. Biz də başlayaq özümüz-özümüzlə didişməyə və qulaqlarımızla eşidək ki, deyirlər: «Onlara erməni-zad lazım deyil, özləri özlərinə bəsdilər». Fikir verməyək ki, biz hirslənən-də uşağımıza «eşşək oğlu» deyirik, onlar isə hirsləndə «turki dığa», («türk oğlu») deyirlər. Və yaxud, biz hirslənib bizi başa

düşməyən tay-tuşlarımıza deyirik: «Ayə, qanmaz deyilsən ki?», onlar isə deyirlər: «Ara, ho turk çes!», yəni «Ayə, türk deyilsən, ha!» («Türk» deyəndə bizi nəzərdə tuturlar – T. Y.).

Ona görə balqabaq millətik ki, 1920-ni də, 1937-ni də, 1986-nı da, 1990-nı da alqışlarla qarşılamışıq. Kimi taxta çıxarıblar, əl çalmışıq, kimi taxtdan yıxıblar, yenə də əl çalmışıq. Əl çalmaqdan əlimizin içi qabar bağlayıb. Qazancımız isə boyunduruq və qandal olub.

1991-ə qədər yuxarıdan «Yaşasın kommu…» sədası gələn kimi ayağa durub «Urra!» qışqırmışıq, gözləməmişik ki, bu kəlmənin arxasınca «na» gəlir, yoxsa «nist» gəlir, ya «nizm» gəlir. 6 ildir isə «Demo…»ya «Urra!» deyirik. Yenədə gözləmirik ki, bundan sonra «kratiya» gələcək, yoxsa «nstrasiya» gələcək», ya «qogiya», ya da «ntaj» gələcək. Bunlar isə bir-bir gəlirlər. Əvvəlcə «demokratiya» gəldi, onun arxasınca «demonstrasiya» gəldi, o öz yerini «demaqogiyaya» verdi, indi isə başlamışıq «demontaja» – yəni, köhnəlmiş sex kimi 70 illik cəmiyyəti söküb yenidən qurmağa – müstəqil dövlət bərpa etməyə ( hələ ki, kağız üzərində).

İndi guya anlamağa başlamışıq ki, 91-ə qədər biz müsəlmanların evini partokratiya, onun yüksək vəzifəli funksionerləri, siyasi fırıldaqçılar, ideologiya düşmənləri yıxdı, indi də inhisarçılar, kooperatorlar, birjalar, broker kontorları, biznesmen-





lər, daha nə bilək nələr, atılıblar ortaya. Biz də bunlara fikir ver-mədən leksikonumuza yeni sözlər daxil edirik – plüralizm, alter-nativ, vətəndaş sülhü və s. Daha demirik ki, ay müsəlmanlar, gə-lin gedək öz işimizin arxasınca. Gedək həmişəki kimi, gecə-gün-düz zavodlarda, fabriklərdə, fermalarda, tarlalarda çalışıb qan-tər tökək ki, həm arvad-uşağımıza bir qarın çörək qazanaq, həm də belimizdən indi də düşməyənləri yemləyək, yoxsa payları az düşər və bizə biz batırarlar. Çünki alnımıza belə yazılıb. Bizim üçün nə fərqi var ki, başbilənimiz İvandı, yoxsa Vartazar? Nə fərqi var ki, hansı «…izm» cəmiyyəti qururlar, hansını dağıdır-lar? Ta ki, bir tikə çörək versinlər ki, acından ölməyək və o xülya qoynunda məsti-xumar olaq ki, erməni «qardaş-bacılarımızla» barışıb yenə də bir yerdə yeyib-içib tost deyəcəyik. Daha əbəs yerə yalvarıb-yaxarıb rusun, özbəyin başçılarını haraylamayaq ki, amanın bir günüdür, gəlin özümüz öz dişimizə saldığımız bu düyünü açmağa bizə kömək edin. Nə işimizə qalıb erməniyə de-yək ki, «axber» sən bizim 200 minimizi qovaladın, mən də sənin 2000 minini qovacağam. Həm də nə işimizə qalıb ki, başqa millə-tə deyəndə: «Çarpayının altında yatma, üstündə yat», o deyir: «Çarpayı mənimdir, özüm bilərəm, üstündə yatmıram, altında yatıram». Çünki «mənimdir» sözünü bizim yadımızdan çıxarıb-lar, çünki hər hansı müsəlman «mənimdir» deyibsə, başına elə qa-paz ilişdirmişik ki, gözlərinə qara su enib, dünyanı tor görməyə başlayıb. Amma öz aramızdır, sonradan baxıb görmüşük ki, bu bədbəxt oğlu düz deyirmiş, deməyəsən torpaq da bizimki imiş, pambıq da, neft də, barama da… Bunlar bizimki ola-ola indi də bizimki deyillər.

Bax elə bu səbəblərə görə də deyirəm: «Vallah, billah, biz müsəlman milləti balqabaq millətik!».

**«Salam» qəzeti,**
**1992-ci il.**





# ÖLÜM BELƏ OLMAZ AXI!

***Tərtər İnformasiya Mərkəzi yaradılmışdır.***

***Tərtərdə redaksiya binasının erməni raketi dağıtdıqdan son-ra «Salam» qəzeti redaksiyasının və yerli gənclər təşkilatının təşəbbüsü ilə informasiya mərkəzi yaradılmışdır. Bu mərkəzin məqsədi müharibə ilə əlaqədar rayonda baş verən mühüm hadisələrlə bağlı Tərtər və respublika əhalisinə operativ məlumatları çatdırmaqdan ibarətdir. Aşağıda informasiya mərkəzinin topladı-ğı faktlar əsasında hazırlanmış materialları sizə təqdim edirik.***

Sizi bilmirəm, indi mənim gözümdə ölüm o qədər adiləşib ki, bəlkə də ən yaxın adamlarımın dünyadan köçməsinə də

sarsılmaram. Yox, ürəyim daşlaşmayıb – elə on il əvvəlki xəstə və ağrılı ürəyimdir. Amma son vaxtlarda o qədər faciəli ölüm-itim görmüşəm ki, öz əcəli ilə ölənə şükürlər eləyirəm.

Ömrümdə bir toyuq başı kəsməmişəm. Qandan qorxmuşam, ürpənmişəm. Qan həmişə məni tutub. İndi fikirləşirəm ki, Xocalıda qundaqdakı körpələri belə süngüdən keçirməkdən həzz alan bir erməni əlimə düşsə, yenədəmi qandan qorxaram? Məni qınasanız da deyəcəyəm ki, hələ bilmirəm. Onu bilirəm ki, mənim kimi qandan qorxanlar çoxdur bu dünyada. Gözlərim görsə də inana bilmirəm ki, insan insana belə zülümlər edər, istər faşist olsun, istərsə də erməni! «Ömür» deyilən müvəqqəti, daşla, qayayla nisbətdə bir kirpik çalımı müddətində olan yaşayış əzabı gah qəzaların, gah xəstəliklərin, gah da yaş həddinin əlində oyuncağa çevrilib. Bir yandan da müharibələr, qırğınlar insanlığı məhvə sürükləyir. «Ölüm-ölümdür, daha bunun ağı-qarası olmaz ki?» – deyiblər. Yox, səhv deyiblər. Ölümlər də fərqlidir – yaşayış tərzləri kimi.

Mən özlüyümdə ölümü iki yerə bölmüşəm – adi ölüm və bədbəxt ölüm. Adi ölüm odur ki, ömrünü-gününü sənə ayrılmış həyat payında insan kimi, dünyanın gözəlliklərindən zövq alaraq yaşayasan. Vaxtın çatanda da köçünü bir anın içində, heç kimə əzab-əziyyət vermədən, üzüsulu çəkib gedəsən. Bədbəxt ölüm odur ki, yaşantında heç kimə xeyrin dəymədiyi halda, həmişə bəd əməllərlə məşğul olasan, ölənə yaxın uzun aylar xəstə düşüb





zarıncı qalasan, hamını zinhara gətirib, sonra öləsən. Demə, üçüncü cür də ölüm varmış – dəhşətli ölüm. Əlbəttə, müharibənin öz qayda-qanunları var – ölüm də olacaq, itim də. Ağznda müha-ribə deyirsən, yəni insan ölümü, insan qırğını, ah, nalə, fəryad!.. Amma mən dediyim üçüncü cür ölüm indiyə kimi gördüyüm, bil-diyim ölümlərin heç birinə oxşamır. Demə, dünyada daha dəhşət-li, daha amansız, daha qorxunc ölümlər olarmış… Ana öz oğlu-nun cəsədini tanımaq üçün meyidə diqqətlə baxır, amma adi bir nişanəsini belə tapa bilmir. Fəryadı göyə bülənd olur: «Yox, bu mənim oğlumun meyidi deyil!». Başlayır onun bədənində olan ni-şanələrini axtarmağa – dəli kimi cəsədi ələk-vələk eləyir. Yenə ax-tardıqlarından heç birini tapa bilmir. İndi isə heysiz halda deyir: «Yox, bu mənim balamın meyidi deyil!». Əslində bu, elə onun öz oğlunun cəsədidir. Amma erməni vəhşiləri (vəhşilər məgər belə edirlər?), erməni cəlladları (cəlladlar yalnız baş kəsirlər, axı!) azərbaycanlı balalarını elə işgəncələrlə qətlə yetirmişlər ki, ana öz övladını, bacı öz qardaşını, qadın öz ərini tanıya bilmir!

Top və raket atəşlərinin xarabazara çevirdiyi Tərtərə baxdıqca insan dəhşətə gəlir. Yox, bu nə Bakı, nə Quba, nə Şamaxı qırğınıdır, nə Şuşa fəlakəti, nə də Xocalı soyqırımı! Bu, ermənilərin Azərbaycan xalqının başına tarix boyu gətirdikləri qanlı fəlakətlərin növbəti hissəsidir.

Tərtər dəhşəti! Ürəyi, duyğusu, hissi, zehni olan «insan» adlandırdığımız xilqətin xislətində nə qədər quduzluq varmış! Min illər boyu bəşər övladının ağlına belə gətirə bilmədiyi bu işgəncələri törədən binamus, bişərəfləri bu halal torpaq öz üstündə necə gəzdirir axı? Ölüm ölümdürsə, bəs bu dəhşət nədir, ey ulu Tanrı?! Necə dözürsən belə amansızlığa, belə alçaqlığa, belə zillətə?! İnsanı sən yaratmısansa, bəs bu rəzilliyi, bu qan hərisliyini, bu qəddarlığı niyə qurd kimi yeritmisən onun içinə?! Öldürürsənsə, öldür də, hər şey sənin əlindədir, daha bu zülüm nədir?! Əgər erməni millətindən xəbərin varsa, onda sənin ədalətinə mən şübhə etməyimmi?!

Tərtər rayonunun taleyinə Yuxarı Qarabağın Ağdərə (keçmiş Mardakert) rayonu ilə 42 km uzunluğunda bir sərhəd zolağı düşüb. Rayon mərkəzilə ermənilərin yaşadığı Marağa kəndi ara-





sında 800 m-dən də az bir məsafə var. Bir neçə il əvvələ qədər isə Azərbaycanın hər yerində olduğu kimi Tərtərdə də minlərlə erməni gözlərimizin üstündə – ən yaxşı torpaqlarımızda, ən yax-şı evlərimizdə yaşayırdılar, ən yaxşı vəzifələrdə işləyərdilər. Bir sözlə öz yurdumuzda bizdən qat-qat imkanlı idilər. Demə, içimizdə dişi canavar kimi bəsləyirmişik onları! Yuxarı Qarabağı özümüzdən olanların biqeyrətliyi üzündən əlimizdən alandan sonra indi də başlayıblar Azərbaycanın digər ərazilərini xarabazara döndərməyə, murdar caynaqlarını bu torpaqlara uzatma-ğa. Tərtərdə, Ağdamda, Goranboyda, Xanlarda, Qazaxda, To-

vuzda tökülən qanlar az imiş kimi indi də Bərdədə qan axıdılmışdır. Görəsən, niyə ayılmırıq, daha nəyi gözləyirik?

Şəhərlərimiz, kəndlərimiz, ev-eşiyimiz dağılıb yerlə-yeksan olandan, minlərlə soydaşımız qurban gedəndən sonra həmin torpaqların yenidən geri alınacağını fəxrlə deyə-deyə Şuşanı da verdik, Laçını da. Sonra Qubadlı, Zəngilan getsin, sonra da bunları bir-bir geri alaq. Bəs onda bu xalqın fiziki, iqtisadi, mənəvi əzablarını kimin ayağına yazaq? Axı kim bir körpənin axıdılan qanının əvəzini qaytarıb onun anasına verə biləcək?! Bəs deyilmi, bu bədbəxt xalqı əllərdə oyuncaqdan da ucuz bir əşyaya çevirdiniz, ay bizim başımızın qeyrətsiz, şərəfsiz ağaları?! Lap deyək ki, Xocalını günü bu gün geri aldıq. Bəs Xocalı namussuzluğunu, Xocalı soyqırımını necə unudacağıq? Niyə əlimizdə olanları verib, sonra da başlayırıq şivən qoparmağa?

Tərtərdə indiyədək ermənilər tərəfindən 101 nəfər vətəndaşın evi, onlarla ictimai bina tamamilə dağıdılmış, əhaliyə və dövlətə milyon manatlarla ziyan vurulmuşdur. Tərtər əhalisindən ölənlərin və yaralananların sayı 100 nəfərdən çoxdur. Təkcə 10 aprel 1992-ci il tarixdə Tərtərlə ermənilər arasında gedən şiddətli döyüşlərdə 14 nəfər müdafiəçimiz həlak olmuş, 60-dan çox döyüşçümüz və dinc sakinimiz yaralanmışdır. Ölən və itkin düşən tərtərlilərin sayı hələ müəyyən edilməyib. 17 aprel 1992-ci il tarixdə 18 nəfər azərbaycanlının meyidi (4 nəfər) sağ-salamat erməniyə dəyişdirildikdən sonra min bir əzabla, işgəncə ilə qətlə yetirilmiş bizimkilərin şəxsiyyətlərini çox çətinliklə tanımaq mümkün olmuşdur. Görəsən, bu qanlı-qadalı günlərimiz hələ çoxmu davam edəcək?!





**P. S. Material qəzet üçün çapa hazırlanarkən ermənilər Tərtə-ri yenə şiddətli atəşə tutmuşdular**.

**«Salam» qəzeti,**
**1992-ci il.**





***TORPAĞIMIZIN QARABAĞ DƏRDİ***

# VAY O GÜNƏ Kİ !..

Erməni quduzlarının azğınlıq həddinin bu günkü səviyyəyə çatacağını mən bir neçə ay əvvəlcədən duyurdum və buna görə də «Salam» qəzetində, həm də lazımi yerlərdə elə həmin vaxt-lardan da haray-həşir qoparırdım. Amma kimdir ki, adi bir jur-nalistin dediklərinə əhəmiyyət verən? Qarabağın fəryadı ya-nında mənim

sözüm nəydi ki? Dildə pərgarlıq edənlər isə, işə gələndə əllərini yelləyirdilər, yəni cəhənnəmə ki!

Biganəliyimiz, unutqanlığımız, astagəlliyimiz laqeydlik azarına saldı bizi və bunlar bütöv bir xalqa qeyrətsizlik damğası vurdu.

Siyasi, iqtisadi və psixoloji gərginliyin kulminasiya nöqtəsinə çatdığı indiki məqamda xalq elə bir ümidsizliyə, elə bir çaşqınlığa, elə bir iflic vəziyyətinə çatmışdır ki, hadisələrin obyektiv gerçəkliyinə düzgün qiymət verə bilmir, vəziyyətin cövhərində nələrin yatdığını dərk etmir, hər anı, hər saatı dərin həyəcan, ciddi narahatlıq və səksəkə içində yaşayır. Bir yandan da bilərəkdən yayılan şaiyələr xalqı vahimə uçurumuna atmışdır. Amma buna əsas da vardır. Demək istəyirəm ki, Azərbaycan xalqı heç vaxt inanmazdı ki, bu yurdun taleyini həll edən Şuşa və sonra ən dəhşətlisi, Laçın çox asanlıqla yağı düşmənlərə peşkəş veriləcək və bununda da Ermənistanın hələ rəsmiləşdirilməmiş sərhədlərini Ağdama, Tərtərə, Füzuliyə qədər genişləndirməyə imkan yaranacaqdır.

Mən şəxsən Şuşa – Laçın – Gorus yolunu bəlkə də yüz dəfələrlə gedib-gəlmişəm və o yolların az qala hər döngəsini əzbər bilirəm. Gorusdan Şuşaya qədər olan dolaylı yolların uzunluğu cəmi-cümlətanı doxsan altı kilometrdir. Ermənilərin hərbi qüvvələrinin bundan əvvəl cəmləşdiyi Dığ (özləri «Değ» deyirlər) kəndindən isə Şuşaya 70 kilometr ola, ya olmaya. Yurdumuzun «Qala qapısı» Laçının əldən verilməsi Qarabağın bir başa Ermənistana birləşdirilməsi demək idi və bizim vəzifəli bişərəflər bunu elədilər. Gəlin açığını etiraf edək ( etiraf da bir kişi-



likdir axı) bundan sonra əldən verilmiş Azərbaycan torpaqlarının geri alınması çox çətin olacaq və Allah saxlasın ki, yeni-yeni tor-paqlar verməyək!

Son dördillik keçmişimizi saf-çürük edəndə açıq-aydın görünür ki, bizim içimizdə dünyanın heç bir yerində görünməyən əclaf, murdar, satqın, namussuz adamlar çoxuymuş və bu millətin ən böyük faciəsi, ən dəhşətli bədbəxtliyi orasında olmuşdur ki, həmin adamlar ona başçılıq etmişlər! Azərbaycanlı olduqları yal-nız pasportlarına görə təsdiq edilən belə adamlar böyük bir

xal-qın taleyini indi «tükdən asılı» bir vəziyyətə salmışlar. Özümü-zünkülərin etdikləri bu düşmənçiliyi heç bir erməni köpəkoğlu bizə etməyib və bunun üçün sübut gəzməyə ehtiyac yoxdur. Ayrı faktları demirəm gözümüzün qabağındaca baş verən və Azər-baycan xalqının ürəyinə qəmə kimi saplanmış Xocalı, Şuşa və Laçın satqınlığını təsəvvürə gətirsək, kifayətdir. Görün şəxsi mənafe, pulgirlik, vəzifəpərəstlik hansı həddə çatıb ki, Vətəni, xalqı qurban verməkdən, satmaqdan belə çəkinməmişlər və dəh-şət orasındadır ki, həmişə dinəndə deyiblər: «Eybi yoxdur, o da bizim Azərbaycanın oğludur». Mən bu buqələmunluğu hec cür qəbul edə bilmirəm. Yox, o, bizim Azərbaycanın oğlu deyil, o, arvadını, qızını vara, dövlətə, vəzifəyə satan bir ünsürdür ki, han-sı millətdən əmələ gəldiyini də, hansı xalqa mənsub olduğunu da heç kim bilmir! (Jurnalistika etikasına sığmayan bu kəlmələr görə üzr istəyirəm).

Yuxarıda dediyim kimi, indi Ermənistanın sərhəddi Ağdamla Tərtərin yanına çatıb və bu rayonlar üçün də real Xocalı, Şuşa, Laçın təhlükəsi yaranıb. Bu, jurnalist fantaziyası deyil, nə də xalqı vahiməyə salmaq üçündür. Bu, əvvəlcədən qoparılan haraydır ki, bəlkə, heç olmasa, bu dəfə başbilənlərdən kimsə eşidib bir iş görsün.

Rəhmətlik Lenin (bizim başbilənlərimizə baxanda Leninə rəhmət düşür) demiş, indi nə etməli? Bir addım irəli, iki addım geri atmaqla xalqımıza bəla olmuş bu «solluq uşaq xəstəliyi»ni nə cür sağaldaq? Bəlkə Ağdamı, Tərtəri, Füzulini, Kəlbəcəri, Bərdəni (hələ Qubadlını, Zəngilanı demirəm) ümumiyyətlə, özlərinin arzuladıqları kimi, Kürdən bu yananı onlara verib, Bakıya tərəf



üz tutub qaçaq? Axı, onsuz da, Bakı qaçqınlarla doludur. Həm də ki, indinin özündə də Ağdam-Bakı istiqamətində köç maşınlarının əlindən tərpənmək olmur. Məqsədli əlaltıların xain istəklərinə sürücülərin də daş yaran tamahları qoşulanda gözləri gördüklərindən qorxmuş əhalini köçürməyə nə var ki?

Dədə-baba yurdundan qaçqın düşmək mahal işdir! Handa da qala sən öz ev-eşiyini, həyət-bacanı qoyub-qaçasan, bir er-məni köpəkoğlu da gəlib həmin ocaqda sənin qara gününə tost deyə! Bax, məşhər günü həmin günə deyirlər!

Yaxşı, bəs onda bu başıbəlalı sahibsiz xalq başına haranın külünü töksün?! İndiyə kimi nə yiyəsi olub, nə də arxa duranı. Özü də ki, öz başına iş görməyi öyrənməyib.

Bu gün «demokratik» deyilən qüvvələr hakimiyyətə gəlməkdədir. Xalq inanmaq istəyir ki, onları düşdüyü bu müdhiş uçurumdan bəlkə bunlar xilas etdilər?!

Vay o günə ki, bu inam da heçə çıxsın!..

**«Salam» qəzeti,**
**1992-ci il.**



# YALNIZ ŞÜAR ÜÇÜN
## (VƏ YAXUD İNDİKİ ŞÜARLARIN XALQ YOZUMLARI)

1. Hər şey müharibə üçün, hər şey qələbə üçün! ( Yalançının cəddabasına lənət!).
2. Birlik, birlik, yenə də birlik! ( Rəhbərlərimizin mafiyaları qoysa).
3. Hamı seçkilərə! ( Kasıblara aid deyil).
4. Vətənin qeyrətli oğul və qızlarına səs verək! ( Bəs varlılar necə olsun?).
5. Yaşasın demokratiya! ( Amerikada).
6. Rüşvətxorlara və vəzifəpərəstlərə aramızda yer yoxdur! (Bağışlayın, son sözdə «ç» hərfi əvəzinə «y» hərfi gedib).
7. Qarabağ bizimdir! ( Hansı Qarabağ?).
8. Tam müstəqil Azərbaycan Respublikası yaradaq! ( Bəs onda kimə tabe olacağıq?).
9. Respublika rəhbərliyi xalqla yekdildir. (Seçkilərdə onların dediklərinə səs verəndə).
10. Hər şey xalqın rifahı naminə. ( Hansı xalqın?).
11. Qarabağdan qaçanlara ar olsun! ( Düzəliş: qaçan kasıblara).
12. Qarabağa el yardımı göstərək! ( Qarabağda kimlərə?).
13. Vətən – qeyrətimiz, namusumuz və vicdanımızdır! ( Varlılara aid deyil).
14. Vətən yolunda ölümə hazırıq! ( Vətən yox, vəzifə və pul).

**Salam qəzeti,**
**1992-ci il.**



***KİMİN XƏTRİNƏ DƏYSƏ, SU İÇSİN!***

# QIZIŞMAQ

Ermənilər həmişə deyiblər: «Müsəlmanın sonrakı ağlı kaş bizdə olaydı!».

Doğrudan da, biz müsəlmanların sonrakı ağlı heç bir millətdə yoxdur və ola da bilməz. Çünki o, yalnız bizə məxsusdur. Bu «sonrakı ağıl» deyilən şey ki, var ha, daldan atılan daşa oxşayır və o, çox özünü öldürsə topuğa ya dəyə, ya dəyməyə, ondan yuxarı qalxa bilməz. Elə topuğa dəysəydi də bir iş idi, bəzən heç ora da gedib çatmır.

Yadıma bir məsəl düşdü.

Deyirlər ki, keçmiş zamanlarda bir tacir mal alverinə gedib qayıdanda həmişə eyni yerdə quldurlar onun karvanını soyubtalayır, mühafizəçilərini də şil-küt eləyərək əliboş yola salarmışlar. Tacir çox götür-qoy edəndən sonra özünə həddindən artıq pəzəvəng olan bir mühafizəçi tapır ki, o istəsəymiş bir dəfəyə 20 nəfəri yan-yana uzadarmış. Yeyəndə 10-15 adamın xörəyini yeyərmiş. Tacir bu adama kalan zəhmət haqqı boyun olur.

… Karvan həmin yerə çatanda quldurlar yenə onların üstünə hücum çəkirlər. Həmişəki kimi başlayırlar karvanı soyub-talamağa. Tacir gözaltı baxıb görür ki, işə yeni götürdüyü mühafizəçi heç yerindən belə tərpənmir.

Quldurbaşı kənardan bu talan-qarətə tamaşa edirmiş. Birdən gözləri həmin nəhəng adama sataşır. Baxır ki, bu qızışsa onlardan salamat adam qalmayacaq. Üst-başı da yaraqla-yasaqla dolu. Buna görə də ondan gözlərini çəkmir.

Quldurlar öz işlərini görüb qurtarırlar. Tacirin yeni mühafizəçisi isə yerindən tərpənmir ki, tərpənmir, baş verənlərə maddım-maddım tamaşa eləyir. Quldurlardan bir neçə nəfəri qorxa-qorxa ona yaxınlaşır. Biri cürət edib pəzəvəngin qolundan tutur. Görürlər ki, bu, yerindən qımıldanan adama oxşamır. O biri qolundan da tuturlar. Hər iki qolunu arxasına çatıb bağlayırlar. Sonra ayaqlarını sarıyırlar. Quldurbaşı görür ki, bu lap qoyundur. Boy-buxununa yaraşmayan bu qeyrətsizliyi quldur-



başını əsəbiləşdirir, yaxınlaşıb əmr edir ki, bu heyvan oğlu heyva-nı yerə uzadın. Uzadırlar. Sonra deyr ki, onun yaraq-yasağını açıb götürün və şalvarını soyundurun. Belə də edirlər. Quldurbaşı əmr edir ki, onun gündəyməzinə 40 şallaq ilişdirin.

Quldurlar pəzəvəngin yumşaq yerinə 40-cı şallağı vuranda o, ağrı hiss edir. Mühafizəçi quldurlara deyir:

– Yox, bu daha ağ oldu. Sizə hörmət elədiyim bəsdir. Mən fikirləşirdim ki, bu iş sakitçiliknən qurtarsın. İndi baxaq görək siz məni niyə döyürsünüz?

Mühafizəçi azca güc verib əl–qolundakı kəndirləri qırıq-qırıq eləyir: şalvarını yuxarı çəkərək bağlayır və düşür quldurların üstünə. Onu orda, bunu burda, «nə yemisiniz, turşulu aş», hamısını şil-küt eləyir. Tacirin bütün mallarını geri alıb dəvələrə yükləyir, xidmətçilərinin əl-qolunu açıb azad edir. Quldurbaşıyla bir neçə nəfər zorla qaçıb canlarını qurtarırlar.

Karvan yola düşür. Bir az getdikdən sonra nəhəng mühafizəçi tacirdən soruşur:

– Hə, necə mühafizəçiyəm? Xoşuna gəldimmi?

Tacir bir qədər fikirləşib cavab verir:

– Mühafizəçi olmağına… yaxşı mühafizəçisən. Amma mən hər dəfə hardan 40 quldur tapım ki, sənin yumşaq yerinə 40 şallaq ilişdirsinlər və sən bundan sonra qızışıb öz vəzifəni yerinə yetirəsən?

Sonra tacir ondan soruşur:

– Üstündə bir o qədər yaraq ola-ola niyə əvvəlcədən onlardan istifadə eləmədin?

Mühafizəçi cavab verir:

– Belə şeyləri sən bilməzsən. Onlar yaman günün yaraqlarıdır.

Bu məsələyə oxşamasın, ermənilər bizim başımıza yüz oyun açandan sonra, o zırpı mühafizəçi kimi, sonradan-sonraya yaman qızışmışıq. Goranboy quldurlardan təmizlənib. Tərtər və Ağdam rayonlarında uğurlu döyüş əməliyyatları aparılır. Kəndlərimiz və torpaqlarımız yağı düşmənlərdən yavaş-yavaş azad edilir.

Yanlarında olarkən əsgərlər dedilər ki, Laçın yolu bağlansa və ermənilərin həmin yolla daşıdıqları hərbi sursatın qarşısı alı-



nıb, sərhədlərimiz möhkəmləndirilsə, yaxın günlərdə Qarabağı nankor ermənilərin tapdağından xilas edəcəyik.

Mən 4 il əvvəl də qəti qələbəmizə inanırdım. Çünki Allah da haqqın tərəfindədir. Ona görə də son dövrlərdəki uğurlu döyüşlərimizdə qeyri-adi heç nə görmürəm. Əksinə, onu görürəm ki, ölənlərimizin, itənlərimizin və yaralananlarımızın sayı dəhşətli

dərəcədə çoxalır. Onu görürəm ki, yenə də… nəsə hələ mən deyən deyil.

**«Salam» qəzeti,**
**1992-ci il**





# QARAPETLƏ HAYRAPETİN MƏHƏMMƏDƏ MƏXFİ MƏKTUBU

Ara Mamed, barev, yani salam.

Saninla kasdiyimiz o duz-çorak haqqı, biz hala da sizləri unuda bilmirıx. Çunki, bizlara çox yaxşılıqlar elamisiniz, yani ki, vaxtı ila Zanqazuru, Göyçani, Daralayazi mufti-musallam vermisiniz, bunlardan sonra da 30 min kvadrat kilometr gulli-çiçakli torpağınızı bir sozumuzla satmısınız biza. Çox sağ olun!

İndi, ara Mamed, nolsun ki, aramızda bir balaca narazılıx olup, yani ki, biz sizlari bekara qorxutmuşux, 40-50 dana raketdi, topdu, nadi onlardan atmışıx, 5-10 napariniz ölüb, 5-10 eviniz da dağılıp. Dunya qopmayıb ha! Axı, biz sizlari lap qabaqcadan, hala heç Sovet hokuməti qurulmamışdı, onda xabardarlıq elamışdıx ki, balam, qaçın Kurdan o biri tarapa, buralara bizim gözumuz duşup. Siz da elə bildiniz ki, biz zarapat elayirıx. Ara, mazhab haqqı, gunah sizin ozunuzdadır. O vadalar biza qulax assaydınız heç bela da olmazdı. Ba niya avvallar biz deyan kimi siz da torpaxlarınızı satırdınız biza, indi isa yox?

Ha, Mamed can, siz musurmannar yaman qorxax millatiymişsiniz, biz bela bilmırdıx. Ba bizim yerimizə olsaydınız nağayrardınız, ha? Ara, sizin 7 milyonunuz bizim 5-10 saqqalı dığamıza cavap vera bilmir, ba 5-10 min olsax neylarsiniz? 4 ildi ki, sizin başınızda qoz, pındıq qırırıx, amma siz başınızı qırağa çakmirsiniz ki, ara, ağrıyır axı! Malades siza, Vallax! Biza heç mahal qoymursunuz! Bakı, Şamaxı qırğınlarınızı, yuzlarla bela-bela tokduyumuz gunahsız qanları siz ki, tezca da unuda bilirsiniz, Vallax, malades siza!

Mamed can, bir az qabax dedıx ki, mazhab haqqı, yaman qorxaxsınız. Balka inanmırsan? Onda qulaq as. Tartarda (ara, onun adı Tartar deyil ha, «Derder»dir, yani bizim dilimizda «Keşiş»dir) indi 5-10 napariniz çiyinlarina avtomat keçirip, guya qoruyacax bu yerlari. Ara, ağlınız-huşunuz olsun, çeçenlari ustunuza guldurmayin, biz cahannam. Deyasan siza heç na dars olmur axı. Hala da siza çatmır ki, biz ermanilar na deyirıx, onu da





elayirıx. Siza hala lap qabaxlar dedix ki, balam, ya Qarabağı xoşhaxoşnan verin, ya da zornan alacağıx, inanmadınız, guldunuz biza. Aldıx, ya almadıx, Mamed? İndi da deyirıx ki, Kur-dan bu tarap hamısı bizim olmalıdı, yena inanmırsınız? Ara, na qanmaz adamsınız! Dedix, demali eliyacağıx! Vaxtında başınıza

çara qılın. Hala da sizin kallaniza girmir ki, bir neçə saatın içində Mardakertin 7 musurman kandini alt-ust eliyan, Xocalını o gunlara salan ermani na istasa eliya bilar, lap Bakını da başınıza uçurdar. Vallax, siza hala yazığımız galir, yoxsa… Ham da çorak kasmişıx, axı.

Mamed can, biza bir şey çox gülmali galir, deyax ki, Derdera, Ağdama 1-2 şey atmışıx, ona gora da oralarda bizdən qorxurlar, ba Yevlaxa, Bardaya nolup? Ara, qeyratiniz ki, budur, ba niya ağzınıza çullu dovşan yerlaşmir? Mazhab haqqı, sizin qazetlari oxuyanda, televizorunuza baxanda, radionuza qulax asanda ela gurultuynan danışırsınız ki, burda qorxurux. Sonra gorurux ki, bunların hamısı gopdur, bizim nağaramız kimi içiniz boşdur, ela damba-durum salmağı bilirsiniz, amma ozunuz tulkudan da qorxaxsınız. Duzdur, Şuşadakı musurmannar bir az başımızı ağrıdır, amma o da muvaqqati bir şeydir. Onsuz da Şuşada şuşalı qoymamışıx ha! Bu hunar ki, sizdadi nainki Şuşanı, Kalbacari da, Laçini da, Qubadlını da alacağıx, Allah qoysa! Onların hamısını birlaşdiracağıx anamız Hayastana. Onsuz da 4 ildir bizi hadalayırsınız, amma bir qalat elaya bilmirsiniz.

Mamed, bax, xabardarlıx elayirıx, hamınızı qıracağıx! Neca ki, 3 min naparinizi serça kimi qırmışıx. Neca ki, Sumqayıtın ildonumunda Xocalının başına kul aladıx, gozal galinlariniza, uşax qızlarınıza na istadıx onu da eladix, parçaladığımızı parçaladıx, doğradığımızı doğradıx, obşim, Xocalıda yamanca kepa baxdıq! Ba na bilmişdiniz?

Ara, Mamed, eşitmişıx ki, hardan-bir bizim vertalyotlara, samalyotlara gulla atırsınız. Ara, lap gunda birini vursanız da (heç vura bilirsiniz ki!) xeyri yoxdur, bu da olmasın 100-dan biri. Ara, ağlınız olsun. Onsuz da biz bilirıx ki, siz çox axmax, çox afal, ruslar demali, çox «baran» millatsiniz, havayi yera ozunuzu biabır elamayin.





Mamed can, maktubumuzun axırında sana maslahat bilirıx ki, ya Bakıdan qayıtma, ya da gal keç biz tarapa, şpionlux ela. Bilirsanmi har şpionluğa gora indi neçə musurman bizdan na qadar dollar alır? Amalli-başli varlananlar olub ey!

Ha, di halalik, sağ ol! Opurux gozlarindan.

Sani unutmayan: Qarapetla Hayrapet.

***Məktubu Məhəmməddən satın aldı:***
***Tofiq Yusif.***
**«Salam» qəzeti,**
**1992-ci il.**





# Ə, SƏN ÖL, YALANDIR

***(Felyeton)***

O günü tanışlarımdan biri mənə yaxınlaşıb dedi ki, muştuluğumu ver, erməniləri Qarabağdan çıxarıb, qovalamışıq öz dədələrinin xarabalarına. Soruşdum ki, İrana, yoxsa Türkiyəyə? Dedi ki, yox Ermənistanın özünə. Bundan sonra öz ev-eşiyimizdə öz arvad-uşağımızla rahat yatıb-duracaq, dağlarımıza, meşələrimizə qorxusuz-ürküsüz gedib-gələcəyik. Sonra dedi ki, Şuşada sanatoriyalar işə başlayıb, Rusiyanın, Ukraynanın gözəlləri yenə gəlib dolublar korpuslara. Gəl bu il məzuniyyətimizi götürüb ora gedək. Bilirsən də Şuşanın havası can dərmanıdır, suyu məlhəmdir, daşı-torpağı qızıldır. Karlovı-Varı qələt eləyir Şuşanın yanında. «İsa bulağı», «Soyuq bulaq», «Cıdır düzü», «Topxana meşəsi», tarixi yerlər, abidələr… Bəh, bəh, bəh! Qabağımızda quzu kababıynan «Ceyran südü», qulağımızın dibində bu il təzə aldığım yaponski maqnitofonda Cabbar Qaryağdıoğlunun «Çahargah»ı, qoltuğumuzda da nazlı-qəmzəli dünya gözəlləri! Mənnən getsən, yamanca kef çəkərik, bax bu mən ölüm! Bəlkə düz demirəm, hı?

Sonra dedi ki, ə, sən öl, Xocalı qırğını yalan imiş. Odey «Xalq qəzeti» həmin hadisədən bir gün sonra yazıb ki, Xocalıda fevralın 26-da cəmi 2 nəfər müsəlman öldürülüb, qalanları sağ-salamat ermənilərlə bir yerdə yeyib-içib padşahların sağlığına tost deyirlər. Əgər düz olsaydı, respublikamızın televiziyası əvvəlcə xalqı aldatmazdı, deməzdi ki, Xocalıda heç nə olmayıb, bundan 4 gün keçəndən sonra kiminsə çəkdiyi lentləri yalvar-yapışla alıb, camaata göstərməzdi. Həmin şəkillərə baxanda adama elə gəlir ki, guya ermənilər bəşər tarixində görünməyən genosidə yol veriblər, kişilər o yana, guya südəmər körpələri, əlsiz-ayaqsız qocaları, qadınları vəhşicəsinə, min bir zülmlə, əzabla öldürüblər. Şaiyə gəzir ki, guya Xocalı qırğını qəddarlığın dünyada görünməyən görküdür. Biri deyir Xocalıda 7 min, digəri deyir yox, 10 min, özü orada yaşayan isə deyir ki, 11 min 500 nəfər əhali varmış, onun 200 – 300 nəfəri sağ qalıb, ya qal-




mayıb. İnanma, ağ yalandır. Xocalı kimi balaca yerdə cəmi heç 500 nəfər adam yaşamırmış, onun da 498 nəfəri hazırda sənin, mənim kimi sağ və salamatdır. Deyilənlər düz olsaydı, indi bütün dünya, içində də ruslar olmaqla ayağa qalxıb qan-qan

deyərdilər, fəryad qoparardılar, necə ki, Sumqayıtda ermənilərin özlərinin təşkil etdikləri otuz neçə nəfərin ölümündən sonra dünya lərzəyə düşmüşdü.

Bir də şaiyə gəzir ki, guya Xocalı qırğınında rusların 366-cı polku ermənilərdən betər müsəlmanların qanını içib. Pah atonnan, bu boyda da yalan olar?! Bir soruşan yoxdur ki, a balam, rusun nə dərdinə qalıb ki, erməniynən müsəlmanın arasına girsin, hə? Biz niyə başa düşmürük ki, ruslar Qarabağda ancaq və ancaq sakitliyi qoruyurlar, qoymurlar ki, bir qarışqanın da burnu qanasın? Onlar olmasaydılar bu 4 ildə müsəlmanlar çoxdan Kürü o yana adlamışdılar. Belədir də, biz onsuz da milçəyi böyüdüb fil eləməyə öyrənmişik. Birincisi, ermənilərin dünyaya meydan oxuyan öz topuna, topxanasına nə gəlib ki, müsəlmanı qırmaq üçün gedə rusa ağız aça? İkincisi, onların sərhəddən o tərəfə pulu, qızılı xəzəl kimi olan daydayıları ölməyiblər ha qoyalar ki, törəmələri silah sarıdan korluq çəksinlər? Üçüncüsü, deyək ki, Popov yalan danışır, Ter-Petrosyan tərəfkeşlik eləyir, bə o boyda Şapoşnikova nə deyirsən, hə? O yekəlikdə kişi də durub yalan danışmayacaq ha! Görmədin, Moskvada boynuna diri ilan saldılar, faktları gözünə soxdular, yenə Şapoşnikov dedi ki, bu münaqişədən (?!) 366-cı polkun xəbəri yoxdur ki, yoxdur! Bundan belə çıxır ki, biz yalan danışırıq, amma yalanımız ayaq tutub yerimir, zor deyil ha!

Bir də deyirlər guya bu donuzdan əmələ gəlmiş erməni köpəkuşağı Qarabağın 30-dan çox kəndini xarabazara döndərib, daşı-daş üstündə qoymayıb, adamlarını da qırıb-çatıb. Ə, vallah, yalandır. Onda gərək bizim papağımızı ləçəknən əvəz edəydilər. Belə şaiyələrə inanma, qardaş! Buna inansan, gərək ona da inanasan ki, Daşaltı döyüşlərində yuxarıda oturanlarımızın qəsdən qırğına verdiyi yüzlərlə igiddən 70-nin meyidi hələ də ermənilərin qorxusundan gətirilib basdırılmayıb. Gərək ona da inanasan ki, Malıbəylidə ölənin-itənin sayı məlum deyil. Quşçularda… Əşi,




hərə bir hava çalmaqla bu camaatın başına oyun açır da! Yəni bu erməni oğraş bir o qədər vəhşiləşib ki, müsəlmanların göz-lərini sağ-sağ çıxarıb buraxır düzlərə? Ya da qışqırda-qışqırda qollarını qıçlarını burub, sümüklərini şaqqıltıyla ovxam-ovxam

elədiklərinin fəryadlarına yazıqları gəlmir? Və yaxud əlini, ayağını mişarlayıb, müsəlmanın fışqıran qanından ləzzət alır? Bunlar cəhənnəmə, hələ şaiyə yayırlar ki, qadınlarımızın, qızlarımızın sağ-sağ döşlərini kəsirlər, kişiləri silah gücünə cərgəyə düzüb, gözlərinin qarşısında analarının, bacılarının, 10, 13, 15 yaşlarında körpə qızlarının başlarına yüz oyun açırlar? Sən bunlara inanırsan? Şəxsən mən inanmıram. Çünki belə dəhşətləri heç şüursuz heyvan da eləməz! Bir də ki, erməni olanda nə olar, onlar məgər insan deyillər, onların da anaları, bacıları, qızları yoxdur? Vallah, yalandır, belə eləməzlər!

Tanışım sonra dedi ki, sən Allah, hələ şaiyəyə bir bax, guya Ağdama 5-10 raket atmaqla həmin gecə o boyda rayonda səngərdəkilərdən başqa 10-15 nəfər başıpapaqlı qalıb, ya qalmayıb, hamısı qiymətdən ağır, vəzndən yüngül və yaxud vəzndən ağır, qiymətdən yüngül nələri varsa götürüb dabanlarına tüpürüblər. Guya bəziləri Bakını ötüb keçəndən sonra da özlərinə gəlməyiblər. Neyləsinlər, qorxu köpəkoğlu şeydir.

Deyirlər ki, guya indi də Bərdənin varlı-karlı adamları əlaltından yavaş-yavaş qala kimi topdağıtmaz evlərini, bir də qurğuşun tək sanballı sandıqlarını yüngülləşdirirlər. Bunların hamısı şaiyədir. Yaxşı, tutaq ki, Ağdama, Tərtərə raket atılıb, top mərmisi düşüb, bəs Bərdəyə nə olub? Axı ora hələ heç bir quş tüfənginin də səsi gedib çatmayıb. Nə olsun ki, ermənilər deyib: «Donuzumuz Kürdən, özümüz Bərdədəki Anahidin bulağından (?!) su içəcəyik». Sözdür də deyiblər. O dəqiqə su içmədilər ha!

Qardaş, nə başını ağrıdım, bir onu bilirəm ki, bu və buna bənzər şaiyələrin hamısı varı, pulu qeyrətindən də, namusundan da üstün tutan bəzi müsəlmanları qorxutmaq üçündür…

Məni çənəsinin altına salıb çox şeydən – bildiyindən də, bilmədiyindən də səhərdən bəri qabırğama döşəyən tanışıma imkan tapıb heç olmasa onu deyə bilmədim ki, əmoğlu, Xocalıda da, Malıbəylidə də erməni qaniçənlərinin vəhşicəsinə, zülümlə



öldürdükləri, girov götürüb min bir işgəncə, əzab verdikləri ailələ-rin çoxu mənim yaxın qohumlarımdır, tanışlarımdır. Gedək, o dəhşətləri gözlərilə görən, törədilən vəhşiliyin şahidi olan və hansı təsadüflərinsə hesabına canlarını erməni cəlladlarının əllərindən bir təhər qurtarıb qaçan bir neçə nəfər tanıyıram, onları səninlə görüşdürüm, faciələri olduğu kimi danışsınlar, sən də qulaq as, əgər qanın donmasa, ürəyin sızımsızım göynəməsə, başının tük-ləri biz-biz olmasa, denən ki, ayıb olsun sənə!

**«Salam» qəzeti,**
**1992-ci il.**



# İKİ CÜR ALVER

İndi tez-tez deyirlər ki, dilimizdə daha «alver» sözü işlənməyəcək – lüğətimizdən, leksikonumuzdan bu söz çıxarılacaq, əvəzində isə «kommersant» sözündən istifadə olunacaq və daha alver olmayacaq. (Allah eləsin!). Amma mən buna inanmıram. Ona görə inanmıram ki, bu mümkün deyil. Ona görə mümkün deyil ki, onda gərək indi vəzifə tutanların hamısı istefa verə və onların yerinə bizim içimizdən yox, uzaq planetlərdən gələnlərdən qoyula. Niyə? Ona görə ki, «alver» ləfzi indi iki mənada işlənir – birincisi odur ki, satıcı müştəridən pul alır, əvəzinə mal verir (dövlət malıdır, ya özününküdür, nə dəxli var ki?), yəni alıb-verir və bu iki sözdəki «al» və «ver»dən «alver» sözü yaranır. Bu işlə xırda vəzifə sahibləri məşğul olurlar və onlara istəyirsən «alverçi» denən, istəyirsən «kommersant», ya da istəyirsən heç ad demə, fərqi yoxdur, taki «çax-çuxlarını» eləsinlər.

«Alver» ləfzinin ikinci mənası bir az dolaşıqdır. Gərəkdir onu xırdalayım. Amma bunun üçün heç həvəsim yoxdur. Çünki ha xırdalayım, ha yekəldim, kimin nə vecinə olacaq ki? Səhərdən-axşama kimi və axşamdan səhərə qədər elə hey xırdalayırlar, elə hey irildirlər, kimə «gözün üstə qaşın var» deyirlər ki, mən də xırdalayanda deyələr? Amma hər halda bu ikinci «alver» ləfzini bir az xırdalamaq gərəkdir.

Camaata qatığın ağlığı kimi məlumdur ki, indiki «bəy»lərimizin hamısı (lap dəqiq desək 99 tam yüzdə 99 faizi) alverlə məşğuldurlar. Bu alverdə də pul alırlar (özü də kalan alırlar), əvəzində isə mal vermirlər, ayrı şeylər verirlər – məsələn, torpaq, rayon, kənd, zavod, idarə, vəzifə, möhür, el-oba…

Təbii bir sual meydana çıxır: «Niyə ayrı vacib işləri görmürlər, yalnız alver eləyirlər?». Bu sualın da çox təbii cavabı var: «Birinci zümrə ona görə alver eləyir ki, indiki vaxtda dolanışıq çox çətindir, aylıq əmək haqqıynan yola getmək, arvad-uşaq dolandırmaq mümkün deyil. İkinci zümrə də ona görə alver eləyir ki, indiki vaxtda dolanışıq çox çətindir, aylıq əmək haqqıynan yeyib-içmək, kef çəkmək, villa tikmək, bahalı maşınlarda gəzmək katibə dolandırmaq mümkün deyil».



Bəs sabah nə olacaq? Sabaha görə birinci alverçilərin vəziyyə-ti çox tul görünür. Yəni ki, istehsal yoxdur, bu günkü mal da sa-bah qurtaracaq. Özləri, məsələn, qənd, düyü, yağ, ət, corab düzəl-dib satmayacaqlar ki!

İkinci alverçilərin vəziyyəti isə yaxşı olacaq. Yəni ki, məsələn, bu gün satmağa boş vəzifə yoxdursa, yaxud da ki, möhür köhnəlibsə, bir əmr verəcəklər, yeni ştat da, yeni möhür də düzələcək, sonra da satacaqlar.

Nə isə… Deyirəm, nə olaydı, kaş mənim də babat pulum olaydı, qoyaydım ortaya, keçəydim bir yekə vəzifəyə, başlayaydım şıdırğı alverə! Bax onda kef çəkərdim indiki «bəy»lər kimi!

**31. 05. 1993-cü il**



# MM-dən XƏBƏRLƏR

Bakıda Milli Məclis adında dəlixana var.

* * *

Gəncə hadisələrini tərsinə deyil, gördükləri və eşitdikləri kimi «xalq elçiləri»nə çatdırdıqlarına görə respublikanın hörmətli ağsaqqalları İmam müəllimlə Fərəməz müəllimə yaxşıca «sağ ol!» deyiblər.

* * *

Gəncədə baş verən qırğını araşdırmaq üçün yaradılmış komissiya Xocalı, Şuşa, Laçın, Kəlbəcər və s. təcrübələrindən genbol istifadə etmək fikrindədir.

* * *

Milli Məclis iqtidarın diktofonudur.

* * *

Milli Məclis qərara alıb ki, Rəhim bəy Qazıyev çox açıq və çılpaq danışdığına görə onun sözlərinin üstünü örtmək və yaxud ən azı onlara alt paltarı geyindirmək lazımdır.

* * *

İsa bəy istəsə MM-də qəbul olunmuş bir qərarı həmin gün on dəfə səsə qoya bilər.

* * *

MM-də bərkdən qışqırdığına görə Tahir bəyin səsi batıb və bunun üçün də Ali Məhkəmənin sədri vəzifəsindən istefa vermək istəyir.

* * *

Aldığı maaşa göz dikən çox olduğuna görə Pənah bəy baş nazir vəzifəsindən istefa verdi.

* * *

AMİP-in sədri Etibar bəy spiker İsa bəyin Gəncə hadisəsində «əli qana batdığını» deyərkən zarafat eləyib, yoxsa onu məhkəməyə verərdi.

* * *





Hamını milli birləşməyə çağıran MM-in özündə ciddi çatlar və yarıqlar var.

* * *

4 iyundan bəri Milli Məclisin iclasları «açıq» keçirilir – küçədən keçənlər içəri girib, deputatları istədikləri şəkildə «divara dirəyirlər».

**31. 05. 1993-cü il**





# ÇAYXANA SÖHBƏTİ

O günü çayxanada tanımadığım bir adam həbsdən təzəcə buraxılmış dostunun xaricə mühacirət etməsindən danışırdı. Deyirdi ki, ondan soruşdum: «Vətənin bu dar günündə hara qaçırsan?». O isə cavab vermək əvəzinə mənə, vallah, bilmirəm, «Qabusnamə»dəniydi, yoxsa «Kəlilə və Dimnə»dəniydi, bir əhvalat danışdı. Guya bir şir meşədən baş götürüb qaçırmış. Heyvanlar onun qarşısını kəsib soruşurlar:

– Ey qüdrətli şir, hara belə qaçırsan?

Şir onlara cavab verir:

– Bu gün bir ceyran ovlamışdım. Oturub rahatca yeyirdim. Yanımda bir tülkü peyda oldu. Məni xeyli tərifləyəndən sonra dedi ki, sənin dünyada ən qüvvətli heyvan olduğundan danışırlar, amma mən buna inanmıram. Əgər deyilənlər doğrudursa, onda gəl sənin pəncələrini bu ceyranın bağırsaqları ilə bağlayım, dartıb qıra bilsən, daha sözüm yoxdur.

Mən tülküylə razılaşdım. O, bağırsaqları eşib günün altında qurutdu. Sonra mənim pəncələrimi möhkəm-möhkəm sarıdı. Xeyli keçəndən sonra dedi ki, indi dart qır. Mən güc verəndə eşilmiş quru bağırsaqlar pəncələrimi sümüklərimə qədər kəsib doğradı, lakin qırılmadı. Ha çalışdım, xeyri olmadı. Bağırtım meşəyə düşdü. Tülkü mənim yalvarışlarıma heç bir məhəl qoymadan ceyranın ləziz tikələrindən doyunca yedikdən sonra çıxıb getdi. Əl-qolum bağlı qızmar günün altında əzab çəkirdim. Xeyli keçəndən sonra yanımdan ötən bir siçana yalvar-yapışla bağırsaqları kəsdirə bildim…

Heyvanlar bir ağızdan dedilər:

– Bir işdir başınıza gəlib, daha niyə vətənindən qaçırsan?

Şir onların cavabında deyir:

– O meşənin ki, bağlayanı tülkü oldu, açanı siçan, orada yaşamağa dəyməz.

Çayxanada söhbət eləyən axırda dedi:

– Sonradan öyrəndim ki, vətəndən qaçan dostumun həbsxanada «başı xarab» olubmuş. Yoxsa mənim sualıma belə əl-ləm-qəlləm cavab verməzdi.

**Söhbəti eşitdi: Tofiq Yusif.**
**28. 05. 1993-cü il**



# CAMAATIN GÜNÜNƏ AĞLAYIRAM…

O günü dilim dinc durmadı, gicbəsərin birindən soruşdum:

– Rayonunuza yeni seçilən bəyzadə deyirlər yaxşı oğlandır. Sən necə bilirsən?

O xeyli müddət üzümə baxdı və nəhayət dilləndi:

– Bütün bəylər necə, o da eləcə. Ağzı var, ağzında dişi var. O da çörək yeyə bilir, çay içə bilir…

– Onun rayona başçı göndərilməsindən camaat razıdırmı?

– Bütün rayonların camaatı necə, biz də eləcə…

Sonra o öz-özünə bərkdən gülüb dedi:

– Əsgəri xidmətdə olan birinə xəbər çatdırırlar ki, dədəni kolxozunuza sədr qoyublar. Oğlan oturub ağlayır.

Soruşurlar:

– Niyə ağlayırsan?

Oğlan deyir ki, camaatımızın halına ağlayıram – görün nə bədbəxt günlərə qalıblar ki, adam tapmayıb, dədəmi özlərinə sədr seçməyə məcbur olublar!

Gördüm ki, bu başıxarab hətərən-pətərən danışır, tez ondan uzaqlaşdım.

**29.03.1993-cü il**

# AXC ÜZVLÜYÜNDƏN NİYƏ İSTEFA VERDİM?

***Çoxsaylı tanışlarımın bu sualına biryolluq cavab vermək üçün yazdığım ərizənin mətnini eynilə dərc etdirməyi lazım bildim.***

**AXC-NİN TƏRTƏR RAYON ŞÖBƏSİNƏ**

**AXC-nin üzvü Hüseynov Tofiq Yusif oğlu (Tofiq Yusif) tərəfindən**

**ƏRİZƏ.**

AXC-nin indiki hakimiyyətdə olan üzvlərinin apardıqları kadr siyasətinin respublikaya vurduğu zərbələr, Azərbaycanın əzəli və qədim torpaqlarının erməni quldurlarına maneəsiz təslim edilməsi, əhalinin yaşayış səviyyəsinin günü-gündən daha da ağırlaşması, əslində respublika vətəndaşlarının dilənçi kökünə salınması, rüşvətxorluğun və korrupsiyanın baş alıb getməsi, demokratiyanın boğulması və digər bu kimi neqativ hallar mənim AXC-yə olan inamımı bütünlüklə itirmişdir.

Bundan əlavə, AXC Tərtər rayon şöbəsinin «Cumhuriyyət» qəzetinin 21 may 1993-cü il tarixli 21-ci sayında əməkdaşı olduğum «Salam» qəzetinə iftiralar yağdırması məni AXC sıralarından uzaqlaşmağa məcbur edir.

Bütün bunlara görə mən AXC üzvlüyündən istefa verirəm və bununla bağlı hər hansı müzakirəyə ehtiyac duymuram.

**İmza:** **T. Y. Hüseynov**
**29 may 1993-cü il.**

**Qeyd: AXC sıralarından töhmətlə azad olundum.**



# ƏLİN CİBİNDƏ OLSUN...

Hər hansı bir cəmiyyətdə rüşvət həyatın plazmasını təşkil edirsə, həmin cəmiyyətdə insan hüququndan, dövlətçilikdən, qanunların aliliyindən və millətin mənafeyindən danışmaq nə qədər də mənasız görünür! Belə bir cəmiyyət tərəfindən qurulmuş dövlətin adı nə olursa olsun, xeyri yoxdur, o məhvə məhkumdur. Çünki içini qurd yemiş qoz kənardan nə qədər sağlam görünsə də çürükdür.

SSRİ-ni əslində rüşvət dağıtdı. Belə getsə, yeni qurmaq istədiyimiz bu dövləti də rüşvət yıxacaq. SSRİ-nin varlığı zamanı rüşvəti qorxa-qorxa verirdilər, qorxa-qorxa da alırdılar. İndi isə adamı məcbur edib rüşvət alırlar, həm də qorxusuz-ürküsüz, özü də yüksək məbləğlərdə. SSRİ-nin dövründə rüşvəti lap yuxarı pillələrdən tutmuş aşağıya qədər hamı alırdı, amma gizli yollarla alırdılar. İndi də eyni qaydada alırlar, lakin həm gizli, həm də aşkar alırlar. Və buna haqq da qazandırırlar. (Allah, sən özün bundan betərindən saxla!).

Son dövrlərdə xalqın başına gətirilən saysız-hesabsız müsibətlər kimi rüşvəti də «keçid dövrü» adlı mənfur bir pərdə ilə pərdələyirlər və xalqı da bu dəhşətlə barışmağa məcbur edirlər. Ona görə məcbur edirlər ki, onların özləri də «məcbur etmək səlahiyyəti»ni rüşvət verməklə qazanıblar. Hazırda, demək olar ki, qulluğa minənlərin və minmək istəyənlərin hamısının genlərində yaşayan rüşvətxorluq mərəzinin yoluxucu virusları qanunların çoxaldığı, amma, əfsuslar olsun ki, işləmədiyi, kağız üzərində qaldığı bir vaxtda elə artıb-törəyiblər ki, onların daş gəmirən iştahlarını doyurmaq çox müşkül bir işdir. Çünki rüşvətin virusları da çayır kimi bir şeydir – münbit şərait axtarır, məqam yetişən kimi qıcqırıb bütün aləmi bürüyür. Milləti isə qəsdən elə günə salıblar ki, belə güzərana da şükürlər edir, çünki bundan da ağır dərdi var – onu yalnız və yalnız bir ağrı düşündürür – hər nə olursa olsun, dözərik, kaş bu zəhrimar müharibə qurtarsın!». Müharibə isə qurtarmır ki, qurtarmır. Ona görə ki, pulun şirinliyi bütün milli dəyərləri üstələyib.

Tək mənim yox, hamımızın gündəlik həyatda qarşılaşdığımız

və vərdiş etdiyimiz bir sıra acı həqiqətlərin xırda təfərrüatına varmaq istəyirəm. Məsələn, yol hərəkəti qaydalarını pozursan, əlini öz cibinə, sonra da yol polisinin cibinə salıb çıxarırsan, bir andaca dönüb olursan ən intizamlı sürücü. Qanunsuz alver edirsən. Nə olar, elə, amma «bazar nəçənniyi»ni – polis müfəttişini gör, sonra elə. Və yaxud vergi müfəttişliyinin əməkdaşına «cib xərcliyi» ver, haqqında yazılmış 54 min rublluq cərimə aktının parçaları zibil yeşiyinə tullansın.

Fövqəladə rejimin tələblərini yerinə yetirən postlardan, yalan olmasın, lap atom bombası da keçirə bilərsən, amma müftə yox, əlin cibində olsun. Hərbi komendantlığa sərxoş düşənlər ordan ayıq çıxırlar, çünki ciblərini «lüt-üryan»a döndərirlər.

Ginayət törədirsən, cinayət axtarışı şöbəsində əlin müstəntiqin cibinə dolu girib, boş çıxır, olursan pak bir adam. Lap deyək ki, səni prokurorluq məhkəməyə verdi, qorxub-eləmə, məhkəmə sədrinin hökmü ilə müttəhimdən şahidə dönəcəksən, sonra da olacaqsan ən düz adam, əlin cibində olsun.

Azərbaycanda heç nəyin qıtlığı yoxdur, kim belə deyirsə, yalan deyir! Əksinə, hər şey boldan da boldur. Ət, yağ, qənd… yox ey, lap istəyirsən quş südü, dəvə buynuzu arzula, hazır olacaq, buyur, al, amma əlini əvvəlcədən dolu cibinə sal. Bəlkə sənə silah lazımdır? Avtomat, pulemyot, lap top, tank, vertalyot? Buyur, amma…

İstəyirsən get texnikuma gir, institut aç, lap deputat ol! Burada nə çətin iş var ki? Taki əlin cibində olsun.

Vəzifə lazımdırsa, buyur, utanıb-eləmə, kreslonu, möhürü cibinə görə özün seç götür.

…Belə-belə bu xalq o qədər əlini ciblərinə salıb çıxarıb ki, artıq cibləri yırtıq-yırtıq olub və orada daha heç nə yoxdur.

**29. 05. 1993-cü il.**



# BELƏ DƏ DAĞITHADAĞIT OLAR?!

***Yaxud prokurorun iddialarını məhkəmənin sədri niyə rədd edir?***

Məni qınayan olmasa deyərdim: «Vallah, Azərbaycandır ki, belə vurhavurdan, dağıthadağıtdan sonra ayaq üstə dayana bilir!..»

Müharibə bir yandan, yeni dövlətçiliyin problemləri o biri yandan, rüşvət, dövlət əmlakının dağıdılması, satqınlıq, infilyasiya da dörd yandan təzəcə müstəqilliyə qədəm qoymaq istəyən bu məmləkətin bütün varlığını sarsıdır, özülünü laxladır.

Bu yaxınlarda mətbuatda «Dağıthadağıt» sərlövhəli yazım çıxmışdı. Bundar sonra məni gah ora çəkdilər, gah bura. Gah soruşdular ki, maşını keçi qiymətinə necə sata bilərlər, gah da soruşdular ki, bu xalqın malını kim dağıdıb, necə dağıdıb, harda dağıdıb? Bu suallardan canımı biryolluq qurtarmaq üçün qərara gəldim ki, məsələni bir az da xırdalayım. Məsələn, bildirim ki, 1988-1993-cü illərdə təkcə Tərtər rayonunun idarə, müəssisə, təşkilat, kolxoz və sovxozları ayrı-ayrı şəxslərə, kooperativlərə, kiçik müəssisələrə 51 ədəd minik və yük avtomobili satıb. Bu məqsədli alqı-satqını təşkil edərkən o vaxtkı Azərbaycan SSR Nazirlər Sovetinin 03.06.1988-ci il tarixli 199 saylı qərarına əsaslanıblar. Lakin işə xələl gətirə biləcək bəzi məqamları nəzərə almayıblar. Əslində Tərtər rayonunda bu qərar xidməti minik avtomobillərini satmaq üçün əsas vermirdi. Buna baxmayaraq, bir sıra vəzifəli şəxslər qanuna məhəl qoymayıb hüquqi şəxslərə məxsus olan avtomobilləri nəinki keçi, hətta su qiymətindən də aşağı satılmasına və alınmasına nail olublar. 1991-ci ildə və 1992-ci ilin əvvəllərində öz kolxozlarına məxsus «UAZ – 469» markalı maşınları «Azərbaycan» kolxozunun sədri 4125 rubla, onun yaxın qohumu 3647 rubla, «Bakı fəhləsi» kolxozunda 1001 rubla, «Pravda» kolxozunda 3200 rubla, «Paris Kommunası» kolxozunda 5200 rubla alıblar. Narçılıq sovxozunda «Niva – 2121» markalı maşına 3598 rubl, «Qələbə» kolxozunda 4500 rubl veriblər. N. Nərimanov adına kolxozda «Qaz – 69» markalı maşını vur-tut 500 rubla satın alan olub. Hələ bu harasıdır? Minik maşınlarını hətta 410 - 430 rubla alan vəzifə sahibləri var.

«KamAZ» maşınını 3181 rubla satan və alan adamlar görən bu qiymətə köhnə bir eşşək arabası ala bilərdilərmi?

Lap tutaq ki, qanun dövlət maşınlarının alqı-satqısına icazə verir, bəs bu adamların öz vicdanlarına nə gəlib ki, həmin maşınları yarım kiloqram ətdən də ucuz satıb-alırlar?! Bir də ki, əgər təkcə Tərtər rayonunda bircə sahədə belə hoqqalardan çıxıblarsa, görün özəlləşdirmə adı altında respublikada bu cür dağıthadağıtların dövlətə vurduğu ziyanın miqdarı hansı kəlləçarxa çıxır?! Neçə-neçə dövlət müəssisəsinin, tikililərin, avadanlıqların, texnikanın, daha nə bilim nələrin qanunsuz özəlləşdirilməsini də bunların üstünə gəlsək… Dəhşət orasındadır ki, bütün bu «özəlləşdirmələr» respublikada ictimai mülkiyyətin özəlləşdirilməsi haqqında qanun qəbul olunmamışdan əvvəl həyata keçirilmişdir. Açıqdan-açığa dövlətin və cəmiyyətin mənafeyinə zidd məqsədlərlə alan və satan arasında bağlanmış müqavilələr, verilmiş əmrlər, çıxarılmış qərarlar sanki bir zəncirin saxta həlqələridir və bu həlqələrin qırılması üçün neçə illərdir ki, yuxarıdan aşağıya qədər heç kim konkret bir tədbir görməyib.

Tərtər rayon prokurorluğu bu məsələni çoxdan araşdırma--ğa başlayıb, lakin nəticəsi hələ də məlum deyil. Elə bu məqsədlə də prokurorluğa getdim. Orda mənə məlum oldu ki, belə alqı-satqı əqdləri Azərbaycan Respublikasının Konstitusiyası ilə tənzimlənən iqtisadi münasibətlərə qəsd kimi qiymətləndirilməli və bu əqdlər üzrə alınanların hamısı dövlət mədaxilinə keçirilməlidir.

Rayon prokurorluğu qanunsuz özəlləşdirilmiş bu cür avtomobillərin satılması haqqında bağlanan əqdlərin etibarsız hesab edilməsi, avtomobillərin, yaxud onların dəyərlərinin əvəzsiz olaraq dövlət mülkiyyətinə verilməsi haqqında qətnamə çıxarılması üçün rayon xalq məhkəməsi qarşısında dəfələrlə iddia qaldırsa da, xalq məhkəməsi bu iddiaları əsassız iddialar kimi rədd etmişdir, guya kolxozların Nümunəvi Nizamnaməsi belə alqı-satqıya icazə verir. Halbuki «Azərbaycan Respublikasının ərazisində hüquqi qüvvəsini saxlayan keçmiş SSRİ qanunları və onların tətbiqi» haqqında Azərbaycan Respublikası Prezidentinin 28 oktyabr 1992-ci il tarixli Fərmanında Nümunəvi Nizamnamə keçmiş SSRİ-nin normativ aktı kimi qüvvəsini saxlamış qanunlar sırasında yoxdur. Həm də həmin Nizamnamənin əsasında ayrı-ayrılıqda hər bir kolxoz özünün nizamnaməsini hazırlayıb vaxtaşırı təsdiq etməlidir. Lakin uzun müddətdir ki, kolxozların heç biri bu işi görməyib. Ona görə də qaldırılmış iddialar daha ciddi münasibət tələb edirdi. Prokurorluq məhkəmənin qətnamələrindən kassasiya qaydasında protestlər vermiş, lakin… Məqsədli mövqe nəticədə prokurorluqda bu istiqamətdə aparılan işlərin dayandırılmasına səbəb olub. Beləliklə, bu dağıthadağıtın qarşısını almaq istəyən qırmızı işığı yaşıl işıqla əvəz ediblər. Çünki…

**«Ədalət» qəzeti,**
**1993-cü il.**

# ERMƏNİLƏRİN QƏLƏBƏSİ, YOXSA DAXİLİ TƏXRİBAT?

Azərbaycanın 7 milyonluq yazıq xalqı 5 ildir ki, şok vəziyyətinə salınıb, hamı – kolxozçusundan, fəhləsindən tutmuş ta akademik aliminə, yazıçısına qədər çaş-baş qalıb, keyiyib. Nə illah eləyirsən, nə qədər fikirləşirsən bir nəticəyə gələsən, gələ bilmirsən ki, bilmirsən! Vəziyyəti hamı üçün deyilsə də, heç olmasa özün üçün ha aydınlaşdırmağa çalışırsan ki, bir şey alınsın, alınmır. Alınanda da böyründə bir «qəmbərqulu» peyda olur. «Niyə?», «Nəyə görə?» suallarının cavabları karvansara qapısı kimi açıq qalır. Ürəyin qovrula-qovrula bircə onu deməyə gümanın çatır ki, biçarə xalq, zavalı millət, səni zorla itələyib saldıqları bu qırx arşınlıq qan quyusundan kimlər, necə və nə vaxt çıxaracaqlar?! Deyəsən, elə öz qanınla silələnmiş həmin quyuda da boğulub canını bir yolluq tapşıracaqsan! (Nə qədər ki, sənin içində bu boyda biqeyrət, bişərəf, binamus səlahiyyətli vəzifə postları tutmuş satqınların var, günlərin belə qara, gözlərin belə ağlar qalacaq, bədbəxt Azərbaycan!) 5 ildir ki, (5 il yox, elə tarixə gəlişindən) başı qovğalardan səngiməyən bu xalqı çöl düşmənləri yox, elə iç düşmənləri qurd kimi içindən yeyib dağıdır. Babəkindən tutmuş Qaçaq Nəbisinə qədər bu millətin özü kimi bütün qeyrətli oğullarını da inanılıb etibar edilmiş satqınlar ölümə məhkum etdilər. Bu qaragünlü xalq öz taleyini kimlərə etibar etsin, axı?!

Hələ utanıb-qızarmadan mətbuatımızın səhifələrində az qala bütün dünyaya car çəkirik ki, Xocalını, Şuşanı, Laçını…və ən nəhayət, bir millətin qeyrət papağı olan Kəlbəcəri ermənilər maneəsiz işğal ediblər! Bu «işğal ediblər!» nidası «maneəsiz» etirafından sonra yeddimərtəbəli söyüş kimi adamın lap ortasından keçir, atasını yandırır, erməni əlində tərs şapalağa çevrilib, sifətimizdə zol-zol qırmızı iz salır. Gör iş gəlib hansı məqama çatıb ki, hətta ermənilərin özləri də boyunlarına alırlar ki, biz bu torpaqları ala bilməzdik, onların özləri veriblər. Deməli, bizim öz içimizdən olan əclaflar haram var-dövlət xətrinə bu



xalqı və onun ata-baba torpaqlarını ermənilərin ayaqları altında qurbanlıq qoyun kimi kəsiblər və girəvə düşdükcə də qurban kəsəcəklər. Bunu başa düşmək üçün nə siyasətçi olmaq lazımdır, nə də hərbçi. Sadəcə olaraq, başımıza gətirilən müsibətləri gözümüzün önünə gətirsək, bəsdir.

Faciədən hələ neçə ay qabaq xalq nə qədər qışqırsa da, bağırsa da, fəryad qoparıb haray təpsə də, əhalisi ilə birlikdə Xocalını qurban verib, namussuzluq damğasını yapışdırdılar alnımıza. Sonra xalq yenə haray çəkdi. Amma kimiydi bunun fərqinə varan?! «Gözü çıxmış qardaşından» qorxan əhalini daxili təxribatla elə günə saldılar ki, onlar öz xoşuna, hətta yalvar-yapışla Şuşanı da, Laçını da kimsəsiz qoyub qaçdılar. Əsgərlərimiz isə yuxarıdan verilmiş göstərişlərə tabe olaraq (bu göstərişləri verən bəzi namərdlər hələ də xalqdan gizli saxlanılır) geri çəkildilər. Bu məkrli əməliyyatlara ermənilərə «xoş gəldin» deməkdən başqa ad vermək olarmı? (Heyif şəhidlərimizə!). Bəlkə bəzi dairələrin söylədikləri kimi qüvvəmiz azlıq edirdi və yaxud ermənilər bizdən çox güclü idilər? Hamıya məlumdur ki, bu bəhanələr də təxribatın bir qolunu təşkil edir. Gözlərimizin qabağıqdaca hər şey elə bil ki, ermənilərlə danışılıb razılaşdırılmış plan əsasında həyata keçirilirdi. Camaat qaçandan sonra erməni dığaları da zurna-balabanla gəlib otururdu onlara yuxarıdan satılan sahibsiz qalmış dopdolu evlərdə. Yediyini yeyib, dağıtdığını dağıdıb, yandırdığını da yandırıb başlayırlar öz keflərini sürməyə. Ona görə satılan deyirəm ki, Vətənimizi düşmənlərdən dişiylə-dırnağıyla müdafiə etməyə borclu olan Müdafiə Nazirliyinin ən yüksək çinli vəzifə sahiblərindən bu günlərdə milyonlarla haram var-dövlət aşkar edilib və əgər prinsipial mövqe tutulsa, belə haram milyonlar bir çox başbilənlərimizin də təknəsindən çıxa bilər.

Ən dəhşətlisi isə odur ki, öz içimizdən cücərib çıxan bu satqınlar pula görə dirilərimizin qətlə yetirilməsi bir yana, ölülərimizin də qətlinə, şəhid olmalarına – ata-babalarımızın yatdıqları qəbirlərin, ulu gorgahlarımızın təhqir edilib dağıdılmasına, murdar əllərlə yer üzündən silinməsinə birbaşa kömək edirlər.

Laçın ermənilərə satılanda çoxumuza çatmadı ki, Ermənistanın sərhəddi Ağdamın, Tərtərin, Füzulinin…lap böyrünə söykən-

di, «Böyük Ermənistan» iddiası yavaş-yavaş gerçəkləşir.

Ümumiyyətlə, bir xalqın ki, qızlarının, gəlinlərinin namusu Xocalıyla birlikdə ermənilərə peşkəş edildi, o vaxtdan gərək biləydik ki, papağımız da Kəlbəcərlə birlikdə əldən gedəcək! (Bəlkə də bunu bilənlər vardı?!)

Bir də dəhşətlisi odur ki, torpaqlarımızı düşmənə verib, sonra da başlayırıq düşmən axtarmağa və tapırıq da – lap 1-2 il keçsə də. Özümüzdən olan bu «günahkarları» cəzalandırmaqla qurban verilmiş torpaqlarımızın, var-dövlətimizin, əldən getmiş namusumuzun, tökülən qanımızın «heyfini ermənilərdən alırıq!». Daha bizə ayrı nə lazımdır ki?! Bədbəxt millət, zavallı xalq! Görən nə vaxt sənin bu səfil və yazıq halına ağlayan bir göz tapılacaq?!

**«Salam» qəzeti,**
**19. 05. 1993-cü il.**



# KƏLƏFİN DOLAŞIQ UCU

Allah didərginlərə onda qarğadı ki, öz dədə-baba yurdlarından məcburən köçürüldülər və məkirli siyasətə uyub qaçqın düşdülər. Zaman-zaman dişləriylə, dırnaqlarıyla çalışıb tikdikləri ev-eşik, alın təriylə yığdıqları var-dövlət həm erməni vəhşiləri, həm də öz vəhşilərimiz tərəfindən talan olundu, yerlə yeksan edildi, yağmalandı. İndi bir qarğı daxma tikmək olmur.

Allah əlillərə onda qarğadı ki, şikəst oldular və onlar ömürlərinin sonuna kimi şikəstliyin əzabını çəkəcəklər. (Vətən yolunda şikəstlik o vaxt şərəfli olur ki, qədir-qiymət bilinsin).

Şəhidin şəhid, əlilin əlil, qaçqının qaçqın olması haqqında adi arayışın belə rüşvətsiz verilmədiyi bir ölkədə bu Allah qarğışına gəlmişlərin öz canlarından savayı itirməyə heç nələri qalmayıb. Yaşadıqları yox, zülüm-zillət çəkdikləri çadırlar və yoxsul komalar, aclıq, işsizlik, səfalət onların taleyidir, qismətlərinə düşən qara alın yazısıdır.

Zamanın dərdi-səri, ağrı-acısı o qədərdir ki, işıqlı ev-eşiyimizdə, təmiz yorğan-döşəkdə rahat yata bilmirik. Handa da qala belə bir burulğanlı dövrdə yaşamağa yerin də olmaya, yeməyə çörəyin də. Yazıqlar olsun!!!

Vaxtı ilə motal pendirinə, kərə yağına, quzu kababına öyrəşmiş bu bədbəxt insanlar indi bir quru çörəyin ehtiyacını çəkəçəkə ömür sürür, yardımlara ümid bağlayır, əllərə göz dikirlər. Bəs bu yazıq günlərə salınmışların taleyi tapşırılmış məmurlar necə? Respublikanın prezidenti səviyyəsində belə məmurların ünvanına söylənilmiş qəzəbli fikirlərdən bir nəticə çıxarıblarmı?

«Əlillər», «Qaçqınlar», «Yeraz»lar… damğasını daşımağa məcbur olunmuş yurddaşlarımıza göstərilməli qayğılar, verilməli imtiyazlar bir yana, onların ünvanına göndərilən yardımların paylanmasını necə təşkil edirlər? Onsuz da indi yardımların miqdarı azalıb. Olunanlar da elə bil reklam, şüar xətrinə olunur ki, yuxarıların nəzərində şirinləşsinlər.

Dəfələrlə müşahidə etmişəm ki, əsgərlərin, əlillərin, qaçqınların adlarına gələn yardım paylarının başına nə oyun açırlar, siya-

hılara dəxli olmayan nə qədər adamın adı yazılır, nə qədər saxta imzalar edilir, öz dədələrinin malları kimi necə bölüşdürülür, necə satılır. Tərtər, Goranboy, Ağdam, Bərdə… kimi cəbhə və cəbhəyanı rayonlarda, qaçqınların daha çox cəmləşdiyi digər yaşayış məntəqələrində bu nankorluq, bu vicdansızlıq heç bir əndazəyə sığmır. Görəsən, nə vaxt və kimlər bu haramxorların haram yollarla yediklərini burunlarından tökəcəkdir?! Nə qədər ki, tədbir görülmür, adam yüz gümana düşür. Hətta o fikrə gəlir ki, bəlkə bu kələfin bir ucu harasa gedib çıxır? Yoxsa ən yüksək mərtəbədən ciddi şəkildə söylənmiş haqlı iradlar niyə yerinə yetirilməsin ki?

**«Fədai» qəzeti,**
**1996-cı il.**



# MÜHARİBƏ, YOXSA MÜNAQİŞƏ?!

Kimə məlum deyil ki, 8 ildir müharibənin qan-qadasının içərisindəyik? Bu vətən müharibəsində 20 min nəfər əsgərimiz şəhid olub. 6 min nəfərimiz əlilə, şikəstə dönüb. 80 min nəfərə yaxın adamımız döyüşlərdə yaralanıb, xəsarət alıb. Minlərlə girov və itkin soydaşımızın taleyindən xəbərimiz yoxdur. Bir milyondan çox azərbaycanlı öz elindən-obasından qovulub, qaçıb, didərgin düşüb, dədə-baba yurdları dağılıb, var-dövlətləri talan edilib. İndi əzab içində çöllərdə yaşayırlar. Çoxunun da ürəyi bu dərdə dözməyib, partlayıb, bir çoxu sağalmaz xəstəliyə düçar olub. Vətənimizin dörddə-bir hissəsi işğal altındadır. Bunlar bir yana.

Dağlıq Qarabağ özünü ayrıca respublika elan edib, sərhədlərini, ordusunu yaradıb, möhkəmləndirib, mətbuatı var, bəlkə də öz gerbi, öz bayrağı, da var, hələ himnini demirəm. Söhbət Ermənistanın bayrağından, gerbindən getmir. Bu respublika sərbəst bir dövlət kimi xarici dövlətlərlə danışıqlar aparır, məsələlər həll edir. Bütün günü «Artsax»ın kütləvi informasiya vasitələri, əlalxüsus da televiziyası, Qarabağın tarixən də ermənilərin olması haqqında aləmə moizə oxuyur, sənədli filmlər göstərir, yüz dəlil-sübut gətirirlər. Deyirlər ki, nəhayət çoxdan işğal olunmuş doğma torpaqlarımızın bir hissəsini azad edə bilmişik, onu möhkəm qorumalıyıq…

Amma biz hələ də əcnəbi dövlətlərə isbat edə bilməmişik ki, Azərbaycanla müharibəni Ermənistan aparır. Ermənistan isə az qala bütün dünyanı inandırıb ki, müharibənin ona heç bir dəxli yoxdur, erməniyik deyə, bu işdə bizi də günahkar sayırlar, Dağlıq Qarabağın erməni əhalisi öz «tapdanmış» hüquqlarını müdafiə edir, işğalçılığa gəldikdə isə Azərbaycan Dağlıq Qarabağı çoxdan işğal edib, elə onlarınkı qədər də bizim qaçqınımız, köçkünümüz var.

Biz isə hələ də fil qulağında yatmışıq. Özümüz özümüzü inandırmağa çalışırıq ki, ermənilər bu yaxınlarda torpaqları geri qaytaracaqlar. Nə qədər də avam mllətik!

1988-ci ildən indiyə kimi, heç olmasa, bir müsəlman dövləti belə Ermənistanı rəsmən təcavüzkar dövlət kimi tanımayıb. Gü-

nahkar yenə də bizik. Çünki belə işlərdə yüksək dairələr Ermənistana həmişə yardımçı olmuşlar və olaraq da qalırlar. Əksər rəsmi görüşlərdə, rəsmi mətbuatda iki dövlət arasındakı bu dəhşətli müharibəni münaqişə adlandırırlar – Ermənistan-Azərbaycan münaqişəsi! (?). Guya bir-iki nəfər erməniylə bir-iki nəfər azərbaycanlı arasında mübahisə baş verib, sonra da ortaya münaqişə düşüb və onlar da biri-birilərindən küsüblər. (Ay bərəkallah!).

Biz beləyiksə, ermənilərdən nə istəyirik?!

**21. 08. 1996**



# «MƏN»SİZLƏŞMƏ FƏLAKƏTİ

Sənin öz «MƏN»in varsa, fikirləş ki, bütün canlıların, kolun-kosun, daşın-qayanın da da öz «MƏN»i var.

Ağıllı bal arısı bilir ki, sancsa öləcək, «MƏN»inə toxunanı sancır və ölür.

Dağların «MƏN»inə dəysən, vulkan püskürər.

Dənizin «MƏN»ini kiçiltsən, fırtınaya düşərsən.

Qayaların «MƏN»inə daş atsan, uçqun törənər.

Kol-kosun «MƏN»inə əl uzadanın əlləri qanayar.

Gözlərimin şahidiyəm, tələyə düşmüş iri boz bir canavar ovçunun uzaqdan gəldiyini gördü, çox çalışdı, pəncəsini tələdən xilas edə bilmədi, düşmən gülləsindən ölməyi öz «MƏN»inə sığışdırmadı, dişləriylə biləyini qoparıb tələdə qoydu və qanı sellənə-sellənə çıxıb getdi, belə ölməyi daha üstün tutdu.

Bəs insanın «MƏN»inə toxunanda?...Yazıqlar o günə ki, insan fağırlaşsın, «MƏN»i xırdalanmağa, alçalmağa və nəhayət, itməyə başlasın. «MƏN» itən andan qeyrətsizlik, şərəfsizlik və… vətənsizlik başlanır – TORPAQ itir, EL itir, OBA itir, XALQ itir.

Öz «MƏN»ini sevməyən kimsə heç kimi, heç nəyi sevə bilməz. Bu «Mənəm-mənəmlik» iddiası yox, «MƏN»inə hörmətdir. Öz «MƏN»inə hörmət etməyənin heç kimə, heç nəyə hörməti olmaz.

Hər ikisi babamız olsa da, bir var qanın Koroğlu qanından ola, bir var Keçəl Həmzə qanından. Keçəl Həmzələrin öz «MƏN»ləri olmur. Azərbaycanı «MƏN»siz Keçəl Həmzələr tamaha, kürsülərə qurban kəsib, tikə-tikə payladılar. İndi qürbətdə qalan torpağımızın da bağrından qara qanlar axır. «MƏN»sizlər bu millətin də «MƏN»ini öz «MƏN»ləri kimi kiçiltdilər. Elə buna görədir ki, Azərbaycanı yaltaqlar sürüsü bürüyüb. Heç kimin haqqı yoxdu ki, desin: «Mənim Azərbaycanım!», «Mənim xalqım!», «Mənim torpağım!», «Mənim Qarabağım!», «Mənim Xocalım!»… «MƏN»i olmayanın «Mənim ailəm» deməyə də haqqı yoxdur! Çünki bunlarda «MƏN» var. Gərək əvvəlcə özünün «MƏN»in ola ki, sənə də bir şey məxsus ola. Olmayan şeyə heç nə aid deyil.

Millətin varlı təbəqəsindəki «MƏN»sizlər taxt-tac, haram mal-dövlət uğrunda dartışıb, Vətəni dağ-dağ, dərə-dərə, meşə-meşə, bulaq-bulaq satanda, kasıb təbəqədən olan «MƏN»lilər müharibədə qan tökürdülər, şəhid olurdular. Vətən uğrunda şəhid olanların, qan tökənlərin «MƏN»ləri var. Onların hesabına at oynadanların, Qarabağın əldən gedən namusunu yox, öz ciblərini güdənlərin hər tərəfə – eninə, irəliyə, geriyə kökələnlərin «MƏN»ləri yoxdur. Onlar üçün ya biz, ya qıyıq, ya üz, ya astar, ya qeyrət, ya qeyrətsizlik, nə fərqi var ki? Taki vəzifə olsun, pul olsun. Bədbəxtik ki, bizə belələri başçılıq etdilər. Bəzən indinin özündə də «MƏN»sizlər «MƏN»i olanlara «ədalət məhkəməsi» qururlar.

Faciəmiz orasındaydı ki, o vaxtlar yuxarıdan başlayan «MƏN»sizləşmə çox sürətlə aşağılara da yayılırdı. Bu, bizim fəlakətlər üstündən fəlakətimiz idi!

İtkin «MƏN»lər geri qayıdanda, bulanıq sular durulanda, duman çəkiləndə, aydınlıq olur. Və beləliklə «MƏN»lə başlayan mənəviyyata da nur düşür. Amma doğma Azərbaycanın «MƏN»i bütövləşməyənə qədər heç birimizin hələ də haqqı yoxdur ki, «Mənim Azərbaycanım!» desin.

**1996-cı il.**



# ZİYALI GİLEYİ

***(Bir həmkarımın dedikləri)***

– Mənim iki ali təhsilim var, iki kitab müəllifiyəm və işlədiyim vəzifə ştatının əmək haqqı 100 min manatdır. Ailə üzvlərim beş nəfərdir. Bundan əlavə xəstə anamla xəstə bacıma və onun iki yetim uşağına da mən maddi yardım göstərmək məcburiyyətindəyəm.

Ayrı heç bir iş əlimdən gəlmir. Fəhləlik üçün də yer tapılmır. Alver etməyə də cibim imkan vermir.

Hesablamışam, aldığım əmək haqqı (onu da vaxtında versələr) bizim ailənin heç quru çörəyini də ödəmir. Deyirlər ki, dövlət büdcəsi də mənim kimilərinin ciblərindən də boşdur. (Yoxsa əmək haqqımızı mütləq qaldırardılar).

Evdə gümanımız gələn nə varıydısa, hamısını satıb ehtiyacımıza xərcləmişik. Daha satılası heç nə qalmayıb. Sələmlə borc aldığım pullar da gedib. İndi mənə sələminə pul da vermirlər, görürlər ki, qaytara bilmirəm. Borcun içində boğuluram. Bir yandan da sələmin faizləri…

Bəs mən nə etməliyəm? Bilirəm, hal-hazırda bu sualı Azərbaycanın bütün təmiz ziyalıları verə bilərlər, yəni hamımızı eyni kökə salıblar. Amma, həqiqətən də, biz neyləməliyik ki, həm özümüz, həm də ailə üzvlərimiz acından ölməyək?!

Bir yandan deyirlər ki, ziyalı təbəqəsi xalqın düşünən beynidir. (Beyni iflic vəziyyətinə salınan bir xalqın günü-güzəranı elə bizimki kimi qara olmursa, bəs necə olur?) O biri yandan da deyirlər ki, hər bir ziyalı öz işini görməlidir. Amma demirlər ki, hansı işi və necə?

Hamımız bilirik, amma çoxumuz deməyə qorxuruq ki, yuxarı təbəqə, yəni «yağlı vəzifə» sahibləri var-dövlətin içində üzür, nəsilbənəslinə bəs edincə pul yığıb, daş-qaş yığıb, hər cür dəm-dəstgahları, növbənöv xarici maşınları, topdağıtmaz mülkləri… Xalqın pis gününün günahını da müharibənin üstünə yıxırlar. Əgər günahkar müharibədirsə, bəs onlar günbəgün necə varlanıb harınlayırlar? Belə çıxır ki, müharibə yalnız bu bədbəxt kasıblar üçündür, hə? Danışanda da elə danışırlar ki, guya dilənçi halına

saldıqları millətin dərdindən gecə səhərə qədər yata bilmirlər.

Müharibə mənim nə evimi dağıdıb, nə də eşiyimi. Mən bu gündəyəmsə, bəs nələri varıydısa talan edilmiş, var-yoxdan çıxmış, yurd-yuvalarından qovulmuş bir milyonluq didərginlər ordusu nə gündədir? Bəs günlərlə qapıları döyməkdən barmaqları qabar olmuş, katibəli kabinetlərin qapıları arxasında növbə gözləməkdən gözlərinin kökü saralmış, hər yerdə həqarət və minnətlə qarşılanan, lakin heç bir dərdinə əlac tapa bilməyən bu yazıq işsiz-gücsüz müharibə veteranları, şəhid ailələri hara üz tutsunlar?

Zavallı millət!

**21. 08. 1996-cı il.**



# SƏLƏM BƏLASI

Müharibə özü ilə bərabər bəşər övladı üçün hansı bəlaları gətirmir?! Ölüm, qan-qada, aclıq, səfalət, didərginlik…

Bunların hamısı məlumdur. Amma xalqın mənəviyyatına, ictimai əxlaqa və beləliklə dövlətçiliyimizə vurulan elə zərbələr də vardır ki, bunların gətirdiyi bəlaları heç nəylə ölçmək, müqayisə etmək mümkün deyil. Onsuz da müsibətli günlərini yaşayan Azərbaycanı – Bakıdan tutmuş ta ən ucqar kəndlərimizə qədər – bürüyən «sələm bəlası» da bu qəbildəndir.

Dədələrimizin yaddaqalan deyimlərindən biri də budur: «Əl tutmaq Əlidən qalıb». Müqəddəs «Qurani-Kərim»də də buyrulur ki, ehtiyacı olanlara, fəqir-füqəraya kömək etmək, əl tutmaq savab işdir və bu, Allaha xoş gedir.

İndiki imkanlı adamlarımız gərək Allahın, heç olmasa, bu buyruğuna əməl etsinlər ki, öz məkirli əməllərilə qazandıqları yüzlərlə ağır günahlardan bəlkə bəziləri yuyula. Bunun əvəzində bəs onlar neyləyirlər? Öz millətinin dərdindən, faciəsindən də gəlir mənbəyi kimi istifadə edən belə şərəfsizlər əlacsız qalıb, onlara əl açanlara minnəti minnət üstündən vurub, sələminə pul (dollar) buraxırlar. (Çoxu da öz əlilə yox, muzdlu nökərlərin əlilə). Bunların əksəriyyəti də vəzifə sahibləridir. Torpaq alveri, xarici valyuta, qızıl, daş-qaş alqı-satqısı bəs deyilmiş kimi, indi də başlayıblar bu xalqın ehtiyacı ilə alver etməyə. Bütün bunların hamısı hüquq-mühafizə orqanlarının gözləri qarşısında baş verir. Bəs niyə tədbir görmürlər? (Bu və buna bənzər «niyə?»lərin cavablarını onların özləri daha yaxşı bilirlər).

İndi vəziyyət elədir ki, faciə və ehtiyac çoxumuzun qapısını döymədən içəri girir, bizimlə qolboyun yaşayır, birdən də yaxamızdan yapışıb bütün varlığımızı elə silkələyir ki, ölümü bir şərəfli iş bilirik. Qaçqınlar, şəhid ailələri, əlillər, işsiz veteranlar bu ağrı acını daha yaxından duyurlar.

Bilirəm, sələmin nə olduğunu izah etmək lazım deyil. Çünki aşağıdan-yuxarıya qədər hamımızın bundan xəbəri var. Lakin, görün, tamah hansı mərtəbəyə qalxıb ki, əlacsız bədbəxtlərin göz yaşlarından da pul qazanırlar. Hələ bu harasıdır? Əl açan zavallı-

ya sələmlə pul verməzdən əvvəl verdiklərindən də artıq dəyərdə «zaloq» tələb edirlər. (Onun «zaloq» qoymağa bir şeyi varıydısa, daha sənin kimi alçağa niyə əl açırdı ki?!). Bədbəxt kasıb məcburiyyət qarşısında arvad-uşağının, qohum-əqrəbasının boyun-boğazında nə qalıbsa (nişan üzüyü olsa belə), soyub, gətirib verir Tanrının bu «xeyirxah bəndəsinə». Həmin «xeyirxah» da verəcəyi pulun (dolların) müqabilində elə nırx (faiz) tələb edir ki, uzağı 2-3 aya verdiyindən də çox qazanır və sonra da həmin verdiyini də alır. Əgər sələminə pul alanın qaytarmağa imkanı yoxudursa, sələmçinin nə vecinə, evini satsın, ya dilənsin (dilənçi əlindən yer var ki?!), ya adam öldürsün, ya da namusunu hərraca qoysun!

Əgər xislətimizdə yaxşı deyilən bir-iki şey varıydısa, onlar da çürüyüb gedir. İçimizdəki hər şeyi – vicdanı da, insafı da, qeyrəti də tamahmız yeyir.

Əcnəbi millətlər bizə təmənnasız köməklik göstərir, yardım edir, uzaq başı, verdiyinin dəyərində nəsə alır, özümüzünkülər isə biri-birindən «zaloq» alıb sələm verir! Qanunlarımız da ki…

Allah bizi daha pis günlərdən saxlasın!

**«Fədai» qəzeti,**
**1996-cı il.**



# «MERSEDES»DƏ

***Həmkarım Nazlı xanıma:***

***Sən «Avtobusda» yazmışdın, mən də «Mersedes»də yazıram.***

«Mersedes»in qanadları çatmırdı ki, uçsun. Sürət məni qorxudurdu.

Sükanın arxasında təşəxxüslə əyləşən kişi qabaq oturacağa yayxanmış bazburutlu kişiyə dedi:

– Amma bu müharibə çoxuna düşdü ha!…

– Ələlxüsus da veteranlara və qaçqınlara. İş görmürlər, güc görmürlər, amma ağızlarını çuval ağzı kimi açıb hey tələb edirlər.

– Day demə, hərəsi cibinə bir «knijka» qoyub, düşüblər idarələrin canına, bu qapı sənin, o qapı mənim…

– İtdən çox, qurddan azdırlar. Katibəyə tapşırıram ki, belələrini buraxma içəri. Qanıb-qandırırlar ki?! O günü biri soxulub kabinetə, gözləri qızarmış halda deyir:

– Mən veteranam, bu torpağa qan tökmüşəm. Niyə həmin torpaqdan mənə bir parça vermirsiniz ki, fəhləliyimi eləyib əkib-becərim, ailəmə çörək pulu qazanım? Gedib dilənməliyəmmi?

Deyirəm:

– Qardaş, mən neyləyim ki, sən veteransan? Hər veterana bir parça torpaq sahəsi versəm, bəs pambığı hara əkim? Gedib öz ananızı, bacınızı qorumusunuz deyə çiynimə minməlisiniz? Siz də başqaları kimi getməyəydiniz.

Deməyə sözü qalmadı, durub suyu süzülə-süzülə qapıdan çıxdı.

– Vallah, indi qaçqınlarla veteranlar yağ içində böyrək kimi yaşayırlar – nə qədər yardım alırlar, nə qədər pul alırlar, nə qədər köməkliklər olunur, hamısı da müftə, yenə də gözləri doymur ki, doymur. Elə bilirlər ki, biz süd gölündə üzürük. Başa düşmürlər ki, vəzifənin də öz dərdi-səri var.

– O günü yenə bir veteran gəlib ki, (bəlkə də erməniyə tərəf heç bir güllə də atmayıb) yaşamağa yerim yoxdur, mənə köməklik göstərin.

Deyirəm:

– A bala, Azərbaycanda bir milyondan artıq qaçqının da ya-

şamağa yeri yoxdur, bəs necə dözürlər? Bəlkə sənə alt-üst mərtəbəli bir ev tikdirək?

Hələ gör mənə nə cavab verdi:

– Sən alt-üst mərtəbəli, çarhovuzlu evində kababdan yeyib, araqdan vurub, şirin-şirin yatanda, mən döyüşdə kipriklərimlə od götürmüşəm, ailəm də çörəyə möhtac yaşayıb. Sən rüşvəti ətək-ətək alanda, mənim pulum olmayıb ki, bir «Astra» siqareti alıb, yoldaşlarımla çəkim. Biz olmasaydıq, indi sənin yerində Vartan oturmuşdu, peysərin də daha elə yoğun deyildi.

Hirs vurdu beynimə, rəisin «knopka»sını sıxdım, gəlib apardılar. Deyəsən, ağlını başına gətiriblər – daha gözümə görünmür.

– Düz eləmisiniz. Bunlara üz verdikcə qudururlar.

– Allah bu kişiyə dəyməsin! Qurtarsa, müharibəni o qurtaracaq. Bəlkə ondan sonra bizim yaxamız bu sırtıq «maçalka»ların əlindən qurtarsın.

İstədim deyəm ki:

– Elə onların da canı sizdən qurtarardı.

Amma dinmədim. Nə işimə qalmışdı ki?

**«Fədai» qəzeti,**
**1996-cı il.**



# VALLAH, QATIQ QARA DEYİL

Bu müxalifət deyilən şey ki, var, lap ağ eləyib. Ağı da, qırmızını da, göyü, yaşılı, sarını da, qara görməyə öyrəniblər. Elə bil gözlərinə qəsdən qara eynək geyiblər ki, hər şeyi qara görsünlər. Soruşan da yoxdur ki, a balam, bu dünyada qaradan savayı ayrı rəng yoxdur?

Azərbaycanda son dövrlərin iqtidarları (özlərindən başqa) qatığa ağ desələr, bunlar o dəqiqə yerlərindən hoppanıb etiraz ediblər ki, yox, qaradır və başlayıblar külli-aləmə hay salmağa: «Azərbaycanda insan hüquqları pozulur, azadlıq tapdanır, demokratiya boğulur, diktatura hökm sürür! Dinənin ağzına qıfıl vururlar, əllərini tərpədənin qollarına qandal!». Səbəb də onu göstərirlər ki, iqtidar qatığa ağ deyib. Əşi, bəs qatıq nə rəngdədir?!

Prezident seçkisi keçirilir, qara eynəkdən baxıb deyirlər ki, seçki qutularının üstünə qırmızı parça əvəzinə qara parça tikdiklərinə görə nəticə saxtalaşıb. Respublika parlamentinə deputat seçilir, özü də bir yerə 2-3 namizəd irəli sürülür, həm də iki sistem üzrə aparılır (əlbəttə, əsil demokratiya!), deyirlər ki, yox, fəndi-fırıldaqdır, hər şey yuxarının diktəsiylə həll olunub. Ümumxalq səsverməsilə yeni, milli Konstitusiyamız qəbul olunur, buna da öz şakərlərinə uyğun bir qulp taxırlar. Dünyaya səs salan neft kontraktları bağlanır, deyirlər ki, indiki iqtidar kontraktlara göy qələmlə deyil, qara qələmlə imza atdığına görə xalqın mənafeyi gözlənilməyib. Ay qardaş, bəs kimin mənafeyi gözlənilib?! Daha nə bilim, nələr, nələr…

İndi də başlayıblar ki, Lissabon Sammiti elə gəldi, Lissabon Sammiti belə getdi. İqtidar deyir ki, bu zirvə toplantısının yekunu Azərbaycan diplomatiyasının qələbəsidir, onlar deyirlər ki, yox, məğlubiyyətidir. İqtidar deyir ki, qətnamə ilə bəyannamənin heç bir fərqi yoxdur, müxalifət deyir ki, biz hərif deyilik, özünüzə keçin, bunlar ayrı-ayrı şeylərdir. Onların səsini kəsmək üçün Azərbaycan xalqı məcbur olur ki, bütün sutkanı «işləyən» fabrik-zavodları boş qoyub, «başdan aşan iş-gücünü» tərgitsin, «öz xoşu» ilə mitinqlər, nümayişlər, iclaslar keçirsin və bildirsin ki, biz

Lissabondakı tarixi qələbəni alqışlayırıq. Radio-televiziyamız da bu tərs müxalifəti başa salmaq üçün məcbur qalır ki, gecə-gündüz bütün verilişlərini Lissabon görüşünün müsbət yekunlarına həsr etsin. Çünki ayrı əlac yoxdur, qanmayanı qandırmaq lazımdır, ya yox? Düzdür, hərçənd ki, saqqız çox çeynənilləndə çürüyür, amma bu, saqqız deyil, təbliğatdır, özü də canlı və real təbliğat.

Son sözüm odur ki, müxalifət nahaq yerə qarnını cırmasın. Atalar məsəlidir: «Dəyirman öz işindədir, çax-çax baş ağrıdır». Onsuz da xalq hər şeyi qanır. O, bəzi sözbazların dedikləri kimi nə kordur, nə kardır, nə də maymaq. Qədimlərdən indiyə kimi hər şeyi görür də, eşidir də, başa düşür də. Düzdür, bir o var ki, çox vaxtı gözlərini yumur, özünü eşitməzliyə qoyur və avamlıq göstərir, yəni ki, dinib-danışmır. (Anlamaq lazımdır ki, bunun də bir neçə səbəbi var). Ona görə də heç kim öz şəxsi mənafeyi üçün çığır-bağır salıb, özünə bihudə zəhmət verməsin.

Bir də, ay müxalifət cənabları, vallah, qatıq qara deyil!

**1997-ci il.**



# QARABAĞIN TALEYİ, GÖRÜN, KİMLƏRƏ TAPŞIRILIB?!

***Tanrım, sən bizi özümüzdən qoru!***

Qarabağın sülh yolu ilə işğaldan azad olmasını hamıdan çox ilk öncə bu xalqın sadə və kasıb təbəqəsi istəyir. Amma bu bədbəxt təbəqənin də başı ruzi axtarmağa elə qarışıb ki, Qarabağ məsələsi yalnız xeyirdə-şərdə yadlarına düşür. Bunlardan sonra işğaldan azad olunma məsələsini iqtidarlı-müxalifətli qanlarında, çox demirəm, bircə qırıq vətən sevgisi olanlar da istəyirlər. Lakin bilmirlər ki, bu məsələni nə təhər həll etmək olar. Çünki əldəki düyünü dişə salıblar.

Bəs bu düyünün açılmasını istəməyənlər kimlərdir? Kimə sirdir ki? Lap elə birincisi bizə dost olmayan ölkələr, yəni istədikləri vaxt Azərbaycana «hə», istədikləri vaxt «yox» dedirtmək istəyənlər, ölkəmizi «Maral otu»na döndərməyə can atanlar. (Əbədi dostlar yox, əbədi maraqlar var, axı!) Bəzən buna nail də olurlar. (Burasını məxfi saxlayaq). Və görün nə günə qalmışıq ki, Qarabağın taleyini güya beynəlxalq aləm səviyyəsində həll edəcək ATƏT-in Minsk qrupunun həmsədrlərini sevməyi zorla pərçim edirlər biz yazıqlara. Deyən çox azdır ki, qardaş, Metyu Brayzəni (Amerika), Yuri Merzlyakovu (Rusiya) və Fasye Bernarı (Fransa) bizəmi tanıdacaqsınız? Onların indiyədək ortaya qoyduqları siyasətin məntiqi nəticəsi deyilmi ki, «saqqız hələ də çeynənə-çeynənə» çürüyür?». Onlar deyilmi ki, o günləri o boyda BMT-nin o boyda iclasında Azərbaycan ədalətinin əleyhinə səs verən 7 ölkədən 3-ü? Kimə müşkül görünürsə, qoy agah olsun, Amerika da, Rusiya da, Fransa da Dağlıq Qarabağ və onun ətrafında baş verənləri, bəli, nizama salmaq istəyirlər, amma bizim xeyrimizə yox, ermənilərin xeyrinə. «Kor-kor, gör-gör». Bunu başa düşmək üçün alim olmaq lazımdımı? Daha bəsdirin, siz Allah! Dünya üstümüzə azmı gülüb?! Metyu da, Yuri də, Fasye də və bunlardan sonrakılar da öz ölkələrinin maraqlarını qoyub, «kakoy ni bud» Azərbaycanı dəstəkləməyəcəklər ki? Götürəndə, elə onların özləri deyilmi bu Qarabağ düyününü yaradanlar? Əlbəttə, onlardır. Bəs

belə olan şəraitdə elənçi yadlardan bir şey uman adamın ağlına nə deyərlər, adını nə çağırarlar? Lakin biz yenə də özümüzə gəlmirik. Yenə də bərk-bərk yapışırıq həmin əcnəbilərin ətəyindən və yalvarırıq ki, ay amerikan, ay rus, ay fransız, nə olar, amandır, bizim öz Qarabağımızı özünüzünkündən alın verin bizim özümüzə! Doğrudan da, bu, başı balqabaqlıq deyil, bə nədir? Hələ də bizə çatmayıb ki, bu ölkələr Çarlz Darvinin «insan ictimai heyvandır» nəzəriyyəsini yalnız bizə şamil edirlər. Niyə? Məsələnin elə yoğun tərəfi də burdadır. Hər nə isə…

«İkili standart» deyəndə, nəyi nəzərdə tuturuq? Bəlkə bu aydın ifadə də hələ sizə çatmayıb? Deyəsən, çatmayıb, axı? Çünki səsin çatması üçün eşidən qulaq lazımdır. Bu, bizdə varmı?

Qarabağın işğalda qalmasını istəyənlərin bir qismi də var ki, onlar bu oyundan babat pul qazananlardır. Nəf olan yerdə hansı millətdən olduğunu bizdə yaddan çıxaranlar o qədərdi ki!... Nə olsun ki? Onlar üçün pul hər şeydir – namusdur, qeyrətdir, ailədir, vətəndir. Həqiqətən də, lap elə bizim bəzi məmurlar üçün pulun yanında vətən nə matah şeydir ki?! Qardaş, unun bir tayı artıq 40 manata yaxınlaşıb, ey! Çörək də ət deyil ki, aylarla yeməyib, üzünü görməyib, dözəsən, yaşayasan. Bu, çörəkdir, çörək! Bəs yalnız bircə pensiyaya möhtac qalan ailələr neyləsinlər? İraq, min iraq olsun ki, həmin ailədən kimsə xəstələnə, bəs onda necə? Ruzi ala bilməyən dərman ala biləcəkmi?

… Biri şələsində ot, çiynində tüfəng, əlində bellə torba, cibində kibrit yol gedirmiş. O biri ondan soruşur:

– Hara belə?

Biri cavab verir:

– Tülkü ovuna gedirəm.

– Ov üçün elə tüfəng bəs deyilmi?

Ova gedən deyir:

– Yox, bəs deyil.

– Niyə?

– Çünki tülkü qarşıma çıxarsa, bu tüfənglə onu nişan alıb atanda bəlkə dəymədi? Onda qaçıb girəcək yuvasına. Bilirəm ki, tülkü bicin birisidi, yuvasına həmişə iki yerdən deşik qoyur ki, qısqı bərk gələndə, qaçıb canını o biri deşikdən qurtarsın.



Bu bellə onun girdiyi yeri qazacağam, tapmasam, bu otu həmin deşiyin ağzına qoyub, bu kibritlə od vuracağam. Torbanı isə aparıb o biri deşiyin ağzına elə tutacağam ki, tüstü tülkünü boğanda, qaçmaq istəsə, bu torbaya girsin.

– Qardaş sən ki, bu təm-taraqnan ova gedirsən, tülkününkü qaldı bir Allaha!

Bizim məmləkətdə bizim məmurların əlindən Allaha qalan işlərimiz çoxdur. Yaxşı, deyək ki, pullularımızın arasında bu xalqı sevənlər var – istər iqtidar eşalonu olsun, istər müxalifət. (Sevənlər də fərqli olur – biri sevir ki, kömək eləsin, o biri sevir ki, soysun). Bunlar aydındır. Bəs millətin taleyüklü məsələlərində bu bitərəflər, yəni heç bir tərəfi – sağı, solu, qabağı, arxası olmayanlar, sifətsizlər, şarlar, buğələmunlar və s. kimlərdir? Onlar üçün bu həyatda kişilərə və yaxud qadınlara xas olan bircə meyar varmı?

**Fikrət Sadıq yazıb:**

**Üç cür olur zurnaçılar:**
**Biri elə zurna çalar,**
**Biri belə zurna çalar,**
**Biri də elə-belə zurna çalar.**

Mənim zənnimcə, vətənə sevgi baxımından da üç xeylaq var – kişi xeylağı, arvad xeylağı, bitərəf xeylağı.

Və nəhayət, kimlər Azərbaycan torpaqlarını ta qədimdən bu günə kimi hərraca qoyub sataraq ətək-ətək qazanc götürübsə, tarixə bəllidir. Kimlər son olaylardan üzü bəri puldan ötrü neyləyibsə, o da gizli sirr deyil. Bəs qaranlıq olan nədir? Məncə, nəsə var. Nə təhər olur ki, 1823-cü ildən 170 il keçər-keçməz Azərbaycanın 410 min kvadrat kilometr ərazisindən cəmi 70 min kvadrat kilometrdən də azı qalır, amma danışanda deyirlər ki, 20 faiz torpaqlarımız işğal altındadır? Bunlar, Molla Nəsrəddin demiş, ya say bilmir, ya da gündəyməzlərinə şallaq dəyməyib.

Sonda «Partizan hərəkatı» adlı bir təklif vermək istəyirdim, amma qorxdum ki, buna da bir qulp taxıb deyələr ki, indi biz kişilərin bu qıt vaxtında duraq «Mixaylo»nu, «Xarqo»nu hardan tapaq? Mən də cavab verəm ki, niyə minlərlə karrantilərimiz olaola amma bir «Mixaylo»muz yoxdur? Var, axı! Həm də çoxdur.

Bundan sonra da desələr ki, yox, olmaz, onda mən də bu misalı çəkməyə məcbur olam:

Bir nəfər idarə rəisinin kabinetinin qapısını aralayaraq, başını içəri salıb soruşur:

– Olar, rəis?

İçəridən zəhmli səs eşidilir:

– Yox, olmaz!

Həmin şəxs qapını açıb içəri girir, düz gəlib oturur rəisin qənşərindəki stulda və deyir:

– Bə niyə oldu, ə?

Görəsən, biz də «olmaz»lara baxmayıb, Qarabağ məsələsində bu adam kimi öz bildiyimizi eləsək, nə təhər olar?

**2008-ci il.**



# MƏMUR ÖZBAŞINALIĞI

Azərbaycanda bəzi yüksək çinli məmurları qurdalasan, bəlkə də varidatı keçmiş səhiyyə naziri Əli İnsanovunkundan çox olar ki, az olmaz. Bu, lap əladır! Çünki varlıları çox olan ölkənin özü də varlı və qüdrətli olur. Bazar iqtisadiyyatıdır, demokratiyadır. «Bacarana baş qurban!». Kimin fərasəti varsa, varının üstünə var gətirsin, milyonçu, lap milyardçı olsun. Kimin nə borcuna ki? Məsələn, kimə nə dəxli var ki, hər hansı nazirin və yaxud idarə rəisinin Azərbaycanın səfalı bölgələrinin hamısında, (Bakını, xarici ölkələri demirəm hələ) dəyəri kosmik rəqəmlərlə ölçülən mülkləri, villaları, bir sözlə, nağıllar aləmindəki kimi dəm-dəzgahları var?! Bunlar hələ üzdə olanlardır. Nə işimə qalıb? Deməzlərmi ki, qardaş, çalış, vuruş, sən də qazan? Nə vaxt sənə dayan deyən olsa, onda qınayarsan bizi.

İndi durub varlıların hesabını aparsam, gülərlər mənə. Fikirləşərlər ki, özünün yoxudu deyə, paxıllıqdan çatlayır. Amma bir məsələ var, görəsən bu varidatlar haradandır, dədəsindən, babasından qalmadırmı? Haramdır, yoxsa halaldır?

Ölkəmizdə güya rüşvətxorluğa və korrupsiyaya qarşı mübarizəni gücləndirmək məqsədilə dövlət səviyyəsində lazım gələn bütün sərt tədbirlərin görülməsi üçün hər cür hüquqi əsaslar yaranıb. Görəsən həmin təzminatları yerinə yetirməli olan məmurlar öz vəzifələrini icra edirlərmi? Əfsuslar olsun ki, yox. Onların bəziləri nəinki rüşvətxorluğun və korrupsiyanın qarşısını almaq üçün iş görür, əksinə, buna özləri şərait yaradır və bəhrələnirlər.

Birdən soruşan olar ki, indiki zamanda Azərbaycanda rüşvətxorluq və korrupsiya mövcuddurmu? Əlbəttə, mövcuddur. Bəs buna rəvac verən nədir? Yalnız məmur özbaşınalığı.

Dövlətimizin Konstitusiyası var, çox humanist, sivil dünyanın tələblərinə uyğun gözəl qanunlarımız var. Lakin bu qanunları icra etməli olan bir çox məmurların özbaşınalığı hər şeyi korlayır. Bu «məmur özbaşınalığı» nə deməkdir, axı? Bu, o deməkdir ki, məmurlar qanunların tələb etdiyinin əksinə edir, vəssalam. Elə xalqın dərisinin və sərvətinin hesabına varidat yığmaq da bu məqamdan başlayır.

Hər hansı külli-ixtiyar səlahiyyət sahibi olan bir məmuru götürün və bir az öz-özünüzdə sorğu-sual aparın. Məsələn, özünüzdən soruşun ki, bir məmurun aylıq məvacibi bir belədir, arvadı da bir belə qazanır. Bunlarla, biri, yenə məsələn, 1.000.000 dollara başa gələn neçə mülk tikmək və almaq olar? Dəyəri 100.000 dollarla ölçülən neçə maşın almaq olar? Gündə bu ailənin üzvləri nə qədər pul xərcləyir? Nə qədər qızıl, nə qədər daş-qaş alır? Banklara nə qədər yatırım yatırır? Və sair və ilaxır… Mən bilirəm ki, cavablar həyatda olanlarla düz gəlməyəcək.

Qarabağın gününə ağlayanlar isə gündəlik ruzilərinin dərdini çəkməkdən üzülüblər, «ciyərləri vərəm» bağlayıb.

Belə məmurlar elə bil biri-birilərinin «ağızlarına tüpürüblər». Bu gedir, o gəlir, yenə «həmin dalğa, həmin koordinat…». Eybi yox. Xalqımız onsuzda onların əməllərini görür, başa düşür. Bu naqişlər tərəfindən nə qədər sadə insanlar əzilsələr də, hüquqları nə qədər tapdansa da, dözürlər. Ayrı əlacları da yoxdur. (Bir məmurdan o birisinə şikayət etməyin nə faydası var ki?).

Bu yaxınlarda televizorda hansısa xarici ölkədə məhkəmə salonundan bir veriliş göstərirdilər. Biri o birinin itinin hüququnu pozmuşdu – nahaqdan hürdürmüşdü. Məhkəmə günahkar şəxsi küllü miqdarda cəriməlidi ki, sən niyə o itə əziyyət verib hürdürmüsən? (Halbuki it özü hürmüşdü və onun peşəsi hürməkdir).

Bizdə isə bəzi məmurlar insanların başına yüz oyun açır, amma…

Bunlar ötərgi proseslərdir. Keçid dövrüdür.

«Burda mənəm, Bağdadda Kor Xəlifə» əqidəsi ilə yaşayan vəzifə sahibləri gec-tez öz əməllərinin əvəzlərini alacaqlar. Çünki heç vaxt «buynuzsuz qoçun heyifi buynuzlu qoçda qalmır». Özlə-rini cəzasızlıq mühitində hiss edənlər yanılırlar.

**2008-ci il.**



# TAMAH

Azərbaycan xalqının qara günləri tarixən öz içindəki qara tamahın törətdiyi faciələrin fırtınalarından başlayıb. Var-dövlətə, şöhrətə, taxt-taca və nəhayət, qadına olan tamah zaman-zaman ata-ananı övlad, övladı ata-ana, qardaşı qardaş-bacı qatilinə çevirmişdir. Nəticədə tamah dövlətin özülünün dağılmasına, məmləkətin və millətin zəlilliyinə gətirib çıxarmışdır. Əfsuslar olsun ki, bu gün də tamah hər şeyi üstələmiş, ölkənin və xalqın taleyini tükdən asılı vəziyyətə salmışdır.

Tamahın taxt-tac uğrunda mübarizə və rüşvət qolları indiki ağır günlərdə Azərbaycanı öz ağuşunda elə sıxmışdır ki, vətəndaşları səfil olan bu məmləkətin sümükləri qırılmış, fəqərə sütunu zədələnmiş və ciyərləri vərəm olmuşdur. İndiki iqtidarın apardığı dözülməz kadr siyasəti isə tamahın bütövlükdə respublikanı xırta-xırtla çeynəyən dişlərini daha da itiləmişdir.

İndiki əlacsızlıq burulğanında yerin dərinliklərindən püskürüb qalxan vulkanın qarşısını almaq necə mümkündürsə, rüşvətxorluğun da qarşısını eləcə almaq olar.

Ermənilərin Göycə, Dərələyəz, Zəngəzur mahallarından tutmuş Qarabağa, Kəlbəcərə, Qazağa qədər on min kvadrat kilometrlərlə «yiyəsi ölmüş» torpaqlarımıza sahib çıxmaları, soydaşlarımızın başlarına gətirdikləri min bir bəlalar və dəhşətli müsibətlər, bizim millətin öz içinə çəkilə-çəkilə qeyrətsizləşməsi mahiyyət etibarı ilə başbilənlərimizin iti tamahlarının nəticəsidir.

İndi bu xalq nə etsin? Başına haranın külünü töksün? Salındığı iflic vəziyyətindən özünü necə qurtarsın, ümidini kimə bağlasın?!

Mənə elə gəlir ki, yenə də özümüzə gümanımız qalıb. İtin yemədiyi namusu yediyimiz bəsdir! Nicat yolunu kənarda yox, özümüzdə, öz içimizdə axtarmalıyıq. Axtaraq, bəlkə də tapdıq?!

**31. 05. 1993-cü il**

# ƏFSANƏVİ QƏHRƏMAN

***Biz Vəzirlə qohum idik. 1949-cu ildə ailələrimiz Dərələyəzdən zorla köçürülmüşdülər, yəni deportasiya olunmuşdular. Siftələr Xoruzlu kəndində bir həyətdə yaşamışdılar. Yaşamışdılar deyəndə… O vaxtlar çiy kərpicdən tikilmiş evləri barmaqla saymaq olardı. Çoxları kalafa kimi qazılmış, üstü ya qaratikan kolu, ya da qamışla örtülüb torpaqlanmış yeraltı daxmalarda yaşayırdılar.***

***Sonralar Vəzirin atası Surxay kişi və anası Mahı nənə bizdən ayrılaraq özlərinə dam-daş düzəltdilər.***

***Vəzir Orucovla mənim dostluğum olmayıb və təsadüfi hallarda görüşmüşük. Sonuncu dəfə isə, səhv etmirəmsə, atası Surxay kişinin yas mərasimində qarşılaşmışdıq…***

***İndi də anası Mahı nənəni görəndə ona böyük ehtiram göstərməyi özümə borc bilirəm.***

* * *

Vəzir Surxay oğlu Orucov! Əfsanəvi qəhrəman, düşmənin üstünə əlində silah gözünü qırpmadan gedən qorxubilməz, yenilməz bir igid! «Azərbaycanın Milli Qəhrəmanı» adına layiq görülmüş Tərtərin ilk cəngavər oğlu! Döyüşçü dostlarının xatirələrində, Azərbaycan xalqının ürəyində özünə əbədi məskən salmış əsl vətəndaş! Bu gün onun cəsarəti, döyüşlərdə göstərdiyi igidlikləri haqqında rəvayətə bənzəyən, əslində isə gerçək olan neçə-neçə inanılmaz əhvalatlar danışırlar. Vəzirin hər döyüşü bir qəhrəmanlıq salnaməsidir.

Vəzir Orucov 1956-cı il dekabr ayının 11-də Tərtər rayonunun Xoruzlu kəndində dünyaya göz açmışdır. Orta təhsilini doğma kəndində başa vurduqdan sonra 1974-cü ildə Bakı Yüngül Sənaye Texnikumuna daxil olmuşdu. Bir il sonra hərbi xidmətə çağrılmışdı. Sonra təhsilini başa vurub doğma rayonuna dönərək əmək fəaliyyətinə başlamışdı. 1982-ci ildən 1992-ci ilədək Rusiyanın Arxangelsk Vilayətində yaşamışdı.

Dağlıq Qarabağ hadisələri tuğyan etdiyi bir vaxtda Vəzir doğma torpağına qayıdaraq «Tərtər» Özünümüdafiə Batalyonuna könüllü yazılmışdı. Sıravi döyüşçü kimi mübarizəyə başla-



yan Vəzir Orucov batalyon komandirinin müavini vəzifəsinədək yüksəlmişdi. O, 1992-ci il sentyabr ayının 1-də Ağdərə bölgəsində Çıldıran kəndi uğrunda gedən döyüşdə ağır yaralanmışdı. Noyabr ayının 2-də, tam sağalmasa da, yenidən ön cəbhəyə qayıtmışdı. Ağdərə bölgəsinin azad olunmasında misilsiz qəhrəmanlıqlar göstərmiş, cəsurluq və qorxmazlıq rəmzi kimi əbədilik yaddaşlara köçmüşdü.

Vəzirin adı gələndə ermənilər tir-tir əsirdilər. Onun başına qiymət də qoyulmuşdu. Kim Vəziri öldürsə, ona küllü miqdarda mükafat veriləcəkdi.

Vəzir Orucov həm kəşfiyyata, həm də döyüş əməliyyatlarına gedirdi. Onun «PK»sının və qumbaraatanının sorağı hər yana yayılmışdı. Vəzir yüzlərlə erməni quldurunu məhv etmiş, düşmənin onlarla hərbi maşınını və texnikasını sıradan çıxarmışdı.

Mən bu yazıda Vəzir Orucovun döyüş yoldaşlarından şəxsən eşitdiyim bəzi xatirələri oxuculara çatdırmaq istəyirəm.

* * *

***Zahid İmanov:***

«Vəzir Orucov cəngavər bir oğlan idi. O, həmişə deyirdi:

– Hücuma keçməzdən əvvəl mütləq kəşfiyyata gedib öyrənmək lazımdır ki, görək irəlidə nə var, nə yox? Sonra hücum etmək olar.

Kəşfiyyata yollanmamışdan əvvəl həmişə kimin könüllü getmək istədiyini öyrənirdi.

Bir dəfə məndən soruşdu:

– Zahid, biz döyüşə gedirik. Birdən üzə düşərsən, istəyirsən uşaqlarnan qal.

Dedim:

– Yox, mən könüllü gedirəm. Sənlə hara olsa gedərəm, lap ölümə də!

O da dedi:

– Yaxşı, elədirsə getdik .

Drambonda vəziyyəti öyrənmək üçün kəşfiyyat qrupumuz yola düşdü. Həmişə özü irəli gedirdi. Deyirdi ki, siz gözləyin, icazə verəndə gələrsiniz. O, həmişə belə idi. Ən çətin şəraitdə, ən

çətin yerlərə birinci özü gedərdi.

O vaxt ermənilər Vəzirin başına 30-40 min pul ayırmışdılar…».

***Əyyub Əhmədov :***

«…Madagiz uğrunda gedən döyüşlərdə uşaqlar qarşı tərəfdən ermənilərin başını qatdılar, biz arxa tərəfə keçdik. Gördük ki, bir «UAZ» gəlir.

– Yoldan çəkilməyin! – dedi Vəzir.

O, bunu ona görə dedi ki, ermənilər bizdən şübhələnməsinlər, elə bilsinlər ki, öz adamlarıdır.

«UAZ» dayanan kimi Vəzir erməni komandirini gözündən atdı…

Döyüşlərin birində ermənilər bizə hücum etdi, çəkildik geriyə. Vəzir gəlib çıxmasaydı, ermənilər bizi mühasirəyə salıb ya qıracaq, ya da əsir götürəcəkdilər.

Bir az sonra ermənilərin texnikası üstümüzə hücuma keçdi. Deməyəsən, aşağıda gizləniblərmiş. Patronumuz qurtarmışdı, köməyimizsə yox idi. Vəzir vaxtında gəldi. Bizə çatan kimi qışqırdı:

– Qorxmayın!

Həyəcanımız bir anda yox oldu. Döyüşdük və qalib gəldik».

***Vaqif Abdullayev:***

««Tərtər» Batalyonunun özündə çox cəngavər oğlanlar var idi.

Vəzir Orucov birinci dəfə batalyona gələndə yeddi nəfərlə gəlmişdi. Bölük komandiri təyin edildi.

O vaxt batalyonumuzun komandiri rayonumuzun hərbi komissarı Boris Zöhrabov idi. O, rəhmətlik Elman Hüseynov (Milli Qəhrəmanımız), qərərgah rəisi Pənah Məmmədov və mən qərara gəldik ki, Vəzir Orucovu bizim batalyona götürək.

Vəzir Orucov çevikliyi və yaxşı düşünülmüş əməliyyatlarıyla özünü tez bir zamanda tanıtdı. O, çox ürəkli oğlan idi. Rusiyada yaşamışdı. Azərbaycanın başı üzərini qara buludlar alanda oradan birbaşa döyüşə gəlmişdi. Gələn günü də bizim batalyonun üzvü oldu.



«Uqolnik» deyilən yüksəklikdən ermənilər texnikadan istifadə edirdilər. Verdikləri kəndi geri almaq planları var idi. Bu, baş tutmadı. Vəzirin və kəşfiyyatçı yoldaşlarının səyi nəticəsində onların planları alt-üst oldu. Ümumiyyətlə, Vəzirin kəşfiyyat qrupunun döyüşdən əvvəlki fəaliyyatı həmişə qələbəmizin yarısını təmin etmiş olurdu.

Bir dəfə rəhmətlik Vəzir və onun kəşfiyyat dəstəsi ermənilərin arxasına keçmişdi.

Biz isə digər dəstələrlə başqa tərəfdən irəliləyirdik. Vəzir Orucov kəşfiyyatda çox gözüaçıq, peşəkar döyüşçü idi. Yuxarıdan bizə xəbərdarlıq etdi:

– Üzərinizə «Karopka» gəlir, hara gedirsiniz? («Karopka» şərti ad idi, yəni «BMP» gəlir).

Təpəyə çıxıb baxdıq ki, «BMP» düz bizim üstümüzə şığıyır. «Cem»də bir qumbaraatan vardı. Özümüzə mövqe seçdik.

Beləliklə, Vəzir bizi ölümdən qurtardı…»

***Suliddin Yusibov:***

«… Artıq «Turbaza»nı alıb, çıxmışdıq « Rus bulağı»nın yanına. Avqust ayının 22-si növbəti hücumumuz «Ayı heykəli»nin ətrafından başlamalı idi. Məlum oldu ki, ermənilər həmin yüksəklikdə bənd alıblar. Kəşfiyyata getdik. Hardasa bir kilometr yolu qaça-qaça qət etdik. Əvvəlcədən ermənilərə tərəf güllə atmışdıq və görmüşdük ki, bizə cavab atəşi hansı istiqamətdən gəlir.

Vəzir dəstəmizi qaldırdı həmin yüksəkliyə, «Ayı heykəli»nin yanına. Ermənilər bizi əsas Sərsəng tərəfdən gözləyirdilər. Vəzir dedi ki, biz bu tərəfdən gedək, onların əsas gözlədiyi yer gölün qırağıdır.

Bir də eşitdik ki, «Ayı heykəli» tərəfdən maşın gəlir. İsmayıl dedi ki, bu maşın mərmi gətirir. «KamAZ» gəlib keçəndə, Vəzir göstəriş verdi ki, onu vuraq. Biz maşını vurduq, başladı yanmağa, «KamAZ»la birlikdə gələn «UAZ» markalı maşın geri qayıtdı, Vəzir «PK» ilə yolu kəsdi və «UAZ»-ı da vurdu. Həmin gün gedib dirəndik Drambon kəndinin gədiyinə…

Tərtərin torpağı Vəzir kimi, Elman müəllim kimi oğulların hesabına qorunub saxlandı…».

***Nizami Heydərov:***

«1993-cü ilin mart ayının 22-də Vəzirlə döyüşə gedəsi idik. Paprəvəndin üstündə Ağdərə tərəfdə «Qlobus» deyilən yüksəkliyə hücum etməliydik. Vəzir bizim komandirimiz idi.

Qabaqda piyada qüvvələr vardı. Gördük ki, «Qlobus»a çıxan yoldan bir erməni maşını gəlir.

Dedim:

– Vəzir, gəl hücuma başlayaq.

Dedi:

– Gərək əvvəlcə yolu kəsək ki, onlara kömək gəlməsin.

Həmin «KamAZ» xeyli canlı qüvvə gətirirdi. Maşının geri qaçması mümkün deyildi. Vəzir «KamAZ»ı vurdu. Bir az keçdi, bir «QAZ-66» markalı maşın da gəldi. Onu da vurduq, yol kəsildi. İndi döyüşə gedə bilərdik.

Götürdüyümüz uşaqları böldük, yarısı mənlə sağ tərəfdən hücuma keçdi, yarısı Vəzirlə sol tərəfdən. Hardasa iki saat idi ki, döyüşə girmişdik, qırğın gedirdi. Vəzir tərəfdə nəsə sakitçilik hiss elədim.

Himayətlə Rafiqi göndərdim ki, Vəzirgildən xəbər gətirsinlər.

Rafiq gəldi ki, artıq Vəzir yoxdur. Mən də məcbur olub döyüşü yarımçıq qoydum, qayıtdım geri.

Vəzirin ölümündən sonra hamı avtomatı tulladı ki, o yoxdursa, biz gedirik, qələbə olmayacaq.

Mən döyüşçüləri sıraya düzüb dedim:

– Biz Vəziri itirmişik, indi gəlin fikirləşək, Vəzirin qanını almalıyıq, yoxsa qayıdıb getməliyik?

Dedilər:

– Qanını almalıyıq.

Dedim:

– Onda silahları götürün…».

* * *

Bir dəfə Vəzir öz dəstəsiylə kəşfiyyata gedibmiş. Sübhün açılmasına az qalırmış. Yoldaşları yerə siniblərmiş, özü isə koldan böyürtkan yığıb yeyirmiş. Alatoran imiş. Dostları görürlər



ki, 4 silahlı erməni quldburu onlara yaxınlaşır. Uşaqlardan biri həyəcanla Vəzirə pıçıldayır:

– Ermənilər gəlir, yerə yat!

Vəzir sakitcə cavab verir:

– Ə, qoy böyürtkanımızı yeyək.

Görürlər ki, düşmənlər Vəzirə lap yaxınlaşırlar. Daha da həyəcanlanırlar:

– Vəzir, yat aşağı, bu dəqiqə səni görəcəklər!

Vəzir yoldaşlarına acıqlanır:

– Qoymazsınızmı böyürtkan yeyək?! Gəlirlər, qoy gəlsinlər də!

Ermənilər Vəzirin 5-6 addımlığına çatanda, yoldaşlarından biri dözməyib, hirslə deyir:

– Ə, lap yanına çatıblar, ey!..

Vəzir qəfləti dönərək, avtomatdan açdığı atəşlə erməninin 4-nü də yerə sərir və yenə də başlayır böyürtkan yeməyə. Xeyli keçəndən sonra mat qalmış dostlarına deyir:

– Ə, sizə deyirəm ki, qoyun böyürtkanımızı yeyək də!

* * *

Vəzir gecələr kəşfiyyata gedərkən, hətta «pozisiya»da yatmış erməni silahlılarının üstündən keçərək, onların neçə nəfər olduğunu bir-bir sayırmış…

* * *

Bir dəfə Vəzirgilin dəstəsini ermənilər çox güclü atəşə tutublarmış. Bu döyüşdən sağ-salamat çıxmaq mümkün deyilmiş. Dəstənin bütün üzvləri ölümlə üz-üzəymiş.

Bu an Vəzir ermənilər tərəfə möhkəm qışqıraraq deyir:

– Ərə, danışan Vəzirdi. Atəşi kəsin!

Deyirlər ki, ermənilər Vəzirin səsini eşidib, qorxularından atəşi dayandırırlar və Vəzirin dəstəsi o döyüşdən salamat çıxır.

* * *

***Pənah Məmmədov:***

«Müharibənin ən çətin günü mənim üçün Vəzirin ölüm günü olub–1993-cü ilin mart ayının 22-si. Bu mənim ən ağrılı günüm-

dür. Mən onun ölümünü eşidəndə, rabitə xəttində ağladım.

Fəqan mənə rabitədə dedi ki, artıq Vəzir yoxdur. Bütün müharibə dövrü ərzində eşitdiyim ən ağır xəbər idi bu xəbər. Bəlkə heç indi də özümə gələ bilməmişəm. Çünki Vəzir, Vəzir idi. Onun döyüşləri çox olub. Müharibəni Ağdərə istiqamətində Vəzir aparırdı.

Müharibə dövründə çox şəhidlərimiz olub. Elman müəllim, Talıstan, Tahir, Rafiq və s. Vəzirin ölümü isə bütün Azərbaycan ordusuna təsir etdi, eləcə də mənə.

Ermənilərin bir Əfqanıstan qəhramanı var idi, «Qoralisa» deyirdilər. Ermənistan Müdafiə Nazirinin qardaşı idi. Onu bizimkilər vurmuşdular. Vəzir vurulanda, onlar toy-bayram etmişdilər ki, «Qoralisa»nın intiqamını aldıq, yəni onlar öz milli qəhrəmanlarına uyğun bir adam öldürdüklərinə görə sevinirdilər…

Elman müəllim rəhmətə getdi. O vaxt qolum işləmirdi, qıçım işləmirdi, yaralanmışdım. Amma Nəcməddin Sadıqovun göstərişi ilə gecəynən məni yataqdan qaldırıb gətirdilər. Bu olubdu 1992-ci il iyun ayının 8-də.

O vaxt Ağdərəni 2-ci dəfə erməni almışdı, bizim batalyonu da ləğv eləmişdilər.

Batalyonu yenidən yığmaq lazım idi.

Gəldim icra hakimiyyətinə. Ora-bura zəng etməklə batalyonu yığdıq. Batalyonda 220-yə yaxın uşaq vardı. Mənə komandir olmağı təklif etdilər, amma mən çətinliklə yeriyirdim, qıçım işləmirdi. Təklif etdim ki, Vəzir Orucov komandir olsun.

Siz Vəzirdəki cəsarətə, qabiliyyətə, ürəyə baxın ki, dedi:

– Yox, Pənah müəllim, sən bizim komandirimizsən, mənə göstəriş ver, haranı lazımdır, alacağıq. Dörd nəfər ayıracağam ki, xərəklə də olsa çiyinlərində səni aparsınlar. Sən ancaq mənə göstəriş ver.

Bilirsiniz, döyüşə rəhbərlik etmək, idarəetməni bilmək asan iş deyil. Vəzirin gözəl komandirlik bacarığı vardı. Lakin o mənim təcrübəli hərbçi olduğumu bildiyindən belə deyirdi. Bütün igidliklərinə rəğmən həm də çox təvazökar insan idi Vəzir.



Vəzir Orucovun həyat yoluna nəzər salarkən «qəhrəmanları şərait yetişdirir» deyənlərə haqq verirəm. Sadə bir ailədə doğulub, adi bir insanın həyatını yaşayan Vəzir bir arzusunu tez-tez dilinə gətirərdi: «Kaş ölüm azacıq möhlət verəydi, Xankəndində bayrağımızı dalğalandıraydım!» Lakin vətənin dar günündə əsl vətənpərvər oğul kimi öz qəlbinin diktəsi ilə torpaq uğrunda, xalq uğrunda döyüşlərə qatılan və savaş meydanında əsl qəhrəman kimi ömrünü vətən torpağına qurban verən Vəzirin ömrü kimi bu arzusu da yarımçıq qaldı...

* * *

1993-cü il mart ayının 22-də Ağdərə bölgəsində «Qlobus» yüksəkliyi uğrunda gedən döyüşlərdə qəhrəmancasına şəhid oldu Vəzir Orucov. Ona ölümündən beş gün sonra – mart ayının 27-də «Azərbaycanın Milli Qəhrəmanı» adı verildi. Vəzir Orucovun məzarı Bakıda «Şəhidlər Xiyabanı»ndadır. Onun adı doğulduğu Tərtər rayonunda da əbədiləşdirilmişdir. Şəhərimizin veteranlar bağında Vəzirin büstü qoyulmuşdur. Xatirəsi isə döyüş dostlarının, onu tanıyanların və bütün Azərbaycan xalqının qəlbində yaşayır. Onun həyatı bu günkü əsgərlərimiz üçün bir örnəkdir. Çünki, Vəzir Orucov hər birimizin fəxr etdiyi əfsanəvi qəhrəmandır.

Özündən sonra Camal adlı bir oğlu və yaddaşlardan silinməyən xatirələri yaşayır.

**2008-ci il.**

# MƏNALI ÖLÜM

***Mehrac Məhəmməd oğlu Mahmudov 1958-ci il yanvarın 17-də Tərtər rayonunun Səhlabad kəndində anadan olub. 1975-ci ildə həmin kəndin orta məktəbini bitirib. 1977-1979-cu illərdə Sovet Ordusu sıralarında Xaborovski şəhərində hərbi xidmətdə olub. Moskvada Yüngül Sənaye İnstitutunun mühəndis-texnoloq fakültəsini bitirib. 1980-ci ildə sərbəst güləş üzrə «Usta» normasını yerinə yetirib. Hələ uşaq yaşlarından öz qorxmazlığı və cəsurluğu ilə digər tay-tuşlarından seçilib. Onun cəngavərliyi müharibənin ilk günlərindən özünü biruzə verdi. Mənfur ermənilərin vətənimizə qarşı ilk təcavüzləri başlayanda Mehrac döyüşə gedən ilk könüllülərdən oldu.***

***O, 1992-ci ilin əvvəllərindən 1994-cü ilin aprel ayının 23-nə qədər Qarabağ Müharibəsində iştirak edib.***

***Üç övladı var – Ziya, Xəyalə, Aygün.***

* * *

**Bu torpağı qibləgah san,**
**Öz elində ocaq ol, yan.**
**Vətənə qurban olmayan**
**Can nəyimə gərək mənim?**

Nə qədər ki, həyat var, ölümlə qolboyundur. İnsan doğulduğu andan başlayaraq ölümə doğru yol gedir. Yəni ölüm labüddür, qaçılmazdır. Elə bu baxımdan insan gərək həyatını mənalı yaşasın. Mənalı yaşamaq ömrü də, ölümü də dəyərli edir. Mənasız yaşamaq isə ölümdən də betərdir.

Hər kəsə mənalı ömür və mənalı ölüm qismət olsun! Amin!

… Qarşımda xeyli sənəd, qəzet və şeirlər var. Onları vərəqləməmişdən əvvəl Mehrac Mahmudovun döyüş yoldaşlarının onun haqqında danışdıqlarını yadıma saldım. O vaxt «Tərtər» Batalyonunun qərargah rəisi olmuş Pənah Məmmədovdan, «Azərbaycan Bayrağı» ordenli Nizami Heydərovdan, Qarabağ Müharibəsi Əlilləri, Veteranları və Şəhid Ailələri İctimai Birliyi Tərtər Rayon Şöbəsinin sədri Suliddin Yusibovdan və onlarla



digər silahdaşından Mehracın necə qorxmaz, igid və cəngavər bir oğul olduğu, ermənilərə necə qan uddurduğu barədə dəfələrlə eşitmişdim. O, həm də bacarıqlı bir komandir kimi özünü tanıtmışdı.

Savaş vaxtı döyüşçü yalnız öz canını qoruyur, komandir isə həm öz canının qayğısına qalır, həm də döyüşçülərinin taleyinin və vuruşmanın məsuliyyətini daşıyır. Çox çətin işdir!

Mehracın Azərbaycanın Milli Qəhrəmanları, öz həmyerliləri, əvəzedilməz oğullar Vəzir Orucovla və Elman Hüseynovla çiyin-çiyinə gərgin döyüşlərdə iştirak etdiyi və sücaətlər göstərdiyi də mənə məlum idi.

… Qəzetlərə baxıram.

«… Mehrac müharibənin başlandığı ilk günlərdən Tərtərdə təzəcə yaradılmış könüllülər batalyonuna yazıldı. 1992-ci ildə Azərbaycan Ordusunun hücumları dövründə o, Marağaya, Marquşevana, Ağdərəyə ilk daxil olan döyüşçülərdən biriydi. Mehrac Vəng kəndinə kimi ağır və şərəfli döyüş yolu keçmişdi. Dəfələrlə yaralanmasına baxmayaraq, heç vaxt döyüş yoldaşlarını səngərdə tək qoymamışdı. Lakin axırıncı dəfə minaya düşməsi onu bir müddət dostlarından ayırmışdı.

2 aprel 1993-cü ildə Mehrac «Tərtər» Özünümüdafiə Batalyonuna «vzvod» komandiri təyin edilmiş və oktyabra qədər həmin batalyonda vuruşmuşdu.

1993-cü ilin oktyabrında könüllülərdən ibarət batalyon yaradılır və o, Ağdam bölgəsinə göndərilir…»

***«Alyans qəzeti»,***
***22 oktyabr, 1994-cü il.***

«Müharibə… Qanlı döyüşlər və hər döyüşdə qəhramancasına həlak olan igid oğullar…

Bütün bu hadisələr gözlərimiz qarşısında baş verir. Sabah isə qanı torpağa hopan, öz qorxmazlığı ilə möcüzələr yaradan neçə-neçə igidin adı tarixin daş səhifələrinə köçürüləcək.

Belə cəsur döyüşçülərimizdən biri də Mehrac Məhəmməd oğlu Mahmudovdur.

O müharibə başladığı vaxtdan döyüşə atılıb. Könüllülərdən ibarət dəstələr düzəldib, gecələr isə soyuq səngərlərdə yatıb.

Tez bir zamanda igidliyi hər tərəfə yayılıb.

Xocalı hadisələrindən sonra onun düşmənə olan nifrəti daha da gücləndi. Neçə ermənini girov götürüb öz əsirlərimizlə dəyişdirdi.

…Marquşevan kəndi istiqamətində güclü döyüş gedirdi. Mehrac hamıdan öndə idi. Güllə yağış kimi yağırdı. İrəlidə gedən tankımızı vurmuşdular. Lakin yağan güllələr heyətin içəridən çıxmasına imkan vermirdi, tank isə yanırdı. Mehrac döyüşə-döyüşə tanka yaxınlaşdı və bir gözqırpımında tankın içərisindəki yaralı döyüşçünü xilas etdi. Bunu o qədər cəldliklə yerinə yetirdi ki, sanki düşmən də bu hərəkətdən çaş-baş qaldı.

… Mehrac Mahmudov Ağdərə ərazisindəki Akop Kamari, Çardaqlı, Malakanlar kəndləri uğrunda gedən döyüşlərdə fəal iştirak etmiş, düşmənin bir neçə zirehli texnikasını və canlı qüvvəsini şəxsən məhv etmişdi…»

***«Yeni dünya» qəzeti,***
***8 oktyabr 1994-cü il.***

«1993-cü il dekabrın 27-də xəbər gəlir ki, azğın düşmən Papravənd, Boyəhmədli, Qarapirim istiqamətindən 17 tank və 500-ə yaxın canlı qüvvə ilə Güllücəyə genişmiqyaslı hücuma keçib.

Əməliyyat planını hazırlamaq Mehraca həvalə olunur.

Bu döyüş çox uğurla başa çatır, qarı düşmən 7 tank, 350-yə yaxın canlı qüvvə itirərək geri çəkilməyə məcbur olur».

***«Zaman» qəzeti,***
***15 oktyabr 1994-cü il.***

«Mehrac Məhəmməd oğlu Mahmudov ali təhsilini Moskvada alıb. 1988-ci ildə Vətənə qayıdaraq torpaqlarımızın müdafiəsində iştirak edib. Əvvəlcə Tərtər bölgəsində döyüşüb, 1993-cü ilin sonunda isə Ağdama göndərilib.

Sıravi döyüşçüdən batalyon komandirliyinə kimi yüksəlib.



Bütün döyüşlərdə öndə gedən komandir əsgərlərə ən böyük mənəvi dayaq idi. Hər günü bir qəhrəmanlıq dastanı olan Mehracın özünü reklam etdirməkdən zəhləsi gedirdi…».

***«Müxalifət» qəzeti,***
***28 iyun 1994-cü il.***

«Mehrac zabit olsa da özünü sıravi əsgər kimi aparırdı. Ən ağır işlərə özü gedirdi.

… Dekabrın 31-də ermənilərin növbəti hücumu zamanı Mehrac əlində pulemyot («PK») ayaq üstə dayanmışdı, yerə də yatmırdı; qoy onun əsgərləri görsünlər ki, batalyon komandirinin müavini hamıdan qabaqda durub, özü də səngərdən çıxıb. Onda üç batalyondan cəmisi 45 əsgər qalmışdı.

Ermənin 7 texnikası məhv oldu, nə qədər canlı qüvvəsi getdi.

… Bir dəfə də döyüşqabağı elə-belə söhbət eləyirdi. Dedi ki, ağlıma bir şey gəlib, mən güllədən ölməyəcəyəm. Allaha and olsun, məni öldürsə, qəlpə öldürəcək. Yaman böyrümə-başıma qəlpə düşür son vaxtlar».

***«Varlığımız» qəzeti,***
***İyun 1994-cü il.***

Mehrac Ağdam bölgəsində batalyon komandirinin müavini kimi döyüşə başlayanda bədənində 18 qəlpə var idi. O, bu vəziyyətdə Ağdamın Papravənd, Sofulu, Boyəhmədli kəndləri uğrunda aparılan döyüşlərdə fəal iştirak edirdi.

Ölümündən bir neçə gün əvvəl iki nəfər döyüşçü yoldaşı ilə kəşfiyyata gedən Mehrac üzüm bağının içində qəfildən ermənilərlə rastlaşır. Onun əlində «PK» pulemyotu, çiynində isə qumbaraatan varmış. Ermənilər çox olsalar da, Mehrac qumbaraatanla onlardan 8-ni öldürür, 5-ni isə yaralayır. Yaralı erməniləri batalyona gətirir.

Güllücə istiqamətində gedən sonrakı döyüşlərdə də Mehracın komandanlıq etdiyi qüvvələr düşmənə dalbadal ağır zərbələr vurur. Ermənilər bir döyüşdə 1 tank, 1 «PDM» və onlarla canlı qüv-

qüvvə itirir. İkinci dəfə isə Kamo adlı polkovnik və bir erməni mayoru «UAZ» markalı maşında əsir götürülür. «UAZ»-da olan Yaponiya istehsalı radioqəbuledici və 1 ədəd «AK-74» markalı avtomat da qənimət kimi ələ keçirilir. Mehrac özü bu əməliyyatda 8 erməni öldürür.

1994-cü il aprelin 23-də batalyon komandiri Salam Sadıxovu yeni vəzifəyə, Mehracı isə onun yerinə təyin edirlər. Həmin günü Mehrac evlərinə gedir. O, evdə hamıyla görüşür. Qayıdarkən bacısına deyir:

– Bajı, birdən mən ölüb-eləyəsi olsam, qəbrimin üstündə avtomat atarsan.

Bacısı nəsə demək istəyəndə Mehrac ötkəm səslə onun sözünü kəsir:

– Əgər, qəbrimin üstə avtomat atmasan, mənim bajım döyülsən!

… Hissəyə qayıdır. Saat 17-də İlxıçılar kəndi uğrunda qanlı döyüş başlayır. Mehracın batalyonunda cəmi 100-120 döyüşçü qalmışdı. Onlar hücuma keçirlər. Ermənilərin əlverişli mövqe tutması bizimkilərin vəziyyətini ağırlaşdırırdı. Mehrac heç bir dəlil-dəlalətə fikir vermədən yenə ayaq üstə öndə gedir, əsgərlərini döyüşə ruhlandırırdı.

Ermənilərin «BMP»-si deyəsən komandirin istiqamətini müəyyən etmişdi, həmin əraziyə elə hey mərmi yağdırırdı. Mehrac isə heç nədən çəkinmədən irəliləyirdi. Birdən … lap yanında bir mərmi partladı. «AQS»-nin iki qəlpəsi sağ qolunun altından zirehli geyimi deşib bədəninə girdi. Yavaş-yavaş yerə çökdü və yıxıldı. Heç bir söz demədən gözləri üfüqə dikili qaldı…

Adətən insan ölən kimi bədəni soyuyur, qan laxtalanır. Mehracın qanı laxtalanmadı, axırıncı damlasınacan axdı. Bu da Allahın işidi. Axı, Mehrac deyirdi, «Son damla qanıma qədər vuruşacağam!» Allah-təala da onun əhdini yerdə qoymadı. Mehracın bir əhdi də yerinə yetirildi – ömründə əlinə silah almayan bacısı ağlaya-ağlaya onun qəbrinin üstündə güllə atdı.

… Yurdunu, torpağını necə sevdiyi haqqında deyə bilmədiyi sözləri öz ölümü ilə, Vətən qarşısında verdiyi borcla dedi Mehrac.



Şərəfli bir döyüş yolu keçən Mehrac Mahmudov bütün varlığı ilə öz elinə, obasına və vətən torpağına bağlı, secilən oğul idi. Elə ona görə də o, qəhramanlığın zirvəsinə ucala bildi və onu tanıyan, igidliyi barədə eşidən hər kəsin qəlbində özünə layiq bir qəhrəman obrazı yarada bildi Mehrac. Bu gün Mehrac Mahmudova rəsmi olaraq Milli Qəhrəman adı verilməsə də o, bizlərin yaddaşında əsl Milli Oəhrəmandır. Çünki, Mehrac keçirdiyi hər döyüşü ilə, cəsarəti, cəsurluğu, mərdliyi, düşmənə nifrəti və vətənə sonsuz sevgisi ilə qəhrəman adını doğruldub. Müxtəlif markalı ağır silahlardan istifadə edərək həmişə əsgərlərindən öndə, ayaq üstə, qorxmadan düşmənlərə qan udduran Mehrac əbədi olaraq milyonların qəlbinə köçüb, Vəzir Orucov, Elman Hüseynov, Ədalət Paşayev və öz qəhrəmanlıqları ilə şəhidlik zirvəsinə ucalan digər oğullar kimi. O, Vətəni müdafiə etməyi özünə övladlıq borcu saydı. «Kişinin qanı torpağa axar» – dedi. Şəhid olmağı ən dəyərli ölüm bildi. Bunların əvəzində isə heç nə ummadı. Döyüşdüyü hərbi hissə onun Milli Qəhrəman adına layiq görülməsi haqqında Müdafiə Nazirliyinə təqdimat göndərdi. Mehrac Mahmudovun bundan heç xəbəri də olmadı.

Yenə müharibə dövrünün mətbuat səhifələrini vərəqləyirəm. «Bakı», «Ana Vətən», «Ədalət», «7 gün», «Azadlıq», «İslamın səsi», «Səda», «Tərtər»… qəzetlərində Mehrac Məhəmməd oğlu Mahmudovla bağlı yazıları nəzərdən keçirirəm. Bu insan oğlunun igidliyinə heyrətlənirəm, ölümdən qorxmazlığına təəccüb edirəm. Və istər-istəməz bir sual dondurur məni: «Mehrac kimi oğulları olan Qarabağ niyə basıldı görəsən?!».

**"Ya hər şeyi olduğu kimi yazmaq lazımdır, ya da yazmamaq daha yaxşıdır".**



# «OBA» Könüllü İctimai Xeyriyyə Təşkilatının sədri X. Rzazadəyə

## AÇIQ MƏKTUB

Doğma «Salam»ımızı işıqlı dünya üzünə gətirən, ona həyat verən əziz «Oba»mızın çox hörmətli və möhtərəm rəhbərinə Tər-tər bölgəsindən bir qucaq səmimi ətirli salam çələngi yetirməyi özümə şərəf bilirəm.

«Salam»ın kəndçi müxbirlərinə sentyabrın 17-də göndərdiyiniz və düz 17 gündən sonra gəlib ünvanına çatan gözəl namənizin bir nüsxəsini də mən aldım və bizlərlə dostcasına söhbətinizə görə Sizdən dağlar qədər razı qaldım. Amma…(Bu amma haqqında bir az sonra). Razı qaldım ona görə ki, şəxsən mən işlədiyim uzun illər ərzində yuxarıdan aldığım, açığını deyim, zəndi-zəhləm getdiyi quru və rəsmi məktublardan deyildi bu. Düzdür, köşklərə görə bizə bir az hədə-qorxu da gəlmisiniz, taki canınız sağ olsun, onsuz da ömrümüz boyu belə hədə-qorxular başımızın üstündən əskik olmayıb və buna görə də, xətrinizə dəyməsin, şeflə («Salam»ın baş redaktoru Bahadur bəylə) birləşib bizi hədələməyiniz mənim kimilərin halına az təfavüt eləyir.

Razı qaldım ona görə ki, Sizin təşəbbüsünüzlə hər ay bizim jurnalistlik fəaliyyətimizə qiymət veriləcək (yekun vurulacaq). Bu cümlənizi oxuyanda ürəyimdən bir arzu keçdi: «Kaş mənim fəaliyyətimə qiymət verərkən Allah-təala ürəyinizə elə bir mərhəmət hissi salaydı ki, hər ayın yekununda belə bir bərabərlik formulu alınaydı: «Göndərildi» - «Qəbul olundu» - «İmzalandı» - «Nəşr olundu».

Ümumiyyətlə, namənizdə vacib və xoşa gələn (həm də xoşa gəlməyən) məsələlər çoxdur və bunlardan uzun-uzadı danışıb başınızı ağrıtmaq istəmirəm, qayıdıram sözümün əvvəlindəki «amma»ya.

Aydındır ki, müəllim gərək yaxşı dərs deyə, çoban gərək yaxşı sürü saxlaya, jurnalist də gərək, Sizin dediyiniz kimi, ekstra yazılar – yəni yaxşıların yaxşısını yaza. Amma… Sizi bilmirəm,

bu, mənim işim deyil. Yaxşıların yaxşısını yaza bilsəydim elə gəlib oturardım şefin yerində, olardım baş redaktor, ya da heç olmasa ən azı onun birinci müavini (Teymur Ləng müəllimin qulağına çatmasın), daha bir xırda rayonun bir xırda müxbiri işləməzdim. Bəlkə səhv deyirəm? Ona görə də məndən ömründə elə yazılar gözləməyin. Onsuz da işə götürəndə sınaq müddəti vermisiniz, hələ tamam olmayıb, istəmirsiniz, çıxarın işdən.

Super yazılar istəməyiniz bir yana, görün Siz bizdən hələ nələr tələb edirsiniz – ümumdünya, ümumtürk, ümumislam… xarakterli yazılar, nə bilim, orijinal, sensasiya xarakterli məlumatlar. Yox, daha bu lap ağ oldu! Elə açığını mənə deyin ki, çıx get otur evində və başla həmişəki kimi evdarlıq işlərində arvadına kömək eləməyə. Bir balaca məktubda bu qədər tələblər olar?! Abunə elə gəldi, material belə getdi, səhifələr harda qaldı, informasiyalar, rubrikalar, konkurslar, reklamlar neçə oldu? Vallah, bunları oxuyanda başım şişib Sabirabad qarpızına döndü. Məni işə götürəndə elə bilirdim ki, mən də bəzi qəzetlərin müxbirləri kimi ağlıma nə gəlsə yazacağam, Siz də dərc eləyəcəksiniz. Nə biləydim ki, məni cəncələ salacaqsınız?

Yazırsınız ki, sizdə olan materiallar, ümumiyyətlə, zəifdir…

Özgəsində nöqsan görməyə nə var ki? Elə lap mənim özüm, Sizin bu məktubda o qədər qüsurlar tapmışam ki! Bilirəm, deyəcəksiniz ki, faktlarla danışım. Baş üstə. Məsələn, **birinci** vəd verirsiniz ki, 1992-ci ildə redaksiyanı və müxbir məntəqələrini rabitə vasitələri və avtonəqliyyatla təmin edəcəksiniz (səh.1, maddə 4). Rabitə vasitələrini demirəm, amma Vallah, ağlım bu nəqliyyat vasitələrindən bir şey kəsmir.

**İkinci:** Yazırsınız ki, istərdim hamınız «Oba»nın üzvü olasınız (səh.2), Lap yaxşı! Mən günü bu gün «Oba»nın üzvü olmaq istəyirəm. Amma necə? Məktubda bu sualın cavabı yoxdur.

**Üçüncü:** Abunə bəndində (3) qeyd etmişsiniz ki, kommersiya redaksiyası abunənin əlavə variantlarını hazırlayıb.

Soruşmaq ayıb olmasın, bəs hanı?

**Dördüncü:** Məktubun sonuncu bəndində (4) soruşursunuz ki, müxbir məntəqələrinin vəziyyəti necədir? Nə lazımdır?



Bu iki sualdan birincisinə cavab verməyə hələ ki, tələsmək istəmirəm, çünki yaxşılığa doğru nəsə olasıdır! (vəd verirlər). İkinci suala isə konkret cavab verirəm: – Çox şey! Camaata indi ən çox nə lazımdır, onlardan – ət, yağ, qənd, düyü, pal-paltar, bazarda utanmamaq üçün çoxlu pul… varınızdımı?

**Beşinci:** Məktubunuzda yazsanız da, redaksiyanın strukturunu və «Salam»ın bütün müxbirlərinin telefon nömrələrini göndərməyi unutmusunuz.

Görürsünüzmü, bir məktubda nə qədər xətalara yol verilib?

Məktubumun sonunda nəzərinizə çatdırmaq istəyirəm ki, sizdən «Kommunist» qəzetinə şikayət yazacağam. Yazacağam ki, bəzi rəhbər şəxslər öz vəzifələrindən sui-istifadə edərək, bizimlə köhnə amirlik metodları ilə işləyirlər, bacarmadığımız işləri bizdən tələb edirlər.

Bu fikirləri Tərtərdə bu günlərdə təşkil edəcəyim mitinqdə də açıq-aşkar və təntənəli şəkildə söyləyəcəyəm!

***Demokratiyadır deyə lap adımı da göstərirəm:***
***Tofiq Yusif.***
***Bu məktubu yazana qədər «Salam»ın Tərtər müxbiri idi.***

***R. S. Azər Əliyevdən xahiş edirəm ki, təziqə-zada baxmayıb, bu məktubu «Salam»ın növbəti nömrəsi üçün təcili yığsın.***

**17. 10. 1991-ci il.**

# Azərbaycan Respublikasının keçmiş və indiki başçılarına

## AÇIQ MƏKTUB

Son günlər respublikamızın radiosu da, televiziyası da, qəzet-jurnalı da, səlahiyyəti olanlar da, olmayanlar da eyni bir fikri tutuquşu kimi təkrar edirlər: «Hazırda bizim ən böyük dərdimiz Qarabağ dərdidir. İndi heç bir qarşıdurmaya yol vermək olmaz! Mənsəbindən, əqidəsindən, cibindən asılı olmayaraq hamımız birləşib, Qarabağ problemini həll etməliyik. Sonra o biri məsələlərə baxarıq».

Bir azərbaycanlı kimi mən də şəxsən bu fikirdəyəm. Amma həmin çağırışlarla bağlı bir çox qaranlıq sualları aydınlaşdıra bilmirəm. Məsələn, mənə hələ də kölgəlidir ki, biz kiminlə birləşməliyik və kimləri birləşməyə çağırırıq? Əgər söhbət xalqdan gedirsə, o, tarixən vahid olub, vahid olaraq da qalır (baxmayaraq ki, ərazisi bölük-bölük olub). Buna görə də xalqı birləşmək üçün çağırmağa ehtiyac yoxdur. Bəlkə çağırırıq ki, prezident aparatı ilə hökumət birləşsin? Və yaxud hər ikisi ilə müxalifət? (Bir başıbəlalı xalqın neçə başçısı olar axı?). Birləşsinlər də. Məgər onlara xalq mane olur ki, müraciəti xalqa edirlər? Biz – qara camaat ümidimizi siz başçılara bağlamışıq, sizsə… Bu yerdə yadıma hamımızın çox gözəl bildiyimiz Nizaminin «Ənuşirəvan və bayquşların söhbəti» alleqoriyası düşdü.

Açıq məktubu ona görə yazıram ki, düşündüyümü, mənim başıma açdığınız oyunlardan yenə lap yüzünü açsanız da, açıq deyim. Xalqın belə ağlar günlərə düşməsinin əsas baisi sizsiniz. Xalqa aydındır ki, siz olmasaydınız Qarabağ məsələsi vaxtında və çox asanlıqla həll ediləcək idi. 200 min nəfərdən çox soydaşlarımızı öz dədə-baba yurdlarından qovalayan ermənilərdən bir neçəsinin öz ərizələri ilə işdən çıxmaları üstündə o boyda Respublika Statistika Komitəsinin sədrini, neçə-neçə belə yetişmiş



kadrları hörmətdən salıb, vəzifələrindən qovaladınız. Ermənilərin yenidən Bakıya qayıtmalarına görə xalqdan muştuluq istədiniz. Onlar haqqında güldən ağır söz danışanları qazamatlara saldırdınız! İndi xalqı birliyə çağıranların əksəriyyəti o adamlardır ki, camaatın dərisini soyub tayfalara bölüblər, birinin əlilə o birisinin boğazına kəndir keçiriblər.

Siz nə vaxt kürsü davasından əl çəkib birləşdiniz və xalqa dediniz ki, gəlin bu yolla gedək, xalq getmədi? Biriniz dediniz dözün, gözləyin, hələ vaxtı deyil (halbuki əsl vaxtı idi), xalq da bütün zillətlərə, qırğınlara, axıdılan qanlara, aclığa, susuzluğa, çılpaqlığa dözüb gözlədi və hələ də torpağını, evini, eşiyini, hətta balasını da qurban verə-verə gözləyir. Biriniz dediniz çıxın meydanlara, küçələrə, xalq da əliyalın, sinəsi açıq tankların, topların qabağına çıxdı, meydanlara, küçələrə axışdı. Biriniz də o tərəfdən ermənini, rusu çağırıb dediniz ki, qırın bunları, xalq tırtılların altında qalıb xıncım-xıncım oldu, güllələrlə sinələri parça-parça edildi. Biriniz dediniz qorxmayın, gedin düşmənin üstünə, dalınızca gəlirik, xalq da getdi, bilmədi ki, qəsdən qurduğunuz ölüm tələsinə düşəcək, amma düşdü, qayıdıb geri baxanda gördü ki, arxasınca gəlməyiniz o yana, götürülüb geri qaçmısınız – düz Bakıya qədər. Hələ də xalq o qırğın meydanından öz oğullarının meyidlərini gətirə bilmir.

Malıbəyli, Quşçular, Umudlu, Meşəli, Cəmilli, Qaradağlı, Tuğ, Xocavənd, Kərəmli… Onlarla belə kəndlərimiz, bölgələrimiz haray saldılar ki, erməni quldurları bizi qıracaq, torpaqlarımızı zəbt edəcəklər, qulaq ardına vurdunuz, fəryadları eşitdiniz, amma məhəl qoymadınız, xalqı yalan vədlərlə aldadıb, güdaza verdiniz. Xocalının aylardan bəri kömək diləyən naləsini Amerika eşitdi, Avropa eşitdi, Afrika eşitdi, hətta Antraktida da eşitdi, Allaha da çatdı bu nalə, amma sizə çatmadı. Elə bil xalqın qanına susamışdınız, dinmədiniz, lal oldunuz! İndi də neçə aydır ki, Şuşa haray çəkir, Şuşa əldən gedir, tarmar olur, tariximizə od vurub yandırırlar, yenə də vecinizə almırsınız. Ağdamın da səsi yavaş-yavaş eşidilir. Allah o gündən saxlasın ki!.. Bəs deyilmi xalqın taleyilə oynamağınız?! Xalq daha tıncıxıb, təngiyib, zinhara gəlib, fəlakətlər onun belini büküb, dizlərinin taqətdən salıb,

heysizləşdirib. O qədər heysizləşib ki, gözünü dünyaya təzə açan, yağı düşmənin gülləsi və süngüsü ilə ciyəri, ürəyi, beyni parçalanmış, soyuqda qalıb donmuş körpəsinin cəsədini qucağına alıb, yağılardan uzaqlaşmağa gücü çatmır.

İndi də başlamısınız ki, bu qırğını siyasi yolla həll edəcəyik. Guya neçə vaxtdır ki, «siyasət» yolu ilə gedib, xalqı aldada-aldada ağlar günlərə qoyan siz deyilsiniz.

Sizləri xalq ona görə özünə başçı seçib ki, müsibətli günlərdə ona nicat yolu göstərəsiniz. Qarabağ məsələsini hansı yolla həll eləyirsiniz eləyin, amma qurtarın xalqı bu əzabdan. Bir də axı Bakıda otura-otura Qarabağın dərdinə necə yanmaq olar? Siz də bu xalqın övladlarısınız axı, hamınız yığışın, məsləhət-məşvərət eləyin, əl çəkin vəzifə, mal-dövlət hərisliyindən, gəlin heç olmasa Ağdama (indi ora nisbətən sakitlikdir), götürüb binoklu tutun gözlərinizə, baxın Xocalıya, Şuşaya, Malıbəyliyə, Quşçulara… Görün Qarabağı ermənilər nə günə qoyublar. Bəlkə ürəyinizə bundan sonra təpər dola, bu bədbəxt xalqa bir gün ağlayasınız!..

**«Salam» qəzeti,**
**1992-ci il.**



**Kimin xətrinə dəysə, su içsin**

## «Salam» qəzetinin redaksiyasına

### AÇIQ MƏKTUB

Hörmətli baş redaktorumuz Bahadur bəy və «Salam»ın hörmətli redaksiya heyətinin üzvləri, salam.

Çox-çox üzr istəyirəm ki, respublikamızda yaranmış hərki-hərkinəlikdən, yəni dərəbəylikdən, özbaşınalıqdan, yiyəsizlikdən hamı kimi mən də istifadə edib, bu məktubumla üzünüzə ağ oluram. 3-4 il əvvəl aşağıda bardaş qurub palaz üzərində oturan mənim kimi yazığın ağzı nəydi ki, özündən yuxarıda oturan möhür sahiblərinin üzlərinə qayıdaydı, onlara nöqsan tutaydı, bir sözlərini iki eləyəydi, o dəqiqə canını alardılar, gözlərinə ağ salardılar, ən azı isə şələ-şüləsilə birlikdə dədəsini belinə yükləyib, dalından da bir təpik ilişdirərdilər və deyərdilər: «Get, bala, get, sən qudurmusan, böyüyün üzünə ağ olursan!». İndi isə… Kim kimədir ki?

Sözümün «Məmmədqulusu» odur ki, çörəyini yediyimiz bu «Salam» qəzetinə niyə camaat keçən il nəzərdə tutulduğundan az abunə yazıldı? Bu sualın iki cavabı var ki, birini mən bilirəm. Ona görə ki, «Salam» gözünü işığa təzəcə açmışdı, ya açmamışdı abunə yazılışı başladı və camaat da onu əməlli-başlı tanımırdı. Həm də çayır kimi törəyib artan qəzet-jurnalların içərisində başlar şişmişdi. Sualın ikinci cavabı isə…

Digər sualım ondan ibarətdir ki, niyə Tərtərdə, məsələn, «Azadlıq», «7 gün», «Müxalifət» və s. və b. k. qəzetlərə olan maraq bizim «Salam»a yoxdur? Bu sualın da bir cavabını mən bilirəm, yəni camaat onlardan qorxur». Sualın ikinci cavabı isə…

… Bir dəfə işlədiyi qəzetin vəziyyətini soruşduqda jurnalist dostlarımdan biri mənə dedi ki, bilirsən, qardaş, 3-4 gün çalışıb vuruşuruq, yazıb-pozuruq və nəhayət, qəzetimizi dərc eləyirik. Axşam çıxıb gedirik evimizə, qoltuğumuzda da o qəzetdən biri. Evdə açıb vərəqləyirik ki, görək bu 3-4 günlük əziyyətimizin qarşısında nə yazmışıq, nə pozmuşuq, camaata nə deyə bilmişik. Ha vərəqləri o üzə bu üzə çeviririk, görürük ki, heç nə yazmamışıq.

Gözümüz görə-görə bəzi qəzetlər əl-əl gəzir, onları oxucular az qala yerdə də, göydə də axtarıb tapırlar. Amma bəzi qəzetləri köşklərdə toz basır, ya onlar nəyisə bükməyə gərək olur, ya da haçansa alverçilərə pomidor yeşiklərinin içinə sərmək üçün lazım gəlir. (Əlbəttə bunlar «Salam»a aid deyil). Niyə? Hamımıza bəllidir ki, zamanın nəbzini tutan, xalqın ürək ağrısından, dərdi-sərindən xəbər verən, onun övladlarının belə bədbəxt günlərə düşmə səbəblərini açıb göstərən, rəhbərlərimizdən tutmuş ta bizim kimi fərsizlərə qədər hamının eybini üzünə deməkdən çəkinməyən qəzet-jurnallara oxucuların ehtiramı daha çoxdur. Düzdür, «Salam»da da belə yazılar xeyli dərc edilib və bunlar qəzetin yerlərdə hörmətini qaldırıb. Lakin ara-sıra səhifələrdə pis üzünü göstərən duzsuz materiallar işimizi korlayır, onsuz da gözünü işığa açandan bəri başıbəlalı olan «Salam»a biryolluq «əleyküm əs-salam» demək şübhəsi yaradır.

Şəxsən mənə zəif görünən yazılar kiməsə maraqlı yazılar kimi görünə bilər və mənim öz yazılarım da, oxucular deyir ki, bir fərli şey deyil. Lakin indi hər kəs öz fikrini deməkdə sərbəstdir və mənim də bacarığım bu qədərdir.

Xanım Rzazadənin çox gözəl bir şakəri var idi – «Salam»a göndərilən materialların redaksiya heyəti tərəfindən necə qarşılandığını hər ay yekunlaşdırıb, bizə xəbər verirdi. Niyə bu unuduldu?

Bilirəm, indi gözləyirsiniz ki, şəxsən mənim duzsuz hesab elədiyim materialların və onların müəlliflərinin adlarını çəkəcəyəm. Yoxsa bu uzunluqda «qara nağıla» nə ehtiyac var idi ki, oxucuların da, sizin də zəhlənizi töküb, baş-beyninizi aparırdım? Bunları bilə-bilə heç bir ad çəkmək fikrim yoxdur. Çünki bəşər tarixində dahi bildiyimiz qeyri-adi istedad sahiblərinin də zəif cəhətləri olmuşdur. Bir tərəfdən də belə hesab edirəm ki, haqqnda söhbət açmaq istədiyim yazılar onların müəlliflərinin güclü və gözəl yazılarının içərisində təsadüfi və həm də tələsik yazılmış yazılardır, siz də bilərəkdən onların dərcinə razılıq vermisiniz ki, bir də belə yazmasınlar. Digər tərəfdən isə üzgörənlik edirəm, yəni  həmkarlarımın xətrinə dəymək istəmirəm. Lakin adımdan sonra tərs şapalaq kimi bir «liberal» sözünü mütləq işlədəcəyinizi bildiyimdən həmin ifadəni bir az yumşaltmaq üçün bəzi yazıların (müəlliflərin yox) adlarını çəkməyə məcburam: «Niyə belə qəmlisən, redaktor dostum?».(Oktyabr 1991, №7). «Dövlət Statistika Komitəsinin fantaziyasına qibtə edirəm» (yenə orada). «Sözlərimizi axtarırıq» (5-11; 12-19 fevral 1992, №6, №7). «Qorbaçovun aqibəti» (5-11 fevral 1992, №6). «Çapar»dakı bəzi informasiyalar və s.

Onu da əlavə etmək istəyirəm ki, çox vaxt mənim kimi naşı müəlliflər öz məhsullarının eybəcərliklərini görə bilmirlər. Bəs redaksiya heyəti?

Mənə necə qiymət verəcəyinizi bilmirəm, amma bu məktubu yazmaqda özümü haqlı sayıram. Çünki «Salam»ın, onun gözəl kollektivinin bu günü və sabahı məni çox düşündürür.

**«Salam» qəzeti,**
**3 mart 1992-ci il.**

## «20 yanvar» qəzetinin redaksiyasına

Qəzetinizin 26 mart 1992-ci il tarixli 12-ci sayının 2-ci səhifəsində Nadir Mirələkbəroğlunun «Tərtər döyüşçüləri» adlı yazısının məqsədi mahiyyətcə təqdirəlayiqdir. Hazırda Qarabağımızda gedən təcavüzkar müharibədə doğma və ulu torpaqlarımıza öz qızıl qanları ilə «Qələbə!» sözünün başlanğıcını yazan igid oğul və qızlarımızın hər birindən ayrıca bir dastan da yazsaq azdır. Bu nöqteyi-nəzərdən məqalənin müəllifinə minnətdarıq. Lakin yadınızdadırsa erməni quldurları tərəfindən göydə vurulmuş vertalyotda neçə-neçə qeyrətli oğullarımızın faciəli ölümünü əvvəlcədən düşünülmüş terrorçuluq aktı kimi deyil, sadəcə olaraq «dumana düşüb təpəyə toxunmaq» yozumu və Xocalı dəhşətinin sabahısı günü cəmi 2 nəfərin ölümünü xəbər verən mətbuatın səbatsız mövqeyi xalqımızı necə pis vəziyyətdə qoydu! Heç olmasa bundan sonra müharibədən yazmaq istəyən hər bir kütləvi informasiya vasitəsi və yaxud hər bir əməkdaş özündə dərin məsuliyyət hiss etməli, bütün faktları əsaslı surətdə yoxladıqdan sonra oxucu auditoriyasına çıxarmalı idi. Əfsuslar olsun ki, həmkarım Nadir Mirələkbəroğlu belə acı həqiqətlərdən düzgün nəticə çıxarmamışdır. (Biz müxbirlər çox vaxt unuduruq ki, real faktlara əsaslanmayan belə yazılarımızı düşmən tərəf necə səbirsizliklə gözləyir!).

Adıgedən yazıda Nadir Mirələkbəroğlu göstərir ki, «…18-i gecəsi Ağdərə rayonu ərazisindən Tərtər şəhərinə yağdırılan alazan raketlərinin təsirindən Tərtər şəhərinin bir məhəlləsinə dəyən ziyan: redaksiya binasının və bir yaşayış evinin tamam dağıdılması barədə artıq mətbuat, radio və televiziya xəbər vermişdir».

Qardaş, belə ağ yalan kimin nəyinə gərəkdir ki? Nə üçün real vəziyyəti öyrənmədən, hadisələrdən xəbərsiz ola-ola bəlağətli sözlərinizlə xalqımızı bu ağır günlərdə aldadırsınız? Niyə müharibə şəraitində yaşayan soydaşlarımızın tarıma çəkilmiş əsəblərini oyuncağa çevirirsiniz? Axı, 18-i gecəsi Ağdərə rayonu ərazisindən Tərtər şəhərinə yağdırılan «Alazan» raketləri deyildi, partlayış yerlərindən tapılmış qalıqlar sübut etmişdir ki, onlar «Kristal» və «Qrad» tipli raketlərdi. (Görəsən Nadir Mirələkbəroğlu «Alazan»la «Kristal»ın, yaxud «Qrad» tipli raketin fərqini bilirmi?). Həm də həmin gecə bir ədəd də olsun raket «göydəcə vurulub» zərərsizləşdirilməmişdi. Niyə olmayan şeylərdən yazırsan, əzizim? Bu raket hücumu sizin yazdığınız kimi «Tərtər şəhərinin bir məhəlləsinə dəyən ziyan – redaksiya binasının və bir yaşayış evinin tamamilə dağıdılması»yla nəticələnməmişdi axı!

Həmin gecə saat 3 radələrində Tərtər şəhərinə ermənilərin atdıqları 40-a yaxın raket neçə-neçə dövlət obyektini, yaşayış evlərini tamamilə və qismən dağıtmış, Tərtərə milyon manatlarla ziyan vurmuş, 3 nəfərin ölümünə, 8 nəfərin yaralanmasına səbəb olmuşdur. Bu raketlər Elman İsmayılovun, Rəfael Əhmədovun, Hafiz Mirzəyevin, Elxan Əliyevin, Ənur Paşayevin, Sahib İbrahimovun şəxsi evlərini darmadağın edərək altını üstünə çevirmiş, Maarif Əliyevin, Vaqif Aslanovun, Bəkir Mustafayevin, Qulam İmanovun, Fəxrəddin Haqverdiyevin, Qəhrəman Məmmədovun, Nəsibə Sadıqovanın və neçə-neçə digər tərtərlinin evlərində sağ istahat qoymamış, şəhər 2 №-li orta məktəbinin, poliklinikanın, doğum evinin, 15 №-li tikinti sahəsinin, bir çox mağazaların, sizin yazdığınız redaksiyanın yerləşdikləri binaları, bir sıra küçələri, kommunikasiya xətlərini tamamilə və ya qismən dağıtmışdır. Şəhər sakini Siruş Əhmədovanın həyətinə düşən raket bayram süfrəsi üçün onun evində şəkərbura hazırlayan 20 yaşlı qardaşı qızı Zərifə Əhmədovanı və evi darmadağın olmuş Məxmər xanımı ağır yaralamış, raket qəlpələri Ənur Paşayevin 25 yaşlı oğlu Firdovsini həlak etmiş, Hafiz Mirzəyevin və onun həyat yoldaşı Şərafət xanımın, Elman Tağıyevin və anası Minarə Tağıyevanın qanını axıtmışdır. (Onlar indi də xəstəxanalarda yatırlar).

Nadir Mirələkbəroğlu heç bir həqiqətə əsaslanmayan yazısının əzizini itirmiş, evi-eşiyi darmadağın olmuş bu insanlara necə təsir etdiyini düşünürmü?

Deməyim odur ki, ya hər şeyi olduğu kimi yazmaq lazımdır, ya da yazmamaq daha yaxşıdır.

**«Salam» qəzeti,**
**1992-ci il.**

# YENƏ KƏNDİR MƏSƏLƏSİ

***Həmkarım Loğman İbrahimoğluna zarafatyana məktub***

Qağa, salam.

Birincisi, sən Allah, yazdığım məktub xətrinə dəyməsin. Bu ağır günlərdə bəlkə kiminsə dodağını qaçırmaq xoşbəxtliyinə nail olduq. İkincisi, zarafatdır da eləyirik. Üçüncüsü, işdi-şayət, əgər xətrinə dəysə, su içməyi unutma.

Mən ölüm, o nədir elə «Salam»ın təzə ildən başlayan ikinci sayında bir sicilləmə döşəmisən, ortada da heç nə yox? Özü də indi çox dəbdə olan təmtəraqlı bir «priyomla» – xalqın adından! Qardaş, qurtarın də bu yazıq, bu fağır, bu qara günlərə saldığınız xalqın adından hərzə-mərzə danışmağınızı! Axı, bu bədbəxt xalq sizə nə yamanlıq eləyib? Yedizdirib, içizdirib, geyizdirib, qulluğa mindirib, altınızı maşınlı, evlərinizi zımbıltılı, ciblərinizi pullu, arvadlarınızı qızıllı eləyib? Eləyib. Əmrinizə hələ də müntəzir dayanıb? Dayanıb. Daha nə istəyirsiniz? Niyə qoymursunuz indi də getsin saldığınız dərdi-bəlanın içərisində heç olmasa adam balası kimi ölsün, hə?

Bir rəhbər çıxır kürsüyə «mənim xalqım» deyir, ordan keçir ekrana «mənim xalqım» deyir, o yorulub əldən düşür, bu birisi gəlir «mənim xalqım» deyir, o gedir, nazir gəlir «mənim xalqım» deyir, nazir gedir müavini gəlir, müavin gedir, deputat gəlir… hamısı bu biçarə xalqın adından danışır, «mənim xalqım» deyir. Vallah, indi «upravdom» da, «zavkommunxoz» da, «naçalnik JEK» də öz işçilərini bir yana buyura bilməyəndə xalqın adından danışır. Xalq da qalıb ortalıqda, bilmir ki, kimindi. Bircə qalmışdın sən!..

Yaxşı, tutaq ki, bu xalq sizindi. Bəs onda niyə siz həm elə dolanırsınız, həm belə, xalq isə elə-delə? Və yaxud, tutaq ki, hamınız xalqın adından danışırsınız, əcəb eləyirsiniz, amma bəlkə biri soruşdu: «Görəsən sizin adınız nədi? Kimsiniz, nəçisiniz? Hardan gəlib, hara gedirsiniz?». Bəs onda?..



Elə məktubun bu yerində yadıma bir hadisə düşdü. O günü Tərtərin mərkəzi kolxoz bazarında öz kartof-soğanını, göy-göyərtisini satan yazıq-yuzuq kəndçilərin bütün mallarını bazarboyu darmadağın eləyib, kisə-kisə evlərinə daşıyan 3-4 nəfər dəm xuliqan da xalqın adından danışırdı.

Daha mənim xalq barədə sözüm yoxdur. Bircə onu deməyim qaldı ki, elə bu üsullarnan xalqın evini yıxıb ağlar günə qoydunuz!

İndi də keçək sənin kəndir məsələnə. Boynuma alıram ki, babat məzmun da var, nəticə də, amma, qağa, Vallah, örkən kimi çox uzatmısan, doğanaqdan isə geç keçirmisən, ey! Mən sənin yerinə olsaydım (əlbəttə, bunu sən istəməzsən) elə bircə cümləynən kəndir məsələsinə xitam verərdim çıxıb gedərdi işinin dalınca. Yazardım ki, ay hörmətli respublika rəhbərləri, insafınız olsun, zəhmət deyilsə, bir az kəndir, bir qırıq da sabun təşkil elətdirin (!). Bu yazıq xalq özünü həmin sabunlu kəndirdən asıb, canını sizin əlinizdən biryolluq qurtarsın! Və elə buradaca imzamı qoyardım. Yoxsa, sənin kimi…

Bu kəndir məsələnlə bağlı mən də birini yazmışam. Göndərirəm sənə, əgər uzundursa, kəs, gödəlt, yox, gödəkdirsə, məsləhət olmasın, gələcəkdə sən də gödək yaz.

… İndi bizim respublikada gedən kadr siyasəti aşağı-yuxarı dartılmaqdan heyi kəsilmiş bir kəndirin ucuna bağlanan xəlbirə dönmüş vedrə ilə dərin quyudan su çıxarmağa oxşayır. Yəni ki, deşilməmiş yeri qalmayan köhnə vedrə sürtülüb canı üzülmüş kəndirdən sallana-sallana gedir quyunun dibinə, sərin su ilə dolur və deşiklərindən su axıda-axıda onu yuxarı dartırlar. Yarı yolda kəndir dözməyib qırılır, parası qalır su dartanın əlində, parası da vedrəqarışıq gurumbultuyla qayıdır aşağı. Bütün kənd camaatı yığılır quyunun başına və başlayırlar fikirləşməyə ki, vedrəylə üzülmüş kəndiri quyudan necə çıxarsınlar. (Bilirəm ki, burada yadına mütləq «bir dəlinin quyuya atdığı daş…» məsəli düşəcək). Axırda kəndir əlində qırılana olmazın sözünü deyib, ortasına ayrı bir kəndir bağlayaraq sallayırlar quyuya ki, günahkar özünsən, get vedrəylə kəndiri tap çıxar. Məxləs, yüz əzab-əziyyətdən sonra vedrə kəndirqarışıq qaldırılır quyunun başına. Camaat bilir ki,

özlərində təzə kəndir də var, təzə vedrə də. Lakin heç kəs dinmir. Həmin köhnə kəndirin qırıq uclarını biri-birinə düyüb, yenidən qoyurlar quyunun başına ki, hansısa suçıxaranı xataya salsınlar. Deşik vedrə ilə çürümüş düyünlü kəndir və bir də onları dəyişməyə qoymayanlar isə qalsınlar öz köhnə vərdişlərində.

Vəssalam.

**P. S. Bahadur bəy həmişə mənə deyir ki, sənin bir eybin varsa, o da uzun yazmağındı, qəzetə yerləşmir.**

**«Salam» qəzeti,**
**20. 01. 1992-ci il.**



# TƏNZİLƏ YOLÇU QIZINA MƏKTUB

Sizə «Salam»la salam göndərirəm.

«Aydınlıq» qəzetinin 23 oktyabr 1992-ci il tarixli 44-cü sayında «Torpaq namusu» adlı yazını oxumağa başlayanda beynimdən o fikir keçdi ki, kaş bu həmkarım (nə peşənin sahibisiniz, bilmirəm) Tərtər haqqında o birilər kimi havadanqapma faktlara deyil, gerçəkliyə əsaslanan, reallığa söykənən yazı yazaydı, «əyrini əyri, düzü düz» göstərəydi! Çünki bu bölgədən müharibə mövzusunda yazılan materialların əksəriyyəti qəzetçilərin əlüstü və alaçiy müşahidələrinin (və yaxud hardansa eşitdiklərinin) sədasından başqa bir şey deyil (bu barədə «20 yanvar» qəzetinə – Nadir Mirələkbəroğluna da iradlarımı yazmışdım – «Salam», № 17).

Mənə qəribə gələn odur ki, son zamanlar kütləvi informasiya vasitələrinin işçiləri bir çox hallarda jurnalistlər üçün ən yüksək meyar olan etikanı gözləmir, hər kəsin öz səviyyəsinə görə kimin ağlına hansı yaramaz fikir, hansı təhqir gəldi, döşəyib yazırlar, redaktorlar da (maşallah!) gözlərini yumub mübarək imzalarını yapışdırırlar belə yazıların kəlləsinə və təcili göndərirlər mətbəəyə. Həmin təhqirli yazıların ünvanlandığı adamlar da məcbur olub, bütün etik normaları pozur və necə deyərlər, çomağa çomaqla cavab verirlər. İndi mən də həmin məcburiyyətdə qalmışam və fikirləşirəm ki, ayrı əlac yoxdur, çünki mədəni cavabı mədəni adamlara verərlər.

Sizin yuxarıda adını çəkdiyim yazınız əsasən hazırda Tərtər Rayon İcra Hakimiyyətinin başçısı vəzifəsində işləyən Sərdar bəy Həmidovu tərifləməyə həsr olunub. Tərtərliləri əsəbləşdirən, əlbəttə, bu deyil, sizin yazınızdakı mayası yalandan yoğrulmuş təhqirlərdir. Özü də bu təhqirlər konkret bir adamın ünvanına yox, bütöv bir bölgənin, indinin özündə də müharibənin dəhşətləri burulğanında yaşayan bir rayonun qorxmaz əhalisinin ünvanına yönəlmişdir. Niyə sözlərinizi ölçüb-biçmədən, bunun müqabilində cavabınızın nə olacağını düşünmədən bir elin adına ləkə yaxırsınız? Həmin yazınızda özünüzəlayiq səviyyəsiz kəlmələri və orfoqrafik səhvlərinizi bir yana atıb, aşağıdakı

cümlələrinizin məntiqi nəticəsini araşdıraq. Yazırsınız: «Ümidsizlik girdabına düşən tərtərlilər əvvəl təkəmseyrək yuvalarından oynayıb. Sonra müharibədən az çox başıçıxanlar ***qandırıblar ki,*** (!) yağı şəhərin vur-tut bir kilometrliyindədi. Əvvəl paket atılır, sonra tank, dalınca piyadalar gələcək. Hamının başını kəsəcəklər. Təhlükə gör nə qədər ciddidir ki, artıq bərdəlilər qaçırlar. Bizim əl-qolumuzu bağlayan nədir? Bundan sonra tərtərlilər «Ya mədəd» deyib elə tərpəniblər ki bir də baxıblar şəhərdə ***başıpapaqlı*** qalmayıb» (!).

Bu iftiranızı oxuyan hər bir tərtərli o dəqiqə başa düşür ki, siz müharibə günlərində digər bir çox həmkarlarınız kimi qorxunuzdan Tərtərə ayaq basa bilməmisiniz (əgər burda olsaydınız, həm belə yazmazdınız, həm də elə o vaxtın özündə də istəsəydiniz sizin üçün bir yox, yüz başıpapaqlı kişi tapılardı). Əgər Tərtərin sakininin biri də mənəmsə, onun şahidiyəm ki, ayrı vaxtlar bir yana, lap bu ilin axırıncı çərşənbə gecəsində də şəhərə bir neçə dəqiqə ərzində 40-a yaxın «Kristal» tipli raket düşərək onlarla ailənin göz yaşına bais olan ölüm və qan-qada selində belə Tərtər başıpapaqlılarla dolu idi.

Bunlar bir yana. Məni düşündürən başqa suallar da var. Birincisi, bilmək istəyirəm ki, siz «başıpapaqlı» deyəndə kimləri nəzərdə tutursunuz? Restoranlarda, musiqili barlarda sizin kimilərlə Azərbaycanın dərdi-sərindən uzaq göz-gözə, nəfəs-nəfəsə əyləşən, xumarlı baxışlarını xarici siqaret tüstüsü arxasından üzünüzə hərisliklə dikərək sizi mədh edən boynuyoğun, bığıburma zırpıları, yoxsa təpədən dırnağa barıt qoxusuna batmış, yayın istisində, qışın sazağında yanıb qarsalanmış, vətən qeyrətini, namusu hər şeydən uca tutan, şəhidlikləri ilə sizin kimilərin rahatlığını təmin edən, günlərlə, hətta aylarla ata-anasının, övladının üzünü görməyən, hər anını ölüm təhlükəsi gözləyən ərləri? Əgər birinciləri nəzərdə tutursunuzsa, onda düz yazırsınız, nə o vaxt, nə də indi belə «başıpapaqlılar» Tərtərdə gərək ki, olmasın. Əgər ikinciləri nəzərdə tutursunuzsa, onda hörmətli Tənzilə xanım, qulaq asın.

Əgər Tərtərdə başıpapaqlı qalmamışdısa, bəs atılan mərmilərdən, paketlərdən, ölümsaçan güllələrdən həlak olan yüzlərlə



Tərtər kişisinin adını hara yazaq? Axı bütün respublikaya bəllidir ki, müharibə günlərində başıpapaqlılar bir yana, heç başıyaylıqlılar da Tərtəri tərk etməmişdilər. Niyə bir elata iftira yaxıb, heysiyyatına toxunursunuz!? Heç olmasa son bir il ərzində təkcə Tərtərin özündən vətən uğrunda şəhid olan 500 nəfərdən çox igidimizin ruhu qarşısında xəcalət çəkəydiniz!

Nəhayət, bəlkə həqiqətən də o vaxtlar Tərtərdə sizin istəyinizə uyğun bir başıpapaqlı tapılmayıb? Neyləsinlər axı? O günlərdə kişilərin başı müharbənin ağrı-acısına qarışmışdı və buna görə də bəzi həyatı zərurətlərə vaxt və maraq yox idi.

Məktubumun sonunda onu da bildirirəm, ki belə zəif cavaba görə tərtərli gənclər məni möhkəm qınayacaqlar, deyəcəklər ki, tapşırdıqlarımızın yüzdən birini yazmamısan, üzgörənlik eləmisən. Neyləyim axı? Qadınsınız, başıpapaqlı deyilsiniz, yoxsa sizi kişi kimi hər tərəfli başa salmağa nə vardı ki?!

**«Salam» qəzeti,**
**1993-cü il.**

*«Fədai» qəzetinin baş redaktoru cənab*
*Bahadur Tahirbəyova açıq məktub*

## «HAQQ-HESAB»SIZ OLMAZ
### *(Yaxud «Fədai»nin köşklərinə niyə yer vermirlər?)*

**Möhtərəm baş redaktor!**

Tapşırmısınız ki, rayon icra hakimiyyəti başçılarının yanında olum. «Fədai» qəzetinin köşkləri üçün yer ayrılması məsələsini həll edim. Əlbət məni işdən çıxarmaq fikriniz var ki, belə tapşırıq vermisiniz. Yoxsa, o tapşırığı verəndə niyə cibimə pul qoymurdunuz? Guya bilmirsiniz ki, yerlərdə bu məsələni «haqq-hesab»sız həll etmək mümkün deyil? Kimin nə vecinədir ki, müharibə veteranlarına xidmət edirsiniz?

Məktubla bərabər Sizə işdən azad olunmağım barədə ərizə də göndərirəm. Ya ərizəmin üstünü yazın, ya da zəhmət çəkib özünüz rayonlara gəlin, məsələni də müftə həll edin, görüm necə olur?

İndi ölkədə alandan çox satan var. Kimin xətri haranı istədi ora bir «cındır putka» qoyur (kasıb halva yeyər öz pulunun minnətinə). Şəhəri bürümüş və keçmişdəki pinəçi «putka»larına bənzər yamaq-yumaqlı, yöndəmsiz köşkləri görəndə adamın ürəyi bulanır. Rayonlarda icra hakimiyyəti binalarının həndəvərində, prokurorluqların, milis idarələrinin ətrafında, hətta səkilərin tən ortasında qoyulmuş «putka»lar taxtabiti kimi gün-gündən «balalayıb» artır.

Bir belə də eybəcərlik, bir belə də məsuliyyətsizlik olar?! Çoxu da qanunsuz, qərarsız, sənədsiz, filansız. Maraqlanıb öyrənmişəm. Yevlaxda, Goranboyda, Bərdədə, Ağcabədidə, Beyləqanda və Tərtərdə bu cür «putka»ların yüzündən 90-ı qərarqəsəmsizdir, vergi-zad ödəmir. Qanuna əhəmiyyət verən var? Təəccüblü bir şey də yoxdur. İndi qanunlar imkanlı əllərdə rezinə dönüb – çəkirlər uzanır, buraxırlar, yığılır, barmağa dolayırlar, dolanır. Qanun dolu cibdir. Bizim isə dolu cibimiz yoxdur. Heç olmasa bir nəfər Azərbaycan Vətən Müharibəsi veteranını işlə təmin etmək xətrinə «Fədai» qəzeti neçə aydır rayon İH başçısına müraciət edir, amma yüzlərlə qanunsuz köşklərin arasında bir qanuni qəzet köşkünə yer vermirlər ki, vermirlər.



Bu günlərdə AVMVB-nin Tərtər Rayon Şöbəsinin sədri İlham Paşayevlə birlikdə rayon İH-nə rəsmi müraciət etdik. Sağ olsun başçının müavinini məktubumuzun üstünü yazıb göndərdi Tərtər şəhəri üzrə icra nümayəndəsinə. Bu yoldaş da bizi göndərdi şəhərin memarının yanına. O yoldaş da dedi ki, axtarın, qanunsuz köşklərin əlindən münasib yer tapsanız, mənə xəbər verin, gəlib baxım. Amma tapa bilməyəcəksiniz.

Düz deyirdi, biz hələ də axtarırıq. Yer tapan kimi razılığa gəlsək, qərar yazılacaq və inşallah «Fədai»nin ilk köşkü Tərtərdə açılacaq.

Amma bu işin mətləbə heç bir dəxli yoxdur. Ən yaxşısı, xahiş edirəm, ərizəmin üstünü yazın.

**1996-cı il.**

"İnsan iki həqiqətə - təbiətə və tarixə xəyanət edə bilməz. Etsə böyük itkilər verər".



# «TƏRTƏR» ADI QƏDİMDİR

Min illər boyu dağlardan baş alıb sellənə-sellənə aranbasar rayonlara üz tutan, indi isə Sərsəng dərəsində bəndə salınıb fağırlaşan Tərtər çayının, onun sağ və sol sahillərində yerləşən Tərtər nahiyəsinin ulu bir tarixi vardır.

Bəzi tarixi mənbələrə görə Tərtər adı VII əsrdən xeyli əvvəl formalaşıb.

Erkən orta əsrlərdə Altayda yaşamış türkdilli tayfalardan biri məşhur Tərtər tayfası imiş. Döyüşkən Tərtər tayfasının bir dəstəsi o zamanlar Dəclə və Fərat çayları arasında, Kərkük Vilayətində qalıb. Bağdad yaxınlığında Tərtər adlı çay və göl indi də vardır.

Tərtərlilərin XII əsrdə rus knyazlarının drujinaları ilə vuruşduğu göstərilir. Knyaz İqor qıpçaq tayfalarının bayraqları sırasında Tərtərlilərin tayfa rəmzlərini də tanımışdı.

IX-XIII əsrlərdə Cənubi Rus çöllərində və Şimali Qafqazda yaşamış qıpçaq tayfalarından olan Tərtərlər 1280-1323-cü illər-də Volqa Bulqarıstanında (indiki Tatarıstanda) hökmdar süla-ləsinə başçılıq etmişlər.

Tərtərlərin bir qolu Orta Asiyada, əsasən Özbəkistanda məskunlaşaraq özbək xalqına qaynayıb qarışmışdı. XIX əsrə qədər Səmərqənd Vilayətində Tüyə-Tərtər mahalı mövcud olmuşdu.

Tərtər orta əsrlərdə Artsax adlandırılan Aran Qarabağının tərkibində idi.

Tərtərlərin bir qisminin erkən orta əsrlərdə Azərbaycana gəlməsi ehtimal olunur. Bəzi tədqiqatçılara görə Tərtərçay adı Tərtərlərlə bağlıdır.

XIX əsrdə Azərbaycanda yaşayan tayfalar arasında Tərtər tayfasının da adı çəkilir ki, onlar da Tərtər çayının sahilində yaşamışlar.

Keçmişdə buraya ətraf məntəqələrə sifariş və məktub göndərmək üçün çoxlu çaparlar gələrmiş. Məhz buna görə də rayonun əvvəlki adı Çaparxana olub. Bəzi mənbələrdə isə bu ad Çəpərxana göstərilir. Bunu isə Tərtərin sıx meşələri, ağacdan çəkilmiş çəpərləri ilə bağlayırlar.

XV əsr şerimizin görkəmli nümayəndəsi olan şamaxılı Bədr Şirvani hələ o zamanlar Tərtər çayını öz şerinə poetik bənzətmə ünvanı kimi seçmiş və yazmışdır ki, mənim şerlərim Tərtər çayının suyu kimi tər-tərdir.

İndi yazıqlaşsa da, əvvəllər bu çayın qan-qan deyən vaxtları çox olub, Azərbaycanın görkəmli ədibi M. F. Axundov 1875-ci ildə Tiflisdə nəşr olunan «Kafkaz» qəzetində dərc etdirdiyi «Səfərdə» məqaləsində yazırdı: «…Biz güc-bəla ilə İncim yarımpostunu, Karvansaranı arxada qoyaraq, uzaqdan məzara oxşayan Tərtər arxlarının ağ köpüklərindən keçdik və yarğandakı eniş yola çatanda qəfil ildırım çaxdı və elə şiddətli yağış yağdı ki, bir andaca da iliyimizə qədər islandıq…

…Qabaqda, bizdən aşağıda Tərtər haray salır, qaynayıb daşırdı. Adamı vahimə bürüyürdü. Dəhşətli sürətlə axan suların pəncəsində daşlar bir-birinə dəyib şaqqıldayırdı.. Qarşımızda eni 7-8 sajen olan məcrada çay çağlayıb gedirdi. Bilmirəm sular «lal» idi, ya çayın gurultusundan bizim qulağımız batmışdı. Yuxarıda, bizdən bir ağaclıq məsafədə çay daha geniş məcrada aşıb-daşırdı…».

İndi Tərtər çayında o hal nə gəzir? Əvvəllərdə bu çayın büllur suyu öz məcrası ilə və Tərtər şəhərinin qoynundan keçən kanal və arxlarla axaraq rayona təravət, gözəllik, təmizlik və sərinlik gətirərdi.

Hələ XIX əsrin əvvəllərində Yelizavetpol quberniyasının Cavanşir qəzasının mərkəzi Tərtər olmuşdur. İnzibati bölgüdə Bərdə də bu qəzanın tərkibində idi. İndi isə Tərtər rayonu respublikada ən məhdud torpaq ərazisi olan bir rayondur. Son siyahıya almaya görə burada 55 min nəfərdən az adam yaşayır. Lakin bu qədim diyarda aparılan tədqiqatlar sübut etmişdir ki, Tərtər rayonu ərazisində hələ bizim eradan əvvəlki III minilliyə aid qiymətli ta-rixi abidələr vardır.

Tarixçi alim Hidayət Cəfərovun rəhbərliyi ilə rayonun Borsunlu kəndi ərazisində aparılan arxeoloji qazıntı işləri nəticəsində burada böyük kurqan çölü aşkar edilmişdir. Tapılmış maddi-mədəniyyət nümunələrinin araşdırılması göstərir ki, kurqan çölünün daxil olduğu İncəçay hövzəsi hələ bizim eradan əvvəl III minillikdə məskunlaşmışdır. Maraqlı abidələrdən biri 15 kvadrat-metr sahədə gil daşdan kvadrat şəkildə hörülmüş qəbirdir. Qəbrin kənarları çay daşları ilə haşiyələnmiş, döşəməsi hamarlanmışdır. Qəbir üçmərtəbəlidir. Üst mərtəbədə bir, ikinci mərtəbədə səkkiz, üçüncü mərtəbədə isə on insan skleti aşkar olunmuşdur. Dəfn olunanlar yarımbükülü vəziyyətdədirlər. Ulu əcdadlarımızın əqidəsincə insan ana bətnində hansı vəziyyətdə olursa, öləndə də torpağa həmin vəziyyətdə qoyulmalıdır. Bu dövr arxeoloji ədəbiyyatda ilk tunc dövrü adlanır.

Sonra alim göstərmişdir ki, abidələrin dövrü təkcə həmin xronoloji çərçivədə qalmır. Axtarışlar nəticəsində orta və son tunc dövrlərinə aid abidələr də aşkar olunmuşdur. Bir neçə il əvvəl qazılan bir kurqanın altından tayfa başçısı dəfn olunmuş, uzunluğu 32 metr, eni 8 metr, dərinliyi 4 metr olan nəhəng qəbir tapılmışdır. Qəbrin üstünə 200-dən çox indi nadir tapılan arqan ağacı döşənmişdir. Tayfa başçısı taxta səki üzərinə qoyulmuşdur. Səki qızıl və tunc mıxlarla mismarlanıb. Onun yanında tayfa başçısının döyüş silahları, nizə və ox ucları, döyüş təbərzini, mərmər toppuz qoyulmuşdur. Bundan başqa buradan saxsı qablar, tunc və qızılla işlənmiş bəzək əşyaları, qızıl düymələr, qızıl toqqa başlığı, fil sümüyündən, şüşə və əqiqdən hazırlanmış muncuqlar tapılmışdır. Küplərin birinin içərisindən şərab qallığının tapılması böyük maraq doğurur. Qəbrin bir tərəfində qul və kənizlər dəfn edilib. Başqa hissəsində atlar basdırılıb.

Hidayət Cəfərov Respublika EA-nın müxbir üzvü Dəmir Hacıyevin mülahizəsinə əsasən qeyd edir ki, atlar qoşqu və minik atlarıdır. Onların yanında tunc cilovlar və bəzək əşyaları tapılmışdır.

Alim daha sonra göstərir ki, arxeoloji materialların təhlili Borsunlu ərazisində yaşamış ulu babalarımızın üzümçülük və maldarlıqla məşğul olduqlarını sübut edir. Burada sənətkarlıq ayrıca sahə kimi təkmilləşmişdir. Abidə son tunc dövrünə (eradan əvvəl XI-XII əsrlər) aiddir.

İncəçay hövzəsində yaşayanların ətraf aləmlə mədəni və ticarət əlaqələri olduğu aşkar edilmişdir. Belə ki, kurqanlardan tapılmış fil sümüyündən bəzək əşyaları, «Misir pastası»ndan və

şüşədən hazırlanmış düymə və muncuqlar, Assuriya mənşəli şirli qablar buna sübutdur.

Alim daha sonra qeyd etmişdir ki, bu yerin sakinləri nəqqaşlıq, metalişləmə, dülgərlik, dulusçuluq sənətlərinə dərindən bələd olmuşlar. Sümükdən qayrılmış at qantarğaları üzərində çox ustalıqla insan şəkli cızılıb. Bəzəkli küplər, cilovlar, tunc döyüş baltası, muncuq və düymələr, bilərzik, ox və nizə ucları müxtəlif sənətlərin yayılması barədə təsəvvür yaradır.

Rayonda aşkar olunmuş böyük Borsunlu kurqanı Azərbaycan ərazisində tədqiq olunan ən möhtəşəm abidədir.

…Tərtər adının belə qədimliyinə və coğrafiliyinə məhəl qoymayaraq, onu Mirbəşir adlandırmışlar. Bu yaxınlarda rayon rəh-bərliyinin təşəbbüsü və respublika hökumətinin qərarı ilə Tərtər rayonunun tarixi adı özünə qaytarılmışdır.

**«Salam» qəzeti,**
**1991-ci il.**





# MƏZAHİR DAŞQIN XALQ DÜŞMƏNİ İDİMİ?

Yaxşı ki, dünyada yanan ürəklər, xeyirxah əməllər var! Elə ürəklər ki, bir vaxt «xalq düşməni», «əsir» damğaları ilə bütün varlıqlarına od basılmış, ömürlərini məşəqqət və zillətlər qoynunda keçirmiş günahsız yurddaşlarımızın izlərini arayıb-axtarır, onların adlarının üstünə «mənəm-mənəmlik» taxtında hökmranlıq edər qan hərislərinin saldığı qara ləkələri öz gün işıqları ilə «yuyur», elin yaddaşına qaytarırlar. Qoy ulu Tanrı belə insanların gözlərindən işıq, ürəklərindən nur əskik eləməsin! Bu arzularla da Borsunlu Məzahir Daşqının «Bir zaman can geyib, can eşidərdik…» toplusuna can verən tərtibçi Bağır Bağırova və redaktor Zəlimxan Yaquba öz səmimi istəklərimizi çatdırırıq.

Məzahir Daşqın Tərtər rayonunun Borsunlu kəndində dünyaya göz açıb. Onun keçdiyi 70 illik ömür yolu tərtibçi tərəfindən kitabın önündə öz mənalı təsvirini tapıb. Lakin mən şairə vurulmuş «xalq düşməni» damğasını (bu ifadəyə görə ruhu məni bağışlasın) az da olsa aşkarlamaq arzusundayam.

Bu Odlar diyarının qeyrətli oğullarının başı hansı qovğalara düşməyib, hansı bəlaları çəkməyib?!

Kitabında qeyd olunduğu kimi öz yurdunun sayılan və nüfuzlu adamı olan şairin atası Məşədi Həmzəyə bədxahlıqla şər atıb partiya sıralarından çıxardıqdan və həbs etdirdikdən sonra Məzahirin qara və sitəmli günləri başlayır. Oxuduğu məktəbdən qovulur, könüllü getdiyi müharibədə bəxtin tərsliyindən əsir düşür, xarici ölkələrdə illərlə mühacir həyatı yaşamağa məcbur olur. Yüz dərd-bəla çəkir, Vətənə qayıtmaq həsrətilə qovrulur və nəhayət bütün varlığıyla can atdığı Azərbaycana gəlib evlərinə çatha-çatda həbs olunur. Sonra həbsxana divarları, tikanlı məftillər, zülümlər…o zülümlər ki, Mikayıl Müşfiqin, Musa Cəlilin, Hüseyn Cavidin, Salman Mümtazın…başlarına gətirilənlərdən heç bir şeylə fərqlənmir. Əgər böyük şairimiz Səməd Vurğun olmasaydı, o da uzun və üzüntülü həbs düşərgələrinə, sürgünlərə tab gətirə bilməyəcəkdi.

Nəydi Məzahir Daşqının günahı? Niyə ona «xalq düşməni» adı vermişdilər? Ona görə ki, o öz dövrünün haqsızlıqlarına, «başbilənlərin» xalqın başına açdıqları sonsuz müsibətlərə dözə bilmirdi, zəhərli ilana döndərdiyi acı şeirlərilə ölkəni «ölü dənizinə», «qan çanağına» döndərənləri sancırdı, onların astar üzlərini açıb xalqa tanıtdırırdı. O dövrdə isə bu hərəkətin bir «payı» vardı – sürgün və ölüm! Şair bunu bilsə də, öz ömrünü ideyasına qurban verməkdən çəkinmirdi. Yazdıqları, yaratdıqları el içində dillər əzbəri olsa da, aşıqların meydanında cövlan etsə də, o incilər işıq üzü görə bilməzdi – özünün 10 illik dustaq həyatı kimi.

İndiyə qədər şairin qardaşı Elxan, oğlu Nazim çox çalışıblar, döymədikləri qapılar qalmayıb. Nəhayət, ölümündən 12 il sonra qədirbilən adamların köməyi ilə onun daşqın ilhamından göyərib boy atmış bir əlvan gül çələngini oxuculara çatdırmağa nail olublar.

Kitabı oxuduqca bir ulu və qüdrətli şairin enişli-yoxuşlu ömür yolu, yaşadığı acılı-şirinli ovqatları, keçirdiyi həyəcanlı hisslər zamanın püskürtüsü kimi ürəklərimizi silkələyir, acı göz yaşları kimi gözlərimizi, dil-dodağımızı yandırır, göynədir. Vyanada yazdığı «Bülbül» şeri kimi.

**… Qəmli dastan bağlamaqdan,**
**Dağı-daşı dağlamaqdan,**
**Vətən deyib ağlamaqdan,**
**Saçım oldu çal, ay bülbül.**

* * *

**Mən Daşqınam, bu zilləti,**
**Verib hicran qiyaməti.**
**Canımda Vətən həsrəti,**
**Qoymayıbdır hal, ay bülbül.**

Belə bir vətəndaş şairə Stalin, Beriya və Mir Cəfər Bağırov hökmranlığı «xalq düşməni» damğası vurdurmuşdu. Kaş onların özləri də öz vətənlərini, öz xalqlarını Məzahir Daşqın kimi sevəydilər! Onda otuzuncu illərin qan dənizləri, göz yaşı dəryaları yaranmazdı.



Polşada 1942-ci ildə yazdığı «Qaldı» şerində:

**Baxmaqdan gözlərim Vətənə sarı,**
**Qarası əriyib, ağları qaldı. –** deyir.

1943-cü ildə yazdığı «Yetirin» şerindəki yanğıya fikir verin:

**Heç axtaran yoxdu itən Daşqını,**
**Əzablı qürbətdə ötən Daşqını.**
**Sizdən xəbər alsa Vətən Daşqını,**
**Ağ saçımdan bir nişanə yetirin.**

Almaniyada 1943-cü ildə yazdığı «Buludlar» qoşmasında Azərbaycanı haraylayan şair də vətən xaini ola bilərdimi?

**Könül haraylayır Azərbaycanı,**
**Şairlər oylağı görünmür, hanı?**
**Qalmasın qürbətdə Daşqının canı,**
**Aparın Vətənə, yara buludlar.**

Bənövşə şerində:

**Yadıma düşdükcə vətənim, elim,**
**Sinəmin oduna qovrulur dilim –**

deyən şairə vətən xaini adı qoymaq ən azı vicdansızlıqdır.

Öz yurdundan, obasından didərgin düşərək Almaniyanı, Polşanı, Fransanı, İtaliyanı, Budapeşti, Təbrizi, Belçikanı dolanan Borsunlu Məzahir Daşqın bir an da olsun Vətənini – doğma Azərbaycanını yaddan çıxarmır, Vətənə dönüş həsrətilə çırpınır. Belə şerlər yazan şairin qanında heç vaxt Vətənə, xalqa xəyanət hissi, düşmənçilik meyli ola bilməzdi.

**Daşqınam, oğluyam qoca Azərin,**
**Tale nəsib etsin oranı, dağlar.**
**(1943)**

**Vətən həsrətindən, bu ahu-zardan,**
**Uğursuz qürbətdə solası oldum.**
**(1943)**

**Düşəndə yadına Vətən Daşqının,**
**Çəkdiyi zillətdən, cəfadan ağlar.**
**(1943)**

**«Haray, Vətən» - deyib çalıram sazı,**
**Obaları, oymaqları görəndə.**
**(1944)**

**Sevdalı Daşqının ana Vətəni,**
**Həsrətin çəkdiyim ellər dururmu?**
**(1945)**

**Vətənimi şöhrət üçün yada satan deyiləm,**
**Azadlığın carçısıyam, xalqıma qurban bizik.**
**(1941)**

Vətən sevgisi, Vətən həsrəti ilə alışıb yanan el şairinin belə söz qoşqularından çox sitatlara gözümüzü ayna edərik. Lakin xırda bir söz külçəsi də öz dəyərini sərraflara açıqlada bilər.

Bu qısa yazımızda Borsunlu Məzahir Daşqının Vətən eşqini, el-oba sevgisinin bəlkə də bir damlasına belə toxunmağı bacarmadıq. Dəryadan bir damla nədir ki?

Çapı xeyli əzab-əziyyətlə başa gələn və yenicə işıq üzü görmüş bu sehirli kitab, nəhayət ki, uzun illərdən sonra Məzahir Daşqının sözlərinə qoyulan əbədi bir heykəldir. İstəyimiz odur ki, ölməz şairin doğulub boya-başa çatdığı Tərtər rayonunun Borsunlu kəndindəki məzarının üstündə də də onun öz heykəli ucalsın və sənətsevərlərin ziyarət yerinə çevrilsin.

**«Salam» qəzeti,**
**1991-ci il.**



# ÇERNOBIL FACİƏSİNİN QURBANLARI

Bəşəriyyəti kütləvi qırğın silahları və ozon böhranları ilə hədələyən XX əsrin dəhşətli faciələr burulğanının ən müdhiş dalğası Çernobıl bədbəxtliyi oldu. 1986-cı il tarixin yaddaşında insanlıq üçün əzablar və zillətlər silsiləsinin ən həyəcanlı püskürtüsü olan Çernobıl kabusunun başlanğıc ili kimi qalacaqdır. Bu, təkcə texnoloji qəza deyildi. Bu, həm də atom, nüvə və bakterioloji silahların ağırlığından «beli bükülmüş və nəfəsi təngimiş» Yer kürəsinin bəşəriyyətə görkü idi.

… Bir var faciələr haqqında eşidəsən, oxuyasan, bir də var, öz gözlərinlə görəsən, hadisələrin girdabına özün düşüb çabalayasan. Dünya və Böyük Vətən müharibələrinin, Vyetnam, Əfqanıstan, Küveyt… qırğınlarının, 20 yanvar Bakı faciəsi iştirakçılarının ürək ağrıları başqadır, bunlar barədə oxuyub eşidənlərinki isə tamamilə bambaşqadır.

– Ölənlərin çoxunu öz gözlərimlə görmüşəm. Orada dəmir, ağac, torpaq qəbiristanlıqları vardı, amma insan qəbiristanlığı yox idi. Kim harda yıxılıb ölürdüsə, həmin yerdə də üstünü betonlayıb qurğuşunla örtürdülər.

Bunları qəza baş vermiş 4-cü blokun özündə – «ölü zona»da nə az, nə çox, düz 3 ay 15 gün zülüm çəkmiş Yusif Həsənov danışırdı. O, Yusif ki, 3 ay 15 günün içində aldığı ömürlük ağrıları bir az səngitmək üçün 1 il 7 ay 15 gün xəstəxanada yatmış, ürəyi infarkt olmuş, 25 gün gözləri tutularaq işıq üzünə həsrət qalmış və korların pənah gətirdiyi çəliklə gəzmişdir.

Özlərini ölümün ağuşuna ataraq Çernobıl qəzasının nəticələrini aradan qaldırmaq üçün fədakarlıq göstərən 6000 nəfərdən 30-dan çoxu tərtərli olmuşdur.

Onlardan biri – Əbülfət Əhmədovun dediklərindən:

– Partlamış blokun yerləşdiyi binanın salamat qalan üst hissəsinə SSRİ-nin bayrağını sancmaq üçün 16 min manat pul təklif olunurdu. Bu yerdə radiasiya öldürücü həddə çatırdı. Cürətə gələn bir nəfər bayrağı götürüb nərdivanla yuxarı dırmaşdı. Lakin bayrağı sancmamış yarı yolda keçindi. İkincisi bayrağı sancdı,

geri qayıtdı və yerə çatandan sonra öldü. Onlar ordaca beton və qurğuşunla kəfənləndilər.

Təşkilat üzvlərinin dediklərindən:

– Xüsusi sənədlər yığılmış qovluqlardan birini içəridən gətirmək üçün 10 min manat pul verirdilər.

Kisələrə qum yığıb maşınlara yükləmək üçün adamların gözləri qarşısında pul dolu kisələr qoymuşdular.

Uzaq keçmişdə qulları hərrac bazarında belə alıb-satmırdılar. Quldarlara sağlam qullar gərək idi.

Qəza nəticələrinin aradan qaldırılmasına səy göstərildiyi günlərdə AES-in həyətində bir pişik balaladı. Onun əcaib balalarının nəyə və hansı heyvana oxşadıqlarını heç kim heç cürə müəyyən edə bilmədi. Şüanın təsiri irsiyyət qanunlarını pozmuşdu.

Kimin şüayla hansı dərəcədə zəhərlənməsini müəyyən etmək üçün radiasiyanın həddini ölçən «Dozimetr»in içərisinə qoyulmuş üç ədəd xırda ağ tabletkanın necə qaralmasına baxmaq kifayət idi.

Orada insan ölümü adi bir hadisəyə çevrilmişdi – günəşin səhərlər çıxıb, axşamlar batması kimi.

* * *

Blokun içərisində işləyənləri qan-tər aparırdı. Günorta yeməkləri yarımçıq qalırdı. Özləri də başa düşürdülər ki, ömürlük zəlilliyə düçar olacaqlar. Bununla belə işləyirdilər. Amma inanırdılar ki, öz həyatlarını təhlükəyə atmaqla minlərlə insan Ömrünü gələcək əzablardan xilas edəcəklər. Həm də inanırdılar ki, partiya və hökumət onların bu fədakar əməklərini layiqincə qiymətləndirəcək…

Qəza ilə əlaqədar səfərbərlik elan olunanda rayonun pullu zümrəsinə mənsub adamlardan, o cümlədən vəzifəli şəxslərdən heç birinin övladının adı siyahıya düşmədi. Ezam olunanlar da, məcburi göndərilənlər də, yağlı vədlərlə aldadılıb yola salınanlar da «aşağı təbəqə»dən idilər və onlara qayıdıb gələndən sonra guya «cənnət» bağışlanılmalı idi.

Getdilər… Kişi kimi çalışdılar ki, ölüm yayan 4-cü blok yerin 40 metr dərinliyinə gömülsün.



Özgə diyarda həyatla ölümün sərhəddində əllərindən gələni əsirgəməyən 6000 nəfər Azərbaycan oğlunun öləni öldü, ölməyəni də ölənlərə tay olub geri qayıtdı…

Yuxarılar adət etdikləri şablon vərdişlərinin davamı olaraq Çernobıl AES-də və bu stansiyanın 30 km-lik zonasında (köçürülmə zonası) qəzanın nəticələrinin aradan qaldırılmasında iştirak edənlərə min cür imtiyazlar verilməsi haqqında neçə-neçə yalan sənədlər imzaladılar, hətta «Çernobıl qəzası nəticəsində zərər çəkmiş vətəndaşların sosial müdafiələri barədə» qanun qəbul etdilər. «Çernobıl İttifaqının Nizamnaməsi»ni hazırladılar. Amma maraqlanmadılar ki, bu göstərişlər yerlərdə yerinə yetirilirmi, yoxsa partiyanın gurultulu şüarları kimi elə kağız üzərində qalır?

Gözdən pərdə asmaq üçün rayonlarda ittifaqın təşkilatlarını yaratdılar. Bu təşkilatlardan biri də 1 avqust 1990-cı il tarixdən Tərtər rayonunda guya fəaliyyət göstərir. (Bu təşkilatların yaradılması məsələsi də min cür bürokratik əngəllərə rast gəldikdən sonra böyük minnətlər hesabına həll olunub). Təşkilat Tərtər, Yevlax, Kəlbəcər rayonlarını, Naftalan şəhərini, Ağdərə (Mardakert) rayonunun azərbaycanlılar yaşayan kəndlərini əhatə edir və hazırda öz sıralarında 380 nəfər «Çernobıl»çını birləşdirir. Onun sədri ikinci qrup əlil Yusif Həsənovla və təşkilatın üzvləri ilə söhbətlər zamanı tale yüklü bir sıra məsələlər məni heyrətə saldı.

Təşkilatın yerləşdiyi miskin bir otaqda gözə dəyən hər nə varsa, sədrin zəhməti hesabına başa gəlib – otağın tələm-tələsik təmirindən tutmuş əşyalara, inventarlara qədər. Gah öz cibinin pulu ilə, gah da ona-buna yalvarıb yaxarmaqla.

Rayon rəhbərliyinin gözündən iraq düşən bu təşkilatın varlığı ilə heç kim maraqlanmır, ona heç bir qayğı göstərilmir.

Yusif Həsənovun dediklərindən:

– Ağır şüa xəstəliyinə tutulan yoldaşlarımız çoxdur. Artıq onlardan 2 nəfəri ölmüşdür. Xəstəxanalarda aylarla yatanlar var. Lakin təşkilatın hesabında 1 manat da olsun pul yoxdur ki, bu bədbəxtlərin başsız qalmış ailə üzvlərinə heç olmasa 30-40 manat yardım göstərək. Rayon rəhbərliyinin bir sözü kifayətdir

ki, dövlət təşkilatlarının, kolxozların və kooperativlərin havayı yerə ora-bura səpələdikləri puldan bir az da bizim hesabımıza köçürsünlər. Yalvarmaqdan yorulmuşuq.

Çernobıl mənim kimi sağlam adamı ikinci qrup əlilə döndərdi. Xəstəliyim şiddətlənəndə balıq kimi çabalayıram, yumağa dönürəm. Oradan qayıdandan sonra dünyaya gələn və indi 2 yaş 6 aylıq qızım Gülnar, 1 yaş 2 aylıq oğlum Orxan da mənim kimi xəstədirlər. Elə gecə olub ki, 3-4 dəfə «Təcili yardım» çağırmağa məcbur olmuşam. Gül kimi balalarımı da bədbəxt eləmişəm, onlar mənə göz dağı olublar. Ayağımın biri gordadır. Uşaqlarıma baxanda, onlar göyərib əsəndə qəhərdən boğuluram, özümə ölüm arzulayıram.

Bu sözləri danışanda Yusifin gözləri neçə dəfə yaşla doldu, yanağına süzülməyə qoymadı – ürəyinə axıtdı.

– Məni yandıran odur ki, başıma gətirilən bu faciələri öz günahım kimi ayağıma yazırlar. Mənə imtiyaz-zad lazım deyil, barı adımızı dəli qoymasınlar!

* * *

Qüvvədə olan qanun və qərarlara əsasən Çernobıl AES-də və onun 30 km-lik zonasında şüa xəstəliyinə tutulmuş şəxslər pulsuz dərmanlar almalı, onların səhhətinə daimi dispanser nəzarəti qoyulmalı və tibbi-sosial bərpa edilməsi üçün tədbirlər kompleksi həyata keçirilməlidir. Bu xəstələr hər il sanatoriya-kurort müalicəsi ilə təmin olunmalı, ilk növbədə mənzil şəraitləri yaxşılaşdırılmalı, evlərinə telefon çəkilməli, habelə onlara faizsiz ssuda, minik maşınları, həyətyanı torpaq sahələri, ərzaq məhsulları xüsusi imtiyazlarla verilməlidir.

Təşkilat üzvlərinin dediklərindən:

– O vaxtkı Azərbaycan SSR Nazirlər Sovetinin 20 dekabr 1990-cı il tarixli 557 nömrəli qərarında göstərilir ki, Çernobıl AES-də 1986-1988-ci illərdə qəza nəticələrini aradan qaldırmaqda iştirak etmiş şəxslərə 30 km-lik zona (köçürülmə zonası) daxilində işləmək haqqı ildə bir dəfə dördqat ödənilməlidir. Lakin biz bu qanuni haqqımızı almaqdan ötrü neçə-neçə qapı döyməli oluruq.



Mən rayonun mənzil-istismar idarəsində çilingər işləyirəm, adım Əbülfət, familiyam Əhmədovdur. Keçən il dördqat əmək haqqını xeyli get-gəldən və nəhayət, prokurorluq işə qarışdıqdan 6 ay sonra ala bildim. Bu il yenə də sürünürəm. Gərək Bakıya gedəm.

Həkimlərdən bir nəfəri belə bir dəfə də olsun bizim halımızla maraqlanmayıb. 6 aydan bir tibbi ekspertizadan keçmək üçün bizə maşın belə ayırmırlar. Elə təşkilatlar var ki, az qalır texniki işçiyə də xidməti maşın versinlər. Lakin bu boyda bir ərazini əhatə edən təşkilata xidməti maşın ayırmırlar ki, heç olmasa yerdə ağır yatan, gün işığından belə vəziyyəti ağırlaşan xəstələrimizə baş çəkək, onlara mənəvi dayaq olaq.

Kef çəkmək, gün altında qaralmaq, dənizdə çimmək üçün sağlam adamların sanatoriyalara, kurortlara getmələrinə nə qədər istəsən putyovka tapılır, amma bizə yox.

Rayonumuzun sözü ötən şəxslərinə məcbur qalıb şikayət edəndə bizə həqarətlə baxırlar. Bizi yanlarında oturmağa da qoymurlar ki, onlara da şüa keçər. Halbuki, özləri də bilirlər ki, bu xəstəlik keçici deyil.

Gecələr «Təcili yardım» maşını çağıranda cavab verirlər ki, yanacaq yoxdur. Lakin həmin maşınlar gecə-gündüz «xaltura» ilə məşğul olurlar.

* * *

Rəhbərlərdə soyuq üz, laqeyd baxış, daş ürək görən, «sağ ol!» əvəzinə həqarətli sözlərlə təhqir olunan bu əzabkeş cavanlarımızın inamları itib, ümidləri qırılıb. Çoxu ata olmaq xoşbəxtliyindən məhrum olub, ömürlük mənəvi-psixoloji və fiziki gərginliyə məruz qalıb, insanlıq naminə qanlarını radiasiya ilə zəhərləyib yaşayacaqları illəri yarıbayarı azaldıblar. Onlar həyatlarının qalan nisgilli günlərini ağrılar içində qovrula-qovrula yaşayacaqlar. Hər an ölüm təhlükəsi gözləyəcəklər. Biz isə onların fədakarlıqları qarşısında baş əymək əvəzinə…

71 ildə kimin özünə layiq olduğu qiyməti verə bilmişik ki? İşişdən keçəndən sonra isə həmişə təəssüflənmişik. Bəs deyilmi?

**«Salam» qəzeti,**
**1991-ci il.**

# MEŞƏLƏRİN DİLSİZ HARAYI

Hələ Nüşabənin dövründən də əvvəl Bərdə meşələri ilə bu günlərə kimi çiyin-çiyinə ömür sürən Tərtər meşələri indi insanların soyuqluğundan, baxımsızlığından, ürəyi daşlığından yazıqlaşıb, quruya-quruya seyrəlib, kəsilə-kəsilə pərən-pərən düşüb. İş o yerə çatıb ki, adamlar meşələrin torpağını da acgözlüklə talan edir, münbitdir deyə, maşın-maşın daşıyaraq satan satır, satmayan da öz şəxsi həyətlərinə doldurur. Hələ odun və tikinti materialı kimi istifadə etmək, satmaq məqsədilə hər il baltalanan yüzlərlə cavan-qoca ağacları, nə üçünsə doğranan pöhrələri, şivləri demirəm. Belə adamlar təbiətin – əslində bizim düşmənimiz kimi meşələrin ömrünə qəsd edir, kar qulaqları ilə ağacların dilsiz harayını eşitmirlər. Bir tərəfdən də susuzluq, mal-qara ilə meşələrin başına gətirilən müsibət!...

* * *

Bundan əvvəlki iş yerimdə mənim ünvanıma bir şikayət ərizəsi gəlmişdi. Əslində bu, ərizə deyildi, əlacsızlıqdan respublikanın yuxarı təşkilatına göndərilən yalvarış idi, imdad diləyi idi. Ərizə sahibinin ünvanı göstərilmədiyindən onu xeyli axtarmalı oldum. Nəhayət, tapdım. Biləndə ki, ərizəsiylə əlaqədar gəlmişəm, gözlərində ümid qığılcımları yandı. Sonradan öyrəndi ki, rayon təşkilatındanam, bu qığılcımlar öləziyib söndü. Buna baxmayaraq, qolumdan tutub, məndən xahiş etdi ki, onunla birlikdə rayon mərkəzinə bitişik meşəni gəzək. Bu adam (heyif ki, indi onun adı yadımda deyil!) həmin meşənin gözətçisi idi. Gəzdikcə susuzluqdan yanıb qurumuş ağaclar, qəddarlığın şahidi kimi hər addımbaşı rast gəldiyimiz kötüklər, budanmış budaqlar, doğranmış fidanlar buranı ağac qəbiristanlığına oxşadırdı. Bu ahıl adam hər ağacın, hər kolun, hər kötüyün az qala başına dolanaraq adamların insafsızlığından, qatilliyindən, amansızlığından elə yana-yana danışırdı ki, onun təbiətə bəslədiyi bu istəyə, bu sevgiyə heyrət etməyə bilmirdim. Gözləri yaşla dolmuşdu, bir az sorğu-suala tutsam, ağlayası idi. Ona görə də dillənmirdim.



– Meşəni bu kökə salanlar təbiət parazitləridir. Belə adamlarda ürək yoxdur, ürək yerinə sinələrindən çaylaq daşı asılıb. Onlar «of!» demədən Vətəni də bir göz qırpımında satmağa hazır olan mənliksiz, şərəfsiz adamlardır. Adam da öz oturduğu budağı kəsərmi?

Sonra o, hər gün neçə-neçə ağacın susuzluqdan yanıb quruduğundan, 10-15 ilə burada heç nə qalmayacağından kövrələ-kövrələ danışdı.

– Əvvəllər Tərtər çayının suyu bu qobularla axaraq meşəyə can verirdi. Neçə ildir ki, daha nə Tərtərdən, nə də bu qobulardan su gəlir. Sərsəng bəndi Tərtər rayonunu yaman günə qoydu! Ağaclar susuzluqdan gözüm görə-görə yanıb külə dönürlər. Əlim heç yana çatmır, harayımı heç kim eşitmir. Meşələrin suvarılması üçün artezian quyularının qazılması bir yana, barı heç olmasa bir su nasosu alıb versələr, ordan-burdan su çəkib bu meşənin təşnəlikdən yanan ürəyinə səpərəm.

…Qocanın xahişini nəzərə alaraq sonralar su nasosu üçün neçə qapı döydüm, xeyri olmadı. Utandığımdan bir daha onun görüşünə getmədim.

* * *

Tərtər meşələri belə amansızlıq görə-görə öz içinə çəkilir, sərhədləri kiçilir. Bir vaxt ayılacağıq ki, sahibsizlikdən «lələ köçüb, yurdu qalıb».

Hazırda sənədlər üzrə, Tərtər rayonunda cəmi 7 kolxozun ixtiyarında 154 hektar meşə sahəsi vardır. Dövlət meşə zolaqları isə 359 hektar sahəni əhatə edir. Bunlardan əlavə, 25 hektar yolkənarı meşə zolaqları mövcuddur. Bunlar statistik hesabatlarda göstərilən rəqəmlərdir. Əslində isə meşələrdə meşəlik qalmayıb. Elə quru rəqəmlərdən də çox şey aşkar olur. 14 il ərzində rayonun Lenin adına kolxozunda 10 hektar, Engels adına kolxozunda isə 3 hektar meşə sahəsi «yoxa çıxıb». Yolkənarı meşə zolaqları 54 hektardan 25 hektara enib. Bu müddət ərzində «İnqilab» və Engels adına kolxozların hər birinin 7 hektar, Lenin adına kolxozun 6 hektar, İliç adına və «Pravda» kolxozlarının hər birinin 3 hektar, M. F. Axundov adına və «Qələbə» kolxozlarının hər biri-

nin 1 hektar yolkənarı meşə zolaqlarının bütünlüklə məhv olması, «Oktyabr» kolxozunda 4 hektar, N. Nərimanov adına kolxozda 1 hektar yolkənarı meşə zolağının azalması bu sahəyə məsul olan şəxsləri az da olsun narahat etməmişdir. Meşələrdə və meşə zolaqlarında seyrəkliyin bərpası unudulub, ağacları doğranan talalar şəxsi biçənək sahələrinə çevrilib, meşəçilərə «gözün üstə qaşın var» deyilmir, ziyankarlara qarşı ciddi mübarizə aparılmır. Onlara sərbəst şərait yaradılmışdır. «Pravda» və «Nizami» kolxozlarında olan meşə sahəsinin 10 hektarı məhv edilmiş, yerində kənd təsərrüfatı bitkiləri əkilmişdir.

Tərtər rayon Təbiəti Mühafizə Cəmiyyətində və rayon aqrar-sənaye kombinatının yer quruluşu şöbəsində mənə bildirdilər ki, rayonumuzun ərazisində yerləşən 359 hektar dövlət meşə zolağının yalnız 38 hektarı meşə yaşıllaşdırma idarəsinə məxsusdur. Qalan 259 hektarı Qarabağ – Şəki Dövlət meşə zolağından, 62 hektarı isə Bərdə Dövlət meşə zolağından ibarətdir. Qəribədir ki, Tərtər rayonunun ərazisində yerləşən dövlət meşə zolaqlarına Bərdə, Yevlax və Xaldan meşəçilik təsərrüfatları nəzarət edirlər. Belə yerdə atalar yaxşı deyib: «Nə gedir bağdan gedir, bağbandan nə gedir?». Görəsən, ola bilməzmi ki, Tərtərin meşə zolaqları elə onun öz təşkilatlarının ixtiyarına verilsin, dərd-sərini də rayon özü çəksin?

«Goranboy – Tərtər» və «Tərtər – Ağdam» magistral yollarının kənarlarında olan ağaclar kilometrlərlə «yaşıl tunel»lər yaradırdılar. Bu «yaşıl tunel»lərin ağac «hörgüləri» yavaş-yavaş sökülür. Bunun qarşısı vaxtında alınmasa, təbiətin belə bir möcüzəsinə də tamarzı qalacağıq.

Meşələrin dilsiz harayını eşitmək, onları məhv olmaqdan qorumaq, bərpa etmək və yenidən həyata qaytarmaq hamımızın borcudur. Çünki meşələr bizim həyatımızı qoruyur.

**«Salam» qəzeti,**
**1991-ci il.**



# MARAQLI ADAMLAR

***(1, 631, 284, 678 manat pulun sahibi)***

Qəribəliyi çoxdur onun. Ovqatının nədən və nə vaxt dəyişdidiyini hiss edib duymaq mahal işdir. Hamıdan seçilən mənəvi dünyası və bu mənəvi dünyasında təkcə özünə məxsus ümidli işıq çəhlimləri var. Mənə elə gəlir ki, onu öz həmişəsakit məhvərindən çıxarmaq üçün yalnız Azərbaycan xalqının qaragünlü taleyilə bağlı fikir mübadiləsində azacıq tərsinə mövqe tutmaq kifayətdir – bu anlarda Fəxrəddini tanımaq olmur, bulaq təbiəti getgedə qasırğalanır, təlatümlü, fırtınalı ümmana dönür, mövqeyini «rəqibinə» inadla isbat etməyincə aramlaşmır, «rəqibi» məğlubiyyəti boynuna alandan sonra da gərilmiş əsəbləri bir müddət tarımlığını yumşaltmır. Sakitləşib məcrasına qayıdanda olur əvvəlki həlim, həssas, yüksək etika və mədəniyyətə malik Fəxrəddin Abbasov.

Etiraf edirəm ki, həmişə onun gürşadlı, tufanlı anlarında uzaqda olmağa çalışmışam – uzun illərin haqqı-sayına, hörmətinə xələl gətirə bilən püskürtülərdən çəkinmişəm. Öz yurdunun, öz xalqının taleyi üçün onun kimi rahatsız olanları az görmüşəm. Qeyri-adi xasiyyəti və inadcıllığı, gələcək məqsədi və amalı uğrunda mübarizəsi onun 37 yaşına subaylıq «taxtında» gəlib çıxmasına səbəb olub. İndi də «ömür-gün məsələsi»ndən danışanda tez mövzunu dəyişir, istiqaməti xalqla, kitabla, pulla bağlı məcralara yönəldir.

Pulu hər şeydən çox sevir desəm, səhv etmərəm. Həqiqətən də Fəxrəddinin bir milyard altı yüz otuz bir milyon iki yüz səksən dörd min altı yüz yetmiş səkkiz manat nağd pulu var. Onları saymaqla qurtarmaq olmur. Bəlkə də bu pulların içərisində tarixin bizim üçün hələ də naməlum olan açılmamış səhifələri uyuyur. Bunların hər biri haqqında ayrıca tarixi şərhin qəzet məqaləsinin imkanından çox-çox uzaqlığını başa düşürəm. Lakin bəzi faktların üzərindən sükutla keçmək olmur.

…Hicriylə 150-ci ildə (767-ci ildə) Bərdədə Abbasilər xəlifəsi Əl-Mənsur dövrünün incə zövqlə, zərif xətlə işlənmiş, üzərində

«Allahdan başqa Allah yoxdur, Məhəmməd onun rəsuludur» sözləri yazılmış gümüş döymə pul – dirhəm.

Üz tərəfində it şəkli əks olunmuş Elxanilər (İlxanilər) dövlətinin hökmdarı Əbu-Səidin (1305-1335) hökmranlığı dövründə buraxılmış mis pul. Arxa tərəfində dörd xəlifənin (Əbubəkr, Ömər, Osman, Əli) adları yazılan Marağada kəsilmiş mis pul…

Elxanilər dövlətinin əsası Monqol xanı Çingiz xanın nəvəsi Hülaku xan tərəfindən qoyulmuşdur. 1316-cı ildə atası Sultan Məhəmməd Ölcaytunun vəfatından sonra 12 yaşında hakimiyyətə gələn Əbu-Səidin hökmranlığının ilk illərində bütün idarə işləri Əmir Çobanın əlində cəmləşmişdi.

1318-1319-cu illərdə Xorasanda Cağatay şahzadəsi Yasavur Əbu-Səidə qarşı çıxdı – Qızıl Orda xanı Özbək Azərbaycan ərazisini ələ keçirmək məqsədilə şimaldan hücuma keçdi və Kür çayınadək irəlilədi. Misir sultanı da Elxanilərə qarşı müharibə elan etdi. 1327-ci ildə Əmir Çoban öldürüldü. 1335-ci ildə Azərbaycana yenidən hüsum edən Qızıl Orda xanı Özbəyin qarşısını almaq məqsədilə Qarabağa gələn Əbu-Səidi narazı əmirlər zəhərləyib öldürdülər.

Əbu-Səidin dövründə qızıl, gümüş və mis pullar kəsilmişdir. Fəxrəddində həmin pulların bəzi nümunələri vardır.

Hicriylə 780-ci ildə (1378 – 1379) kəsilmiş gümüş sikkənin səthində soldan-sağa ərəbcə yazılıb: «Əlahəzrət Hüseyn xanın (Cəlal Əd-Din) hökmranlığı dövrü», mərkəzdəki beşguşədə isə «Qoy onun hökmranlığı uzunömürlü olsun» sözləri həkk olunmuşdur. Sikkənin arxa tərəfində isə «La ilahə illəllah, Muhəmmədən Rasulullah» yazılmışdır. Sikkənin kəsilmə yerinin Təbriz olduğu göstərilmişdir.

Fəxrəddinin kolleksiyasında Cəlal Əd-Dinin dövrünə dair 11 sikkə vardır. Cəlal Əd-Din Hüseyn Sultanın atası Cəlairilər dövlətinin hökmdarı Şeyx Üveysin 1374-cü ildə ölümündən sonra hakimiyyətə gəlmişdi. O, Sultan Hüseyn Arran və Muğanda hərbi qüvvə toplayan qardaşı Əhməd tərəfindən 1382-ci ildə Təbrizdə öldürülmüşdür.

Peyğəmbərlikdən sonrakı dövrləri əhatə edən pulların hər biri beləcə keçmişimizə bələdçilik edə bilər. Sikkələrin çoxunun



üzərində uzun zamanın hələ poza bilmədiyi ərəb və fars dillərində yazılar qalır və məncə, tarixi dəyər baxımından əvəzi olmayan bu pulların araşdırılması gərəkli nəticələr verər.

…XVII əsrdə anonim mis pullar daha çox Tiflis, Gəncə, Şamaxı şəhərlərində və digər bölgələrdə geniş yayılmağa başlayır. «Milyardçı» Fəxrəddində belə pullardan biri – üz tərəfində nəfis at şəkli qabarıq əks olunan, 1704-1705-ci illərdə Gəncədə buraxılan və indiyədək yaxşı qalmış mis pul da vardır.

Azərbaycanı Rusiyanın müstəmləkəsinə çevirən bədnam «Gülüstan» və «Türkmənçay» müqavilələrindən sonra bizim ərazidə kirill əlifbası ilə yazılan rus pulları yayılmağa başlamışdır.

Hər bir ifadənin tarixi mənşəyi olduğu kimi, pul adlarının da özünəməxsus mənşələri vardır.

Monqol-tatarlar o zamanlarda öz dirhəmlərini həm də «tanqa» adlandırmışlar. Bu sözdən «denqa» və indi rusların işlətdikləri «denqi» sözü meydana gəlmişdir.

Pul sözü rus dilinə türk dillərindən keçmişdir. XIII-XV əsrlərdə pul Qızıl Ordanın mis sikkəsi olmuş, XV-XVI əsrlərdə isə ruslar özlərinin xırda mis pullarını «Pulo» adlandırmışlar.

«Rubl» rusca «rubit» (kəsmək) felindən yaranmış və pul kəsmək mənasını daşımışdır.

Moneta (bizim ifadəmizdə manat) Qədim Roma ilahəsi Yunona Monetanın adından yaranmışdır. İmperator Domitiananın dövründə «moneta» ilk dəfə pul vahidi kimi işlənmişdir.

Azərbaycan Sovet Ensiklopediyasında göstərilir ki, «Moneta» termini XIII əsrdə Novqorodda yarım qrivna (təqribən 200 qram gümüş külçə) adı ilə meydana gəlmiş, 1534-cü ildə Rus dövlətinin pul vahidinə çevrilmişdir (VI cild, səh. 338-339, 1982-ci il).

Halbuki XVIII əsrin başlanğıcına kimi rus dilində «moneta» sözü, ümumiyyətlə, işlənməmişdir. ASE-nin tərtibçiləri «rubl» termini ilə «moneta»nı dəyişik salıblar.

Qəpik – rusca «kopeyka» sözünün azərbaycanca qarşılığıdır.

1534-cü ildə Novqorodda gümüşdən kəsilməyə başlamış pulun üstündə əli nizəli atlı təsvir olunduğundan ona «kopeykoy» (nizəli pul) deyirmişlər. Bu termin sonradan qısaca olaraq «kopeyka» adlandırılmışdır.

I Pyotrun dövründə ilk dəfə mis qəpik pullar tədavülə buraxılmış (1704-cü ildə) və həmin pulların kəsilməsi müəyyən fasilələrlə 1916-cı ilə kimi davam etmişdir.

İnqilabdan sonra 1921-ci ildə «900 prob» gümüşdən manatlıq və «poltinnik» (yarım manatlıq), «500 prob» gümüşdən isə 10, 15, 20 qəpiklik pullar, 1924-cü ildə misdən yarım (1/2), 1, 2, 3 və 5 qəpikliklər buraxılmağa başlanır…

Fəxrəddin Abbasovun pullarının özləri qədər də tarixi qaynaqları zəngindir.

Caynaqlarında imperiyanın hökmranlıq rəmzlərini tutan, yırtıcı və həris gözlərini eyni zamanda həm Şərqə, həm də Qərbə dikmiş ikibaşlı taclı qartalın xofu pullara da hopub.

Rusiyada ilk dəfə kağız pul 1769-cu ildə buraxılıb. Üzərində I Pyotrun şəkli olan 1912-ci ilin «500-lüyü» («palazqulaq» deyərmişlər), II Yekaterinanın şəkli olan 1912-ci ilin «100-lüyü», III Aleksandrın şəkli olan 1909-cu ilin «25-liyi», 1898-ci ilin 1, 1905-ci ilin 3, 1909-cu ilin 10 manatlıqları «xəzinəni» zənginləşdirir. 1916-cı ildə xırda mis pulların yerinə tədavülə buraxılmış, üzərində 1, 5, 50 «kopeek» yazılmış xırda kağız pulların hər birinin öz maraqlı tarixçəsi vardır.

1917-ci ildə çar hökumətinin süqutu və müvəqqəti hökumətin yaranması ilə əlaqədar buraxılan kağız pulların üzərlərindəki emblemlərdəki ikibaşlı qartalın tacı və caynaqlarındakı imperiya rəmzləri götürülür, qartalsa saxlanılır.

Fəxrəddinin «xəzinəsində» 1917-ci ilin 250 və 1000 manatlıq pulları, müvəqqəti hökumətin başçısı Kerenskinin şərəfinə xalq arasında «kerenki» deyilən 20 və 40 manatlıq pullar da özlərinə layiq yerlər tutmuşlar. 1918-ci ildə Daşkənddə Türküstan diyarının 10 sum dəfərində pulu, Don hərbi atamanı Matvey İvanoviç Platovun şəkli həkk olunmuş 250 manatlığı, Ukrayna Xalq Respublikasının 500 və 2 qriveni, Sibir Müvəqqəti hökumətinin 5 manatlıq kredit nişanı da vardır.

1919-cu ildə ilk Sovet kağız pulu olan hesab nişanları buraxılır. Onlar rus və dünyanın 6 xalqının dilində «Bütün ölkələrin proletarları, birləşin!» şüarı yazılmış ilk pullardır. Həmin ilin dekabrında 15, 30 və 60 manatlıqlar, 1920 -1921-ci illərdə isə



RSFSR-in 100.000, 10.000, 5.000, 1.000, 500, 250 və 100 manatlıqları tədavül olunur. Belə yüksək məbləğli pullar ölkədə «pul aclığı» yaradır – onları xırdalamaq probleme çevrilir. Həmin dövrlərdə qiymətlər son dərəcə artmışdı. 1921-ci ildə Moskva bazarlarında unun pudu (1 pud=16 kq) 140.000, taxılın pudu 192.000, kartofun pudu 20.600 manata satılırdı. Əhali pulu az qala kisələrdə və iri çantalarda gəzdirməli olurdu.

**«Salam» qəzeti,**
**1992-ci il.**

# ÖZ SƏHVLƏRİMİZ DƏ AZ DEYİL

Azərbaycan Vətən Müharibəsi Veteranları Birliyinin strukturu get-gedə şaxələnir, təşkilatlanması davam edir. Lakin yerlərdə işlərin gedişi qarşıda duran vəzifələrlə müqayisədə ləngdir, qənaətbəxş deyildir. Doğrudur, Azərbaycanın indiki taleyüklü günlərində imkanların məhdudluğu bir çox problumlərin həllinə tikanlı çəpərdir. Lakin elə işlər var ki, onları həll etmək olar, daha problemə çevirmək yox.

AVMVB-nin ilk qurultayında Birliyin sədri Altay Məmmədov qeyd etdi ki, «…cəmiyyətdə öz problemləri, çəkisi, sözü olan, döyüş yolu keçmiş bir nəsil yetişmişdir və onu nəzərə almamaq, onunla hesablaşmamaq məntiqsizlikdir, ədalətsizlikdir və təhlükəlidir».

Yerli çinovniklərin əməlləri bu fikrin tərs üzüdür. Yəni səlahiyyət sahibləri döyüşən gəncliyə həqarətlə və laqeyd baxmaqdan hələ də əl çəkməmişlər. Süründürməçilik psixologiyası tamah azarı ilə birləşib döyüşmüş gənclərə əziyyət verir, mənəvi əzablara məruz qoyur və onları bezdirir.

Tərtər rayonunda da belədir.

Bu yaxınlarda həmin rayonun Seydimli kəndində veteranların özək təşkilatını yaratmaq məqsədilə keçirilən tədbirdə AVMVB MİK-nin sədri Kamil Şirinovla birlikdə eşitdiyimiz sözlər bizim apardığımız işin hansı mərtəbədə olduğunu açıqladı. Həmin kənddən prezidentin son çağırışı ilə bağlı 120 nəfərə yaxın gənc könüllü olaraq ön cəbhəyə getmiş, 3 aya qədər qızğın və gərgin döyüşlər aparmış, şəhidlər vermiş, yaralananlar olmuş və atəşkəslə əlaqədar olaraq geriyə – mülki həyata qayıtmışlar. İndi isə «Bermud üçbucağı»nı təşkil edən hərbi komissarlıq, hərbi hissə və arxiv arasında nəticəsiz qalan, sonu görünməyən yol ölçürlər, lakin döyüşdüklərini təsdiq edən bir parça kağız ala bilmirlər. Hara üz tuturlarsa eyni süründürməçilik, eyni kobudluq və eyni təmənna. Belə məqamda bu dünyanın qəribə işlərinə naşı olan veteran döyüşdüyünə görə neyləsin? Hələ bu, bircə kəndin timsalıdır. Bəs bu rayonda 45 kənd varsa?

Kimə məlum deyil ki, Tərtər ən dəhşətli döyüş meydanı olmuşdur? Əslində bu rayonun bütün əhalisi düşmənlərlə vuruşmalarda iştirak etmişdir. Lakin 300 nəfərə yaxın şəhid verən Tərtərdə heç 300 nəfər veteran qeydə alınmayıb. Halbuki bundan 20 dəfə, 30 dəfə çox veteran var. Sabiq döyüşçülərin özləri bürokratik sədləri keçə bilmir, pisikir, onlara isə kömək edən yoxdur. Buna görə də vuruşan gənclərə təsəlli verməyə belə haqqımız qalmır.

Əgər döyüşmüş nəsli «…fayda gətirən, problem yaradan yox, problemləri həll edən bir qüvvəyə çevirmək məqsədilə AVMVB yaranıbsa» və onun vəzifəsi «sağlam düşüncəli, vətənpərvər… rəhbərlərinə, qanunlarına itaət etməyi bacaran nəsil formalaşmasına kömək etməkdirsə», bəs yerlərdə vəziyyət niyə belədir? Açığını deyim, Vətən Müharibəsində iştirak edən gənc veteranların çoxunun hələ də xəbəri yoxdur ki, respublikada veteranlar birliyi var, onun «Fədai» adında orqanı var və yerlərdə şöbələri fəaliyyət göstərir.

Digər bir məsələ də narahağlıq doğurmaya bilmir. Qurultay materiallarının yerlərdə müzakirəsi hələ də təşkil olunmayıb. Veteranların özlərinə məlum deyil ki, onların hüquqları və vəzifələri nədən ibarətdir, hansı normativ aktlarla bunlar təsbit olunur?

Birliyin yerlərdəki şöbələrinin fəaliyyəti, demək olar ki, hiss olunmur. Ciddi bir vəzifə olan özəklərin yaradılması məsələsinə rayonlarda məsuliyyətsiz münasibət var. Məsələn, Tərtər rayonunda indiyədək cəmi 3-4 kənddə özək təşkilatı yaradılmışdır ki, əslində bu da formal xarakter daşıyır. Bunu yenə bir yana yozmaq olar. Bəs hələ də Birliyin şöbələri yaradılmayan rayonların veteranlarının qayğıları haqqında nə deyək? Ümumiyyətlə, döyüşmüş gəncliyə münasibətdə öz səhvlərimiz də az deyil.

Qurultayda qəbul edilmiş AVMVB-nin yeni nizamnaməsi strukturların fəaliyyəti üçün geniş imkanlar açır. Yerlərdə bu imkanlardan səmərəli istifadə etməyi bacaran kadrlar seçilməli və onlara işləmək üçün normal şərait yaradılmalıdır. Veteranları işsizlik bəlasından qismən də olsa xilas etməyin yollarını isə tor-

paq sahələrinin ayrılmasında, istehsal yönümlü obyektlərin və təsərrüfatların təşkil edilməsində, ümumiyyətlə, onlara iş yeri tapılmasında axtarmaq gərəkdir. Əlbəttə, möhtərəm sədr Altay Məmmədovun təbirincə desək, «bizə bir loxma verən yox, onu qazanmağı öyrədən lazımdır». Əgər öyrədən yoxdursa, deməli, biz özümüz dişimizlə-dırnağımızla loxmamızı qazanmalıyıq. Çünki indiki zamanda kimdənsə nəyisə gözləmək boş xülyadan başqa bir şey deyildir.

**«Fədai» qəzeti,**
**1996-cı il.**



# YAXŞI İŞLƏRİNİZ ÇOXDUR, AMMA...

Hörmətini uca tutduğum əziz Məmməd Aslan!

Baş redaktoru olduğunuz «Ekran-Efir Həftəliyi»nin məndə doğurduğu mənəvi duyğuları Sizinlə və qəzetinizin oxucuları ilə paylaşmaq istəyinə daxili bir ehtiyac yarandığından bu məktubu yazmaq qənaətinə gəldim. Və mənə elə gəlir ki, buradakı səmimi sözlərimin ayrı bir yozumu fikrinə düşülməyəcək.

Öncə onu deyim ki, Sizin redaktə etdiyiniz həftəlik, əvvəlki məhdud və dar proqram qəlibindən daşıb çıxaraq maraqlı və çox oxunaqlı bir qəzetə çevrilib. Bunun üçün, əlbəttə, Sizin zəhmətinizə minnətdar olmalıyıq. (Respublikamızın indiki «qəzetlər çayırlığında» az bir vaxtda belə hörmətə, izzətə sahib olmaq asan iş deyil).

Gözlərimin şahidiyəm ki, həftəliyinizin hər sayını nəinki teleradio həvəskarları, həm də çoxsaylı oxucular hiss olunası bir intizar və hövsələsizliklə gözləyirlər. Ən ümdəsi budur ki, onun səhifələrində ovsunlu dilimizin sığalı, zərifliyi, saflığı, zənginliyi, bütün dillərdən varlı, barlı-bəhrəli olduğu həyati qaynaqlarla isbata yetirilir, məqamında və yerində işlənməyən, ovxardan salınaraq unudulmaq təhlükəsinə düçar edilən hər kəlməmiz uğrunda az qala «üsyan qaldırılır».

Qəzetinizi oxuduqca Allaha şükürlər edirəm ki, nə yaxşı zaman-zaman yaltaq və manqurt başbilənlərimizin xalqımızın mənəvi dayağı olan urvatlı dilinə yağı münasibəti və heç bir düşmənin onlar qədər vura bilmədiyi zərbələr bu qızıl dilin öz mənşəyinin – azəri türkcəsinin sanbalını qoruyub saxlayan hünər sahiblərini təntitməmişdir! Əlifbamızın başına gətirilən müsibətlər, dilimizə zorla pərçimlənən əcnəbi sözlər bu dilin zahiri görüntüsünü korlasa da, onun cövhərindəki dəyərdə aşınma yarada bilməmişdir.

Qəzetdə az bir vaxtda, ilk baxışdan bəlkə də nəzər-diqqətdən yayına biləcək, lakin mahiyyətcə özüllü yenilik kimi dəyərləndirilməli olan söz dəyişilmələri dilimizin özünə qayıdışı və uyarlı tətbiqi kimi təqdirə layiqdir.

Oxucu ovqatına təsir gücünə görə yazılara seçdiyiniz başlıq-

lar da xalqımızın incilər qaynağından maraqlı bəhrələnmələrdir: «Söz gəlişi», «Ay maşallah», «Məzə», «Hey, gidi dünya…», «Mıs-mısın Mustafası», «Aslanın erkəyi, dişisi olmaz», «İgid ölər, adı qalar», «Haqqın dərgahı», «Nə şiş yansın, nə kabab», «Bu gedən eldən gedir…» və i.a. Bunlarla çiyin-çiyinə «Teleradiolətifələr», «Dilimiz – mənəvi diriliyimiz», «Nə ömrə acıyır, nə yaşa dünya», «Ötən verilişlərin işığında», «Telehəftənin çaparaq söhbəti», «Telemüjdə» başlıqları ilə işıq üzü görən yazılar «söz aclığına» urcah olan oxucuların qəzet-jurnal yağmurunun gurluğunda tarıma çəkilən əsəblərini yumşaltmaq təsirinə malik yazılardır.

Proqrama salınmış hər bir veriliş haqqında həftəlik az qala öncədən ayrıca açıqlama verməyə çalışır. Bu isə, şübhəsiz, yaxşı haldır, oxucu marağına güzgü tutur.

Ümumiyyətlə yaxşı işləriniz çoxdur, amma…

Möhtərəm Məmməd Aslan!

Mənə elə gəlir ki, bir sıra verilişlər və qəzetinizin haqqında bəzi təklif və iradlarımı da söyləsəm, bu məktubun səmimiliyinə xələl gəlməyəcək.

Birincisi, Sizin teleradio şirkətiniz nə vaxt sözlərimizi ekrandan şil-küt hala salan, necə deyərlər, «pəltək» diktor və aparıcılardan yaxasını qurtara biləcəkdir? Elələrini televizora çıxarırlar ki, vallah, adamın əti tökülür, mətni heç üzündən oxuya bilmirlər. Bu, kadr qıtlığıdırmı? (Xalqımıza olmazın iftiralar seli yağdırdığına görə doğru eləyib bəyənmədiyimiz «Vesti» proqramının, ümumiyyətlə, «Rossiya» və «Ostankino» proqramlarının diktorlarına adam həsəd aparır. (Türkiyənin verilişlərini demirəm hələ). Məncə, dilimizi göz bəbəyi kimi sevən Məmməd İsmayıl bu dözülməzliyə bir əncam çəkəcəkdir.

Bəzi qadın müğənnilərimiz mahnı ifa edərkən ayırd etmək olmur ki, oxuyan bizim müğənnidir, yoxsa hansısa xarici bir ölkədən qonaq gəldiyinə görə hörmət göstərilib televiziyaya (və ya radioya) çıxarılan və dilimizi bilməyən bir oxuyan? Heç bir moda ülgüsünə sığışmayan geyimləri (Siz aparıcılar haqqında bu barədə yazmısınız), mədəniyyətsiz səhnə mədəniyyətləri bir yana, əndamlarını oynada-oynada yersiz, şit və düşük hərəkətləri ilə nəyi və kimə nümayiş etdirməyə çalışırlar? Bəziləri isə elə bil yalnız bər-bəzək əşyalarını nümayiş elətdirən kuklalardır. Axı, bizim bütün millətlərə örnək ola biləcək öz mənəviyyatımız, öz tərbiyəmiz, öz abırlı dədə-baba qayda-qanunlarımız var!



Birdən televiziyada o qədər bəsit, o qədər süni və o qədər quru görüntülərə baxmaq məcburiyyətində qalırıq ki, adamın özünə də, bu verilişi hazırlayana da yazığı gəlir. O dəqiqə hiss olunur ki, bu verilişin «donu» əvvəlcədən «qayçılanıb tikilib», yəni ki, mən bunu deyəcəyəm, sən onu, mən burdan gələcəyəm, sən ordan… Mənə elə gəlir ki, belə basmaqəlibçilikdən bir yolluq yaxa qurtarmaq lazımdır.

Bilirəm, respublikamızda televiziyanın və radiounun problemləri, dərdi-səri çoxdur. Lakin elə işlər var ki, özümüzdən asılıdır.

Hörmətli dostum!

Qəzetinizdə onsuz da «qanını başına alan» müəlliflərin cürətli materiallarına geniş yer verirsiniz. Əlbəttə, «Ya həqiqəti söylə, ya sus!» məramını özünə məqsəd seçən qəzetin mayası beləcə həqiqətdən yoğrulmalıdır.

**1996-cı il.**

# HALAL BORC

Dünyanın qəribə işləri varmış – 72 yaşın ola-ola, 1 yaşını qeyd eləyirik bu gün. Niyə? Çünki bu dünya durduqca nadanlar da olacaq. O nadanlar ki, rəhmətliklər Həsən bəy Zərdabi, Mirzə Ələkbər Sabir, Cəlil Məmmədquluzadə… onların əllərindən dad döyüblər və indi də dad döyürük. Amma xeyirxahlar da az deyil.

… SƏNİN haqqın çoxdan mənim boynumdadır. 17 yaşım varıydı qolumdan tutub mənə yol göstərəndə, çörək sahibi eləyəndə, qələmlə yox, ürəklə yazmağı öyrədəndə – körpəyə «ana», «ata» sözlərini öyrədən kimi.

«Beynimin qan vaxtı» mən hardan bilərdim ki, bu dünya deyilən nədi? Yavaş-yavaş ruhuma hopdurdun, dərk etdirdin mənə fani dünyanın həyat fəlsəfəsini. O vaxtlar hələ acını-şirini də elə dadmamışdım. Hələ addımlarım körpə qədəmləri kimi inamsızıydı. Arxa oldun mənə, dumanlı arzularıma işıq tutdun, ömrümün səmtini göstərdin, kim olacağımı manşırladın.

Əmək kitabçamda 1967-ci ildə yazılan ilkin iş yerim, öz zəhmətimlə qazandığım ilk halal çörəyim də SƏNİN adınla bağlı oldu. Nə qədər ki, yaşayıram, özümü borclu bilirəm sənə. Bu borc o biri borclardan deyil, mənəvi borcdur, haqq-say borcudur, ha-lal borcdur.

SƏNİN də həyatın keşməkeşlərdən keçib, təlatümlü qasırğalar görmüsən. Göz açdığın gündən başına nələr gətirmədilər ki?! Bu ömür yolunda bir adı neçə dəfə dəyişmək olar, axı?! 4 dəfə başına müxtəlif yarlıklar yapışdırdılar, möhürlədilər alnına sevmədyin adları. Əlindən nə gələrdi? Gücün güclərinə çatası deyildi ki? Bəzən yollarında yarğan açdılar, bəzən daş hellədilər üstünə, bəzən də ayağının altında çala qazdılar. Büdrədin, laxladın, silkələndin, amma yıxılmadın. Bu qovğalarda çox əziyyətlər çəksən də, adını dəyişsələr də, əqidən dəyişmədi.

Amma… Dədə Qorqud demişkən: «Deməyəsən qara günlərin qabaqda imiş!»

«Korlar» SƏNİ də kor etdilər, «lallar» dilini kəsdilər, dəyərini bilmədilər, xeyrini başa düşmədilər. Neyləyəydilər ki, o zavallılar, o bədbəxtlər?! Farsların bir ibarəsi var: «Necəsən qanmayım dədən yansın», «Dədəni yandırdılar» (Qanmaq, qanmamaq adamın özündən asılı deyil ki?! Gərək qanının genlərində olsun).

7 il bundan əvvəl asdılar SƏNİ dar ağacından, zorla öldürdülər SƏNİ. 7 il meyidini belə axtarmadılar. Barı, bir dəfə də olsun yadlarına salmadılar ki, axı, 64 il bu elə, bu obaya xidmət etmiş, tarix yaratmış bir varlığı diri-diri niyə basdırdılar, onu araya-ərsəyə gətirən halal adamları niyə peşman etdilər, niyə pərən-pərən saldılar?! Əgər o nankorların özlərini bu günə qoysaydılar (kaş!..) necə olardı?

Dünyanın qəribə işləri varmış, USTAD! Əlbət, mənə verdiyin ilk çörəyi Tanrı yadında saxlayıbmış və boynumda olan minnətindən bir az qaytarmağım üçün özünün məsləhət bildiyi məqamı gözləyirmiş.

2005-ci il iyul ayının 19-da rayonumuza yeni rəhbər gəldi və yerli qəzetin fəaliyyətinin bərpa olunması vacib bir şərt kimi qarşıya qoyuldu…

Vaxtilə SƏN mənim qolumdan tutub, həyatın qoynuna atmışdın, yaşatmışdın məni və işə bax ki, SƏNİN həyata qayıtmağın üçün bir qolundan yapışan xeyirxah əlin sahibi o biri qolundan da tutmağı mənə tapşırdı. Yatsam, yuxuma da girməzdi ki, SƏNİN redaktorun ola bilərəm! Görünür bu dünya bilmədiyimiz bilməcələrlə doludur!

SƏNƏ yenidən nəfəs vermək ağır iş idi. Yurdunu-yuvanı paypüşk etmişdilər, dağıtmışdılar, adınla bağlı hər şeyi yoxa çıxartmışdılar. Görüləsi iş çox idi, tutalğac isə yox. Dözdük. «Dizimizin üstündə» çıxarmağa başladıq SƏNİ. Ağır günlərimizdə yaxın dostlarımız əl uzatdılar bizə.

… İndi bir ildir ki, qolboyun yaşayırıq bu dünyada. Ağrın ağrım olub, sevincin sevincim. Açığını deyim, bəzən tıncıxmışam, ağırlığa tab gətirə bilməmişəm. Lakin adam kürəyində bir qayğıkeş, doğma əl hiss edəndə daha güclü olur. Mən həmişə SƏNİ yenidən həyata qaytaran əlin mehrini kürəyimdə hiss etmişəm. Ona görə də bu gün SƏNİNLƏ birlikdə yaşayırıq. SƏN susanda «Tərtər» idin, dilin təzədən açılanda yeniləşən məskəninə

baxıb, «Yeni Tərtər» adı qoydular SƏNƏ. Yeni adının 1 yaşı mübarək, ƏZİZ USTADIM, ETİBARLI DOSTUM!

Ustadla şagirdin dostluğu baş tutanda, yaşamağa dəyər.

**2006-cı il.**



# SƏNİN DƏ ÜZÜN GÜLƏRMİŞ, TƏRTƏR!

Sənin də üzün gülərmiş, taleyinə gün doğarmış, ulu Tərtər! Yatmış, üstünü hörümçək toru basmış, xətrinə dəysə də deyəcəyəm, ölüm ayağında olan bir məkan idin. Ürəyi olanların yazığı gəlirdi sənə. Zavallıya, yetimə dönmüşdün, fağıra, qəribə oxşayırdın. Elə bil qarğımışdılar sənə, vurğun vurmuşdu səni – qəbir kimi uzanıb qalmışdın. Bunlar sənin günahın deyildi, səni ağlar günə salanların günahı idi. Canıyananın, qayğına qalanın tapılmırdı. Kim gəlirdisə, sanki səninlə ədavətə gəlirdi. Bu günlərdə bir gözəl insanın dediyi kimi: «elə bil qorxurdular ki, birdən Tərtər boy atar, görərlər ki, belə bir cənnət var. Ona görə də hər gələn rəhbər onun başından bir az da aşağı basırdı». Görən o bədbəxtlərin xəbəri varıydı ki, sən xəzinəsən, dəfinəsən. Sənin sadə insanların vətənpərvərdir, safdır, təmizdir?! Neyləyəsən ki, sənin alın yazın bu imiş, Tərtər! O nadanlar, o xəbislər, o «cibbazlar», «pulbazlar», «mənafebazlar» səni respublikada «gözüqıpığa», «yiyəsiz»ə döndərmişdilər. Adın hava haqqında məlumat söyləyən qızın dilindən başqa ayrı dildən eşidilmirdi. Səndən bir az uzaqda – Bakıda, Qubada, Xaçmazda… bəlkə də çoxları elə bilir ki, səni ermənilər çoxdan işğal edib. Çoxu bəlkə də heç adını eşitməyib. Hardan eşitsin ki? Gərək adını çəkən ola.

Bütün dünya oyanışda ikən, xorna çəkib yatmağa məcbur etmişdilər, ətalətin, durğunluğun uzun illərdən qalmış tozu, kifi içində itib-batmışdın. Dörd tərəfindəki inkişafı görməmək üçün gözlərini kor eləmişdilər – bulağın gözünü daş-kəsəklər kor edən kimi.

Lakin içində bir vurnuxma var idi – oyanmaq, çalxalanmaq, püskürmək istəyirdin. Qoymurdular.

Nəhayət… Sənin də üzün gülərmiş, Tərtər! Sənə də sahib çıxan tapılarmış. «Əvvəlin gəlincə, axırın gəlsin» - deyiblər. Sənin də bəxtəvərliyin axıra düşüb. «Gec olar, güc olar». Elə ilk gündən simanda nur göründü, havanın da, suyunun da dadı, tamı ballandı sanki. Hər tərəfin, hər guşən dəyişməyə başladı.

Bu yaxınlarda həmkarlarımdan biri söylədi ki, atalar: «Bir gül ilə bahar olmaz» - deyiblər. Mən isə deyirəm ki, yox, bir güllə bahar olar. Tək bircə bənövşə bəs edər ki, yazın gəlişini bayram edəsən. Bir insan bir mahala yaz gətirə bilərmiş.

Doğrudan da, Vətənin qədirbilən oğullara ehtiyacı çoxdur. Heyiflər ki, tələblə mövcudluq üst-üstə düşmür.

Sanki tərtərlilər bir himə bənd imiş – gözləyirmişlər ki, bir təpərli, bir güclü əlin sahibi onlara dayaq olsun.

İndi Tərtər Murov dağından bahar fəsli çağlaya-çağlaya, daş-dərəni lərzəyə sala-sala baş alıb gələn Tərtər çayı kimi coşub-daşır. Heç bir qüvvə bu çağlayışın qarşısını ala bilməz. Çətini selə dönmək idi.

«Tərtərin bir qarış torpağı da qayğısız, yeniliksiz qalmayacaq!». «Tərtər yaxın zamanlarda gözəl bir kurort şəhərinə çevriləcək!». «Tərtər işıq içində üzəcək!». «Burada sanatoriyalar, «Hotel»lər tikiləcək!». «Tərtər turistlərin sevimli məskəninə çevriləcək!». «Bura bulaqlar şəhəri, fəvvarələr, təbii şəlalələr məskəni olacaq!». «Tərtər gözəllik içində xumarlanacaq!». «Burada bir nəfər də olsun işsiz adam qalmayacaq!». Sənin də qulaqların bu həyəcanlı nidaları eşidərmiş, ay qoca Tərtər! Sən də sevinə bilərmişsən!

İndi Tərtər nəhəng tikinti meydanına çevrilib. Hər qarış torpağı qayğıya möhtac Tərtərin dərd sırsırası yavaş-yavaş əriyir.

Bu, Tərtərin və tərtərlilərin zülmət qaranlıqda boğulan həyatlarına salınan gur işığın mehri və istisidir. Amma bəzi bədxahlar və nankorlar bu işıqdan qorxub, vahiməyə düşüblər. Hansı yarasa işığı sevir ki?

**20. 08. 2005-ci il**



# TƏRTƏRLİ BEHBUD AĞA CAVANŞİR

Stalinin «bu bir il yarımlıq hakimiyyətiniz ərzində xalqa nə verə bildiniz?» sualının cavabında Məmməd Əmin Rəsulzadə demişdi: «Çox şey verə bilmədik… Amma milli azadlığın nə olduğunu başa saldıq. Azca da milli istiqlal dadızdırdıq».

İnsan iki həqiqətə – təbiətə və tarixə xəyanət edə bilməz. Edərsə, böyük itkilər verər.

1918-ci il mayın 28-dən 1920-ci il aprelin 27-nə qədər mövcud olan Azərbaycan Demokratik Respublikasının yada salınmaması üçün düz 70 il çalışdılar. Sonda isə həmin 70 ildə hegemonluq edən imperiyanın özü tarixin səhnəsindən düşürüldü və «Bir kərə yüksələn bayraq bir daha enməz!» amalı ilə yaşayan Azərbaycan xalqı yeni demokratik zəmində mübarizə meydanına atılıb mayın 28-nin Azərbaycan dövlətinin yaranması günü kimi elan olunmasını tələb etdi. Xalqın iradəsi qəbul olundu.

Azərbaycan Xalq Cümhuriyyətinin yaradılıb fəaliyyət göstərməsində bir çox tarixi şəxsiyyətlərin böyük rolu olmuşdur. Türkiyə hərbi hissələrinin komandanı Nuru paşanın siyasi müşaviri Əhməd bəy Ağayevdən tutmuş xalqımızın digər tarixi şəxsiyyətlərinə qədər, o cümlədən Məmməd Əmin Rəsulzadə, Fətəli xan Xoyski və o dövrün başqa məşhur ictimai-siyasi xadimləri Azərbaycan Demokratik Respublikasının qurulması və yaşaması üçün əllərindən gələni etmişlər.

Bunlardan biri də həmyerlimiz, məşhur tarixi şəxsiyyət Behbud ağa Cavanşirdir.

Tərtərli olub, lakin bu gün də Tərtərin özündə belə az tanınan Azərbaycan Cümhuriyyətinin ilk daxili işlər naziri Behbud ağa Cavanşir barədə biz qəzetimizdə yazmışıq. Lakin ictimai reaksiya zəif olub.

Tərcümeyi-halında qeyd olunur ki, Behbudağa Azad ağa oğlu Cavanşir 1886-cı ildə Tərtər nahiyyəsinin Azad Qaraqoyunlu kəndində anadan olmuşdur.

XV əsrin ikinci yarısında Qaraqoyunlu dövləti süqut edərkən onların bir hissəsi Tərtərin bu ərazisində məskunlaşdığına görə kənd Qaraqoyunlu adlandırılmış, sonralar isə bu adın əvvəlinə

Azad ağanın adı əlavə edilmiş, kənd «Azad ağa Qaraqoyunlusu» kimi tanınmışdır.

Azad ağa XIX əsrin ortalarında bu kənddə ağalıq etmişdir. Gördüyü xeyirxah işlər ona Qarabağda böyük nüfuz qazandırmışdır. Bu kənddə indiyədək qalmış tarixi abidələr də Azad ağanın adı ilə bağlıdır.

Sovet rejimi dövründə kəndin adındakı «ağa» sözü silinmiş və Azadqaraqoyunlu kimi rəsmiləşdirilmişdir. Azad ağa Behbud ağa Cavanşirin atası olub.

Azad ağanın tarixi abidələr siyahısına düşmüş evində hal-hazırda kənd xəstəxanası yerləşir.

Kənddəki bu günkü məscidi Azad ağa, oğlu Behbud ağa Cavanşirin sözü ilə tikdirib. Bu bina XIX əsrin tarixi abidəsi kimi qorunub saxlanılır.

Mövsüm Əliyev tərəfindən yazılan Behbud ağa Cavanşirin tərcümeyi-halında göstərilir ki, o, orta təhsilini Tiflis real məktəbində almış, sonra dünyada ilk ali-texniki məktəb olan Almaniyadakı Frayberq Dağ-Mədən Akademiyasını bitirmişdir. O, bu akademiyanın ilk azərbaycanlı məzunudur. Behbud ağa Cavanşir Almaniyadan İngiltərəyə gedərək təkmilləşdirmə kurslarında oxumuşdur. Qərbi Avropadakı həyatı onun bir siyasi və ictimai xadim kimi formalaşmasına təsir etmişdir. Behbudağa Cavanşir alman, ingilis, fransız, rus, gürcü və erməni dillərini mükəmməl bilmişdir.

1916-cı ildə Azərbaycana qayıdan Behbud ağa Cavanşir Bakı neft müəssisələrində baş mühəndis vəzifəsində çalışmışdır. Doğma xalqının maariflənməsi uğrunda mübarizə aparan Behbud ağa Cavanşir tezliklə «Müsəlman xeyriyyə cəmiyyətinin» rəhbərliyinə seçilmişdir. Məşhur messenant Hacı Zeynalabdin Tağıyev kimi, Behbudağa da Rusiyada və Avropada ali təhsil alan bir neçə azərbaycanlı gəncə öz vəsaiti hesabına təqaüd verirdi, ana-dilli mətbuata müəyyən yardımlar göstərirdi. Onun fəaliyyəti çar xəfiyyələri tərəfindən ciddi izlənirdi. 1920-ci ildə Bakıda rusca çapdan çıxmış «Zaqafqaziyada rus siyasətinə dair sənədlər» kitabından (onun digər adı «Qara kitab»dır) aydın olur ki, Behbudağa Cavanşir Əhmədbəy Ağayevin 1905-ci ildə



gizli şəkildə yaratdığı «Difai» partiyasının Mərkəzi Komitəsinə daxil idi. O, «Nicat» cəmiyyətinin və «Rus texniki cəmiyyəti»nin Bakı şöbəsinin üzvü seçilmişdir. Texniki cəmiyyətin elmi əsərlərində Behbud ağa Cavanşirin xeyli məqaləsi çap olunmuşdur.

O, fevral-burjua inqilabından sonra yaranmış Milli Müsəlman Şurası Müvəqqəti İcraiyyə Komitəsinin tərkibinə seçildi.

1918-ci il martın 18-dən 22-dək Stepan Şaumyanın başçılığı altında bolşeviklər tərəfindən milli məsələnin qəsdən düzgün qoyulmaması nəticəsində meydana çıxan qırğında otuz minə yaxın azərbaycanlı həlak olmuşdu. Bu qırğının qabağını almağa çalışanlardan biri də Behbud ağa Cavanşir idi. O, barışıq komitəsinin üzvü idi.

Behbud ağa Cavanşir 1918-ci il iyunun 17-də Gəncədə Fətəli xan Xoyskinin təşkil etdiyi ikinci hökumət kabinəsində daxili işlər naziri vəzifəsini tutmuşdur.

Onun müavini general-mayor Sadıxbəy Ağabəyov idi. Onlar Bakıda, İçərişəhərdə polkovnik-leytenant Şükürbəy Yüzbaşinskinin rəisliyi altında polis məmurları (qorodovoy) məktəbinin açılmasına ciddi yardım göstərirdilər.

1918-ci il oktyabrın 6-dan həmin ilin sonuna qədər Behbud ağa Cavanşir eyni zamanda ticarət və sənaye nazirliyini də idarə etmişdir. O, yerli sənayenin inkişaf etdirilməsinə və Azərbaycanın xarici ölkələrlə ticarət əlaqələrinin yaradılmasına ciddi səy göstərmişdi.

Behbud ağa Cavanşir Azərbaycan parlamentinə üzv seçilmişdi. Həmin ilin dekabrında Fətəli xan Xoyskinin kabinəsi istefaya çıxdığı üçün Behbud ağa Cavanşir tutduğu vəzifələri tərk etmişdir.

1919-cu ildə xarici ölkələrlə ticarət əlaqələri yaratmaq üçün Behbud ağa Cavanşirin yaxından iştirakı ilə Bakıda «Dəyanət» şirkəti yaradılmışdır. 1918-1920-ci illərdə Bakıda təntənəli «Azərbaycan gecələri» konsertinin və bir çox cəmiyyətlərin təşkili onun adı ilə bağlıdır.

1920-ci il aprelin 27-də baş verən hadisələrdən sonra Behbud ağa Cavanşir neft sənayesi sahəsində işləmişdir. Həmin ilin axırında Nəriman Nərimanov müasir neft-mədən avadanlığı almaq

üçün onu Almaniyaya ezam etmişdir. Behbud ağa Cavanşir yolüstü İstambulda dayanaraq, o vaxt Malta adasında sürgündə olan həmyerlimiz Əhmədbəy Ağayevin evində yaşamışdı. Görünür o, bolşevik əsarəti altındakı vətənilə həmişəlik vidalaşmaq qərarına gəlmişdi. Çünki uzaq səfərə xanımı Tamara Cavanşir, qardaşları Surxay xan və Cəmşid xan ilə birlikdə çıxmışdı.

1921-ci il iyul ayının 18-də gecə saat 23 radələrində «Perepalas» hotelinin yaxınlığında «Daşnaksütyun» partiyasının üzvü, erməni özünümüdafiə alayının döyüşçüsü və Ermənistan ordusunun keçmiş əsgəri Misak Torlakyan tərəfindən həmyerlimiz Behbud ağa Cavanşir güllə ilə qətlə yetirilmişdir.

Azərbaycan Demokratik Respublikasının banilərindən bir çoxunun adı haqlı olaraq əbədiləşdirilmişdir. Bizim fikrimizcə, həmyerlimiz, Azərbaycan xalqının azadlığı uğrunda daim mücadilə aparmış və bu müqəddəs yolda da öz canını qurban vermiş Behbud ağa Cavanşirin xatirəsinin əbədiləşdirilməsi bu mübariz incanın ruhu qarşısında alnıaçıqlığımız üçün bir şərt olardı.

**2008-ci il.**



# TƏRTƏRİN ƏDƏBİ MÜHİTİ HAQQINDA

Tanrımız Tərtərdən heç nəyi əsirgəməyib, hər şeyi bol əliylə verib. Buranın təbiəti qədər insanları da gözəldir, safdır, səmimidir. Tərtər dağ ətəyində süslənir – nə arandır ki, istisində pörşələnəsən, nə dağdır ki, soyuğunda qarsalanıb bezar olasan. «Dağ ətəyi – xan ətəyi». Burada hər vaxt gözəlliklər bir-biriylə qolboyundur – qışda da, yayda da, yazda da, payızda da. İndi daha da füsunkarlaşıb, ovsunlu bir gözələ çevrilib ana yurdum, doğma Tərtərim! Bu yerin nəinki insanları, çayları da, bulaqları da, meşələri də, gülləri-çiçəkləri də, kol-kosları da, hətta daşları da duyğudan, hissdən yoğrulub. Tərtər çayı özü boyda poeziyadır, nəğmədir.

Elə bunlara görə də Tərtərin ədəbi mühiti digər bölgələrdən seçiləndir, çeşidlidir. Lakin təkcə coğrafi mövqe deyil, ədəbi mühitə təsir edən digər amillər də vardır. Və bu amillər mühitin formalaşmasında əsaslı rol oynayır.

Tərtərin ədəbi aləmində iz salan bəzi faktorlara diqqət yetirək.

**Molla Pənah Vaqif** 1750-ci illərdə Tərtərin Sarıcalı kəndinə köçüb gəlmiş və burada 9 il yaşamışdır. O həmin kənddə məktəb açdırmış və məktəbdarlıq – (müəllimlik) etmişdir.

Deyirlər ki, şair tez-tez Tərtər çayının sahilinə enər, bir kötüyün üstündə oturar, qıjıltıyla axan sulara baxıb, xəyala dalarmış və Allah bilir, nələr düşünərmiş!..

Sonralar saray həyatından cana gələn şair arada yenə Tərtərə gələrmiş.

Molla Pənah Vaqifin ölümündən sonra həyat yoldaşı Qızxanım Tərtərə gəlir və Sarıcalı kəndində Hüseyn bəyə ərə gedir.

Dahi Azərbaycan mütəfəkkiri **Mirzə Fətəli Axundov**, 1870-ci illərdə Tərtərdə olmuşdur. O, bu barədə 1875-ci ildə Tiflisdə nəşr olunan «Kafkaz» qəzetində çap etdirdiyi «Səfərdə» adlı məqaləsində müfəssəl məlumat vermişdir. Həmin yazıdan bəzi məqamlar:

«Biz ağır cırıltıyla ötən bir neçə kəl arabasının yanından keçib gedəndə səhər saat 6-ya 15 dəqiqə qalmışdı. İstiyə düşməmək və hava işıqlanana kimi Tərtərə çatıb, orada ***köhnə bir dostumun*** (kursiv mənimdir – **T. Y.**) yanında gecələyib dincəlmək məqsədilə atları tələsdirdik…

Biz meşə sərinliyindən uzaq, geniş, cansıxıcı, əsas yolla gedirdik. Lakin uzaqda Kür və Tərtər tərəfdə sərinlik və bulaq vəd eləyən hündür, qalın meşələr təşnə gözlərimizi oxşayırdı…

Qabaqda, bizdən aşağıda Tərtər haray salır, qaynayıb daşırdı. Adamı vahimə bürüyürdü…

Biz islanmış cücə kimi və düz bir sutkaya yaxın ac halda Tərtər bazarına daxil olanda saat 7-yə işləmişdi. Bazarın meydanından keçib çoxdan arzuladığımız həyət qapısının ağzında dayandıq. Lakin dostumun evinin qapısından kilid asılmış, pəncərələri möhkəm bağlanmışdı…

«Xahiş edirəm, deyin, ***S. B. R.*** (kursiv mənimdir – **T. Y.)** evdə yoxdur ki?» – bu sualla ikimərtəbəli evin balkonunda oturmuş, görkəmindən yerli zədəganlara oxşayan mədəni, cavan bir adama müraciət etdim.

«O, üç gündür ki, yaylağa köçüb, sizə nə lazımdır?» – cavan adam soruşdu.

«Mən onun evində qalmağı nəzərdə tutmuşdum» – dedim.

«İstəyirsinizsə, mənim evimdə qalın» – o mehribanlıqla cavab verdi.

«Bağışlayın, sizin adınız nədir?» – mən soruşdum.

«Bu, vacib deyil, sonra da bilərsiniz» – cavan adam cavab verdi.

«Qonaqpərvərlik üçün sizə minnətdaram, ancaq bağışlayın ki, təklifinizi qəbul edə bilməyəcəyəm» – bunu deyib, geriyə, xırda dükanların yanına döndük ki, orada yağışdan daldalanaq, yeməyə bir şey tapaq…».

M. F. Axundov bu məqaləsində tərtərli aşbaz Zeynal haqqında da xeyli yazıb.

Görkəmli mütəfəkkir **Nəcəf bəy Vəzirov** Petrovski – Razumovski Kənd Təsərrüfatı və Meşəçilik Akademiyasını bitirdikdən sonra (XIX əsrin sonlarında) Gəncədə, Dilicanda və Tərtərdə 15 il meşəbəyi işləmişdir.



**Firudin bəy Köçərlinin** (1863-1920-ci illər). Azərbaycan ədəbiyyatşünaslıq elminin banisi, görkəmli tənqidçi Firidun Əhmədağa oğlu Köçərlinin ulu babası Məhəmməd Cavanşir qəzasının Tərtər mahiyyəsinin Köçərli kəndindəndir. O, 1752-ci ildə köçüb Şuşaya getmişdir.

Burada şəhərin şimal-qərbində yurd salmış və sonralar onların yaşadığı bu məhəllə «Köçərlilər məhləsi» adlandırılmışdır.

Belə görkəmli şəxsiyyətlərin Tərtər və tərtərlilərlə ünsiyyəti şübhəsiz ki, buradakı o dövrlərin ədəbi mühitinə öz təsirini göstərməyə bilməzdi. Lakin, bizim fikrimizcə, həmin zamanlarda kitab çapı çətin iş olduğundan tərtərlilərin yazdıqları, güman ki, «Sandıq ədəbiyyatı»na çevrilmiş, sonralar zamanın axarında itib-batmış, nəsillər dəyişdikcə yaddaşlardan silinib getmişdir. (Çox heyifsilənirik ki, Tərtərin keçmiş ədəbi mühiti haqqında əlimizdə elə bir tutarlı dəlil yoxdur. Kimlərdəsə belə məlumat olarsa, redaksiyamıza təqdim etsələr, böyük xeyirxah iş görmüş olarlar).

Yaxın keçmişin ədəbi mühiti isə Tərtərdə necə coşqun, ilahidəngəlmə təbə, malik söz-sənət sərraflarının olduğunu isbatlayır.

**Məzahir Daşqın.** Axundov Məzahir Həmzə oğlu 1909-cu ildə Tərtər rayonunun Borsunlu kəndində anadan olmuşdur. Atası Həmzənin başına Sovet rejimi olmazın müsibətlərini gətirmişdir. Özünün də taleyi keşməkeşli və məşəqqətli olmuşdur. Alman əsirliyindən sonra xeyli vaxt qərib ölkələrdə yaşamaq məcburiyyətində qalmışdır. Vətənə dönəndə isə Sibirə sürgün olunmuşdur. Dostu Səməd Vurğun onu ölümün pəncəsindən xilas etmiş, himayədarı olmuş, həmişə qayğı və diqqət göstərmişdir.

Məzahir Daşqın çox tanınmış şair olub. Onun həyatı və yaradıcılığı ilə daha yaxından tanış olmaq üçün ölümündən sonra qardaşı, mənim dostum olmuş rəhmətlik Elxanın çəkdiyi yüz əzab-əziyyət bahasına hasilə gəlmiş «Bir zaman can deyib, can eşidərdik…» yeganə kitabını oxumaq gərəkdir.

Məzahir Daşqın təkcə Tərtərin ədəbi mühitində deyil, bütöv Azərbaycanın, hətta Azərbaycandan kənar bir çox ölkələrin söz mühitində öz sambalı, öz çəkisi, öz imzası olan bir şairdir. Onun 1944-cü il də vətəndən uzaqlarda yazdığı «Bülbül» şerini oxumaq

kifayət edər ki, necə duyğulu, necə həssas, necə gözəl bir şair olduğunun sübuta ehtiyacı qalmasın.

**Bülbül**

**Lal gecənin dilsiz çağı**
**Gəl dərdimə qal, ay bülbül!**
**Dözülməzdir hicran dağı,**
**Sən könlümü al, ay bülbül!**

*** * ***

**«Gül, gül!» – deyib, çəkmə ünü,**
**Qəm bürüyər yer üzünü.**
**Xəyal kimi keçən günü**
**Az yadıma sal, ay bülbül!**

*** * ***

**Qəmli dastan bağlamaqdan,**
**Dağı – daşı dağlamaqdan,**
**«Vətən!» – deyib, ağlamaqdan**
**Saçım olub çal, ay bülbül!**

*** * ***

**Nəğmə qoşdum yar eşqinə,**
**Sədaqət ilqar eşqinə.**
**Sən də bir bahar eşqinə**
**Al sazını, çal, ay bülbül!**

*** * ***

**Mən Daşqınam, bu zilləti**
**Verib hicran qiyaməti.**
**Canımda Vətən həsrəti**
**Qoymayıbdır hal, ay bülbül!**

Məzahir Daşqının Tərtər şəhərində büstü ucaldılmışdır.
Onun qəbri doğulduğu Borsunlu kəndindədir.

**Vahid Əziz.** Bizim çox istedadlı, məşhur, dünyanın bir çox ölkələrində tanınan, Tərtər çayı kimi coşqun ilhama, Tanrı dər-



gahına yaxınların təbinə malik, Rəsul Rzadan tutmuş, bütün əzəmətli şairlərimiz tərəfindən xətri əziz tutulan Vahid Əziz Tərtərin ədəbi mühitinə öz əvəzsiz poetik aləmi və məcrasına sığmayan ilham selilə təsir edən, fəlsəfəsində dünyanın sirrləri mürgüləyən bir şairdir. O, ədəbiyyatımıza ilkin olaraq sərbəst şeirlərilə gəlsə də, sonralar heca vəznində elə sığallı, elə kövrək, elə duyğulu, elə zərif şeirlər, yazdı ki!..

Nədənsə, həmişə onun haqqında fikirləşəndə yadıma gəncliyimdən bəri əzbər bildiyim «Tütək» şeirinin iki bəndi düşür:

**Dərə dodaqlarda dağılar sükut,**
**Palıd barmaqlarda səs düyün düşər.**
**Hardasa əriyər bir ovuc bulud,**
**Hardansa yadıma gileyin düşər.**

*** * ***

**Sınıb zirvələrin şah vüqarı da,**
**Dağları nəğmənin ahı tutubdur.**
**Tütək neyləyibsə canavarı da**
**Sürüdən aralı yuxu tutubdur.**

Şərhə ehtiyac varmı?

Vahid Əzizlə şəxsi tanışlığım və cavanlıqdan üzü bəri xatirələrim onun şəxsiyyəti və yaradıcılığı haqqında yazılası bir kitab qədərincədir və bəlkə də bu kitab nə vaxtsa yazıldı.

Vahid Əziz çoxlu sayda kitabların və tərcümə əsərlərinin müəllifidir. Onun şeirlərinə qədərincə mahnı yazılıb. Öz duyğu dünyası ilə «Allaha bəndəlik etməyən» bu şair indi də coşqun sevgilə yazıb-yaratmağındadır.

Öz imzalarını Azərbaycanın ədəbi mühitində çoxdan təsdiq etdirmiş həmyerlilərimiz ***Qaçay Köçərli*** və ***Dilsuz (Mustafayev)*** kimi çağdaş şairlərimizin uğurlu və zəngin yaradıcılıqlarından yorulmadan danışmaq olar. Amma qəzet üçün nəzərdə tutulmuş adi bir yazı bu imkanı vermir.

**Rafiq Nəsirov və Zabil Süleymanoğlu**. Bu iki nəfərin şeirlərini oxuyanda həmişə heyrət etmişəm! «Olanda da belə şair olasan!» həsədi keçib könlümdən.

Rafiqin «Oxşama» şeirindən iki bənd:

**Göz yaşı tək muncuq-muncuq damcılar**
**Axa-axa öz ömrünü qamçılar.**
**O göz yaşı göz ağına qan çilər,**
**Nənəm bulaq, göz yaşına oxşama.**

*** * ***

**Ömür ki, var, insan üçün cirədir,**
**Loxma kimi sanki uşaq kiridir.**
**Rafiq özü göz yaşının biridir,**
**Nənəm bulaq, göz yaşına oxşama.**

Zabil Süleymanoğlunun «Dağlara kimi» şeirindən iki bənd:

**Allah, ötüb-keçdik bir an içində,**
**Nə yolmuş beşikdən məzara kimi?!**
**Bilmədik hər ötən ömürdən imiş,**
**Can atdıq bahardan-bahara kimi.**

*** * ***

**Ağarır saçlarım, yetişir vədə,**
**Bu sevda başımdan çətin ki gedə.**
**Nə ola, sinəmi qartallar didə,**
**Apara qəlbimi dağlara kimi.**

Heç kəs **Füzuli** və ya **Məmməd Araz** ola bilməz ha! Poeziya nəhənglərini yada salanda, adam əlinə qələm almağa utanır. Məsələn, Mirzə Ələkbər Sabiri oxuyan hər kəs özünə şair deməyə xəcalət çəkmirsə, ondan nə desən, gözləmək olar. Amma… Bunları bilə-bilə yazmamaq da olmur.

Mən Tərtərin ədəbi mühitində öz qələmlərinə və öz bacarıqlarına uyğun izi olanların adlarını sadalamaqla kifayətlənməyə məcburam.

## Dünyalarını yaxın zamanlarda dəyişmiş tərtərli yazarlar:



*Cəlal Sultanov, Əmir Hüseynov, Aşıq Mehdi, Sabir Paşayev, Hilal Bayramov, Əjdər Verdiyev, Əmiraslan Qurbanzadə (Şəmsi), Mürsəl Babayev.*

## Çağdaş Tərtər ədəbi mühitinin nümayəndələri Kitabları çap olunanlar:

*Qəşəm Çıraqlı, Qədir Tərtərli, Qələndər Səlimoğlu, Nəcibə İlkin, Zülfiyyə İmdadqızı, Vəli Qaradağlı, Elçin Mahmudov, Firudin Tərtəroğlu, Svetlana Xəyalə, Arif Əzizbəyli, Məhəmməd Mahmudov, Məmməd Kəngərli, Nübar Mədətova, Fizzə Nuriyeva, Səbuhi Rəhimli, Təbriz Vəfalı, Afət Məmmədov, Vüsal Zeynalov, Vüqar Əlişov və başqaları.*

## Digər yazarlar:

*Qərib, Məzahir Nəsirov (Kəskin), Rasim Bayramov, Mirzə Məmmədov, Nizami Muradov (Sənsiz), Tural Əsgərov, Sevinc İrəvanlı, İsrafil Səfərəliyev, Köçərli Hüseynov, Kamal Rəhimli, Dilbər İbrahimova, Ələkbər Şahbazov, Bahar Qəmgin, Nuşirəvan Kərimov, Şəmsəddin Namazov, Qərib Zeynalov və başqaları.*

Yazarların imzalarının sayı da Tərtər ədəbi mühitinin zənginliyinə bir dəlildir. Lakin bu o demək deyildir ki, adları çəkilənlərin hamısı yaxşı yazır, yox, hər kəs öz qabiliyyətinə uyğun, yəni eləsi də var, beləsi də, elə-beləsi də.

Sonda onu da qeyd edim ki, Tərtərdə 1960-cı illərdən yazarları özündə birləşdirən, əvvəlcə «Tərtərin səsi» poeziya klubu adlanan, indi isə həmin adla ədəbi məclisə çevrilən bir birlik fəaliyyət göstərir. Onun sıralarında Tərtər ədəbi mühitinə önəmli təsir edən yazarlar az deyil. Mənim həmmüəllifliyimlə 2007-ci ildə çapdan çıxmış «Tərtər inciləri» kitabında bu yazarların əksəriyyətinin yaradıcılıq nümunələri cəmlənib. İndi həmin məclisin qayğıya çox böyük ehtiyacı olsa da, onun gələcəyinə bağladığımız ümid, inşallah, özünü doğruldacaqdır!

**2008-ci il.**

**"Xoşbəxt bəndə odur ki, köçüb gedəndən sonra da zaman-zaman yaşayır və belə əbədiyaşarlıq müstəsnalara qismət olan tanrı bəxtəvərliyidir".**



# TELEPATİYA
*(Novella)*

Katibə Zilzili xanımın otağının qapısını astaca döydüm. «Buyurun» icazəsini alandan sonra içəri girdim. Təsəvvürümdəki Zilzili xanımla ilk dəfə üzünü gördüyüm Zilzili xanım arasında elə bir ciddi fərq yox idi.

Mənə demişdilər ki, Zilziliyə «xanım»sız müraciət etsən, vay halına, lap 10 dənə türk saqqızı da alıb versən, xeyri yoxdur, işinə pəl vuracaq.

– Salam, Zilzili xanım.

O, ilk dəfə gördüyü məni ifrat istehzalı baxışlarla təpədən-dırnağa nəzərdən keçirəndə şübhələndim və özümə ayaqdan-başa diqqət yetirdim. Hər şey qaydasında idi.

– Salam. – dedi.

Bu «salam» çox soyuq çıxdı, elə bil ağzından buz töküldü.

– Mən «Salam»dan gəlmişəm.

– Hardan gəlmisənsə, özün bilərsən. Sözünün «Mustafa»sını de.

Üzünü çevirib yanındakı «canlı karikaturadan soruşdu:

– Qulam müəllim, beş hərfdən ibarət nəsli tükənməkdə olan zəhmətkeş heyvan.

Özümdən asılı olmayaraq:

– Eşşək, – dedim.

– Malades, düz gəlir!

Zilzili xanım krossvorda «eşşək» sözünü yazdı, sonra üzümə baxdı:

– Deyəsən, çoxbilmişsən ha!

– Mən hər şeyi bilirəm. İnanmırsınızsa, sağ əlinizi mənə verin.

Zilzili xanım süni bir maraqla məni süzdü, «canlı karikatura»ya göz basıb, əlini əlimə tərəf uzatdı.

Mən onun ovcunun içindəki qarmaqarışıq xətləri bir-bir, çox diqqətlə nəzərdən keçirə-keçirə soruşdum:

– Siz inanırsınızmı ki, insanın keçmişi, indisi və gələcəyi onun əlinin içindəki xətlərdən açıq-aydın oxunur?

– Bəli.

– Çox yaxşı! Hardansa oxumuşam ki, bir əcnəbi qadın ömrü boyu baxdığı minlərlə əl xətlərindən yalnız bircəciyində tələsib, səhvə yol verib. Bu xətlərin izahına dair onlarla elmi əsər yazılıb, yüzlərlə fotoşəkillər çəkilib. Sübut ediblər ki, insan dünyaya gəlməmiş – ana bətnində olarkən onun gələcək həyatı proqramlaşır və bu proqramlar əl xətlərinə köçür.

Zilzili xanım qondarma kipriklərini qırpmadan mənə baxırdı.

– Məsələn, baxın, əlinizdəki bu xətdən aydın görünür ki, siz uşaqlıqda çox dəcəl olmusunuz, şıltaq hərəkətlərinizlə evdəkiləri də, çöldəkiləri də zinhara gətirmisiniz. 17 yaşında təkid edib özünüzdən 27 yaş böyük pullu bir kişiyə ərə getmisiniz.

Zilzili xanıma işarə elədim ki, bundan sonrakılar məxfidir.

– Qulam müəllim, sən get, yarım saatdan sonra gələrsən, xasiyyətnaməni özüm alıb verəcəm.

«Canlı karikatura» könülsüz halda qapını arxasınca örtdü.

– Xətrinizə dəymirsə, davam edim.

– Buyurun, buyurun!

– Qızınızın doğum şəhadətnaməsindəki «atası» xanasında yazılmış «Vəlikişi» sözü düz deyil. Əyyaş ərinizdən 3 il övladınız olmadığından guya rəfiqələrinizin acığına qonşunuz Xudaverdi ilə eşqbazlıq etmisiniz. Qızınız Gülyanın əsl atası da həmin qəssab Xudaverdidir.

Zilzili xanımın rəngi saralmışdı. Nəsə demək istəyirdi, amma bacarmırdı.

– Onun xəsisliyindən zəhləniz gedəndən sonra «Zapravşik Tanrıqulu»nun «saqqızını oğurlamısınız». Sonra kənddə yaşayan uzaq qohumunuzla «him-cim»ə başlamısınız. Ananız Dildili xanım kimi kişiləri yumurta tək dişinizə vurmaqdan ləzzət almısınız. O qohum da köhnələndən sonra…

– Bəsdirin!!!!

Zilzili xanım qıyya çəkdi, elə bil qəfildən ətini kəsdilər.

Yan tərəfində sanballı hərflərlə «DİREKTOR» yazılmış qapı açıldı, bir «canlı karikatura» da burdan çıxdı – əvvəlcə qarnını içəri saldı, sonra özünü. Bizə tərs-tərs baxdı, heç nə demədən 180 dərəcə fırlanıb gəldiyi kimi də geri qayıtdı.



Stolun üstündəki qrafindən Zilzili xanıma su töküb verdim. O, yavaş-yavaş özünə gəldi:

– Siz doğrudanmı dediklərinizi əlimin xətlərindən oxuyursunuz?

– Əlbəttə, Zilzili xanım. Yoxsa mən nə bilirdim ki…

– Mənim…indiki…hərəkətlərim də…

– Bəli, bəli, hamısı əlinizin içindədir. İndi də siz onunla…

Direktorun qapısına işarə elədim.

– Gələcəyimi də bilirsiniz?

– Buna şübhəniz olmasın. Siz bir aydan sonra…

– Allah xətrinə, susun! Bura nəyə gəlmisiniz? Gəlmisiniz ki, mənim tərcümeyi-halımı üzümə oxuyasınız?

Zilzili xanım ani bir fikrə getdi. Sonra yalvarıcı nəzərlərlə üzümə baxdı:

– Bildiklərinizi başqalarına da danışırsınız?

– Lazım gələrsə…

Zabitəli Zilzili xanım yazıqlaşmışıdı.

– Mənim barəmdə…

– Heç kimə heç nə deməræm, bir şərtlə ki…

– Nə desəniz, hazıram!

– Məni get-gələ salmadan mənzil növbəsinə götürülməyimə kömək edin, – deyib, yazdığım ərizəni və topladığım sənədləri ona uzatdım.

Zilzili xanımın direktorun kabinetinə girməsi ilə çıxması bir oldu… Beşcə dəqiqə keçməmiş adım siyahıda idi.

… Yazıq Zilzili xanım haradan biləydi ki, uşaqlıqdan özünə ən yaxın sirdaş bildiyi «Tyotya Raya» mənim kirayənişin qonşum «Dul Pakizə»nin qiybət dostudur və həmin Pakizə də hər axşam bizdə çay içməyə vərdiş eləyib…

# ÜÇÜZLÜ

Zilzili xanım Respublika Parlamentinin deputatı olan köhnə rəfiqəsilə Bakının keçmiş Avakyan küçəsində görüşdü. O nə demblokdan idi, nə də komblokdan. Ordan-burdan xeyli siyasi söhbət elədilər. Axırda Zilzili xanım soruşdu:

– Ağəz, o necə çıxışıydı sessiyada eləyirdin? Dərdimizdən-sərimizdən danışa bilmirdin? Müəllimlərin maaşı azdır, cəhənnəmə olsun, mədəniyyət işçiləri acından ölürlər, gora ölsünlər! Həm də bunları sənə kim deyib? Hər sezon vaxtı Rusetin şəhərlərində xiyar-pomidordan tutmuş göy-göyərtiyə, gül-çiçəyə qədər satanlar bəs kimlərdir? Kaş elə onların qazancı qədər demblokdan olan deputatların qazancları olaydı!

Qarabağda ermənilər bizim qovarağımızı ele götürüblər ki, bu günlərdə Kürü o taya keçməsək yaxşıdır. Bazarlarımıza cibi dolu gedən evə cibi də, zənbili də boş qayıdır. Mağazalarımızdakı bığıburma, qızıldiş kişilərin dövlət əmlakına qoyduqları şəxsi qiymətləri eşidib-görəndə bazarlara tərəf götürülməyi camaat özünə qənimət bilir. Sən də bunlardan danışmaq əvəzinə başlamısan ki, müəllim elə gəldi, zurnaçalan belə getdi, artist də ortada qaldı. Danışanda demblokdan olanlar kimi danışasan, deyəm hə. Yoxsa…

– Zilzili xanım, dediklərindən o biri deputatlar da danışırdılar da.

– Düzdür ey, danışırdılar, amma danışmasalar ondan yaxşı olardı. Vallah, mən həmin tribunadan onlardan on dəfə yaxşı çıxış edərəm. Ağəz, çoxdan səndən soruşmaq istəyirdim, o boyda kişilər niyə biri-birilərini qoz boyda mikrofonun üstündə qırırlar? Özlərini televizorda arvad-uşaqlarına göstərmək üçünmü? Niyə demirsiniz ki, ayıbdır, bu boyda xalq ekrana baxır, sizdən imdad gözləyir, siz də özünüzü orda biyabır eləyirsiniz? Xalqın taleyini beləmi həll etmək istəyirlər?

– Niyə, Zilzili xanım, orada xalqın taleyini fikirləşənlər çoxdur.

– Kimlər fikirləşir, ağəz? Köhnə katiblərmi? Sovetlərin sədrlərimi? Ya da təzə icad elədiyiniz icra başçılarıdır, hökumətin yiyələridir, nədir, onlarmı? Sən Allah kiri! Nazirləri, müdirləri, prokurorları, bir sözlə xalqın evini yıxanları yığmısınız ora, bu yandan da deyirsiniz ki, onlar xalqın qara gününü ağardacaqlar. Ay-hay! Bu başla səni necə deputat seçiblər, bilmirəm. Yoxsa sən də onlar kimi… «bülleten-qutu» məsələsi, hə?

– Zilzili xanım, insafla danış. Axı, deputatların hamısının ünvanına belə sözləri demək düz deyil.

– Yoldaş deputat, deyəsən sən qəzet-jurnal oxumursan, televizora baxmırsan. Mətbuatla maraqlanmaq lazımdır. Onların yazdıqlarının yanında mənim dediklərim küləkli gündə mollanın yediyi qovud kimi bir şeydir. Məəttəl qalmışam, niyə orda açıq-aşkar danışmağa qorxursunuz? Camaat da bilir ki, rüşvət alıb verə-verə vəzifəyə gəlmiş sabiq katiblər, idarə müdirləri, nazirlər, prokurorlar, daha nə bilim hansı vəzifə sahibləri özlərini canıyanan göstərməklə tutduqları postlardan dördəlli yapışmaq istəyirlər. Belə adamlardan xalqa arxa duran olmaz, bacım. Demblok da durub tələb eləyir ki, parlament buraxılsın, təzəsi seçilsin. Birincisi, kim öz xoşuyla ətək-ətək puldan, rəhmətlik Əlağa Ağayev demişkən, par-par mebelli, yarlı-yaraşıqlı kabinetdən, zəhmli kreslodan əl çəkər? İkincisi də indiki vaxtda təzdən yox ey, lap on dəfə də təkrar seçki keçirilsə, zorla da olsa yenə həminkilər mandata sahib çıxacaqlar.

– Zilizili xanım, sən bizim parlamentimizin gördüyü yaxşı işlərin üstünə qərəz pərdəsi çəkirsən. Bəs milli bayrağımızı qəbul edən, ittifaq müqaviləsinə getməyən, müstəqil Azərbaycanı yenidən yaradan, kommunist partiyasının boynuna kəndir salan, milli ordumuzu təşkil edən və xalqın ürəyindən xəbər verən onlarla belə gözəl qərarları çıxaran hansı parlamentdir? Bu cür ağır məsələlərin müsbət həllinə dediyin deputatlar da sevinə-sevinə səs verməyiblərmi?

– Bir məsəl var ey, deyir: «Xalam mənə pul verdi, can versəydi ondan yaxşı idi». Bir neçə ay əvvəli yadına sal, həmin məsələləri ilk dəfə qaldıranları nə günə qoydular, başlarına nə oyun açdılar? Deputatların çoxu yuxarıda əyləşənlərin ağızlarını güdürlər ki, «ləbbey», «baçeşm, ağa» desinlər. Bir sözlə, o necə deyərlər,

şəxsi mənafe ümumi mənafeni üstələyib.

Zilzili xanımın ağzı qızışmışdı, daha nələr danışmadı? Rəfiqəsi güc-bəla ilə yaxasını ondan qurtara bildi.

Zilzili xanım keçmiş Osipyan küçəsində köhnə qonşusu, əvvəlki komblokdan olan prokurorla rastlaşdı. Salam-kəlamdan sonra dedi:

– Sessiyada gözəl, dərinməzmunlu və geniş çıxışınızdan xalqın çox xoşu gəlib. Dediyiniz kimi, əlbəttə, müəllimlərin də, mədəniyyət işçilərinin də maaşlarını tez bir zamanda artırmaq lazımdır. Yazıqlar, həqiqətən də, bu mürəkkəb zamanda çox çətinliklə yaşayırlar. Parlamentdə belə vacib problemlərdən daha tez-tez danışmaq lazımdır. Üzünüzə demək olmasın, orqanlar üstümüzdən gözlərini çəksələr, bazar-dükanlarda qiymətlər kəllə-çarxa qalxar, alverçilər camaatın başında qoz sındırar, rüşvət ayaq tutub yeriyər. Çox sağ olun ki, bunların qarşısını alırsınız. Demblokdan olanlar isə lap ağ eləyiblər. Başa düşmürlər ki, balam, milli bayrağı, ittifaqdan ayrılmağı, Azərbaycanı müstəqilləşdirməyi kim reallaşdırdı, kim kommunist partiiyasının boynunu yerə soxdu, kim milli ordu yaratdı? Elə hey boş-boşuna qışqırıb-bağırırlar. Daha fikirləşmirlər ki, indiki vaxtda bir yumruq kimi birləşib özünü saldığı bu dərin uçurumdan xalqı xilas etmək lazımdır. Yazıq köhnə katiblər də, Sovetlərin sədrləri də elə bu amal uğrunda mübarizə aparmaq üçün xalqın özü tərəfindən deputat seçilməyiblərmi? Demblokun üzvləri də adlarına bir «bəy» sözü artırmaqla elə düşünürlər ki, bunlar da xalq qayğısı çəkirlər. Əslində isə sağlar və sollar, demokratlar və partokratlar, liberallar və radikallar ayrı-ayrı qruplar yaratmaqla xalqı parçalayırlar…

Prokuror Zilzili xanımın uzun nitqinə həvəslə qulaq asandan sonra razılıq edib, ondan uzaqlaşdı.

Zilzili xanım indi də keçmiş Şaumyan küçəsindəki poçtun qarşısında onu gözləyən Parçaqalibski ilə Qırmaqıranova tərəf tələsirdi. Tələsirdi onlara desin ki, köhnə rəfiqəsilə tanış prokuroru necə xamladı. Onun öz fikrincə isə nə demblok, nə də keçmiş komblok xalqın dərdinə çarə qılan deyillər, hamısı vəzifə davası döyür. Ümid qalıb yenə xalqın özünə.

**«Salam» qəzeti,**
**1991-ci il.**



# BƏDBƏXTLİK
## *(Hekayə)*

Nahar fasiləsi idi.

Suquş xanım kiriməyən telefonun dəstəyini qaldırdı. «Bəli» deməyə imkan tapmamış o başdan hikkəli qadın səsi eşitdi:

– Allo, sizin o xarabada Məmmədqulu adında bir heyvan işləyir, ya yox?

Suquş xanımın üz-gözü turşudu:

– Ay bacı, adınızı da bilmirəm, kişini niyə təhqir edirsiniz?

– Nəəə? Kişiii? Elə kişini Kürdə itirim, Arazda axtarım! Ona kişi dediyinə görə dur get ağzını su ilə yaxala.

– Bacı, Məmmədqulu müəllim sizə neyləyib ki, belə danışırsınız?

– O mənə neyləyə bilər? Ağrım ürəyinə! O, kişi deyil, bığı olmasına baxmayın! Deyin görüm, o heyvan oğlu, heyvan sizdəmi işləyir?

– Bacı, birincisi, bura heyvanxana deyil. İkincisi, Məmmədqulu müəllim çox qanacaqlı kişidir…

– Hə, bildim, onu belə tərifləməkdə əlbət sən Suquş xanımuşkasan.

– Ağəz, «uşqa» özünsən! Məni cin atına mindirmə! Səhərdən nə ağzını açıb, gözünü yummusan?! Ayıb deyil səninçün?!

– Ayıb sənə olsun ki, xalxın kişisini zorla qapazlayıb eləmisən dədənin malı!

– Lap yaxşı eləmişəm! Kişiyə əməlli-başlı arvadlıq elə, o da başqasına tamah salmasın. İstəyirsən lap düzünü deyim, o məndən ötrü ölür, mən də ondan ötrü. Hər gecə bir yerdə oluruq, yaşayaraq özümüz üçün…

– Yaxşı, ay ləçər, alıxlayıb mindiyin o köpəkoğlunun başına bir oyun açım ki, hər səni görəndə gözünə meymun görünsün.

Suquş xanımı od götürdü. Ağzına gələn ən biədəb söyüşü telefona qışqırmaq istəyəndə… dud…dud…dud… Ağzı elə açıla qaldı. Dəstəklər əvvəlcə o başda, sonra bu başda qəzəblə aparatların üstünə çırpıldı.

Suquş xanım hirsindən ayağa durub otağın içində fırfıra kimi

fırlanmağa başladı. Bir adam da yox idi ki, hirsini onun üstünə töksün. Qəzəblə mızıldandı:

– Bu «parabeyin Məhəmməd»i qovursan da otaqdan çıxmır. İndi hardadır bu turşənək?

Birdən yadına düşdü ki, Məmmədqulu evdən təmir adıyla gətirdiyi «Yaponski maqnitofon»u onun yanına qoyub ki, nahardan sonra harasa aparsın. O hövsələsini dərmək üçün maqnitofonu yazı masasının siyirməsindən çıxardı, xəttə qoşdu, düyməni basdı və otağa «Zəminxarə»nin həzin dalğası yayıldı. Suquş xanım gözlərini yumub, əsəblərini yumşaltmağa başladı. Ürəyində Məmmədqulunu yamanladı: «Nakişi, arvadının öhdəsindən gələ bilmir! Yaxşı, sənə bir toy tutum ki, «Zavmaq Alik»in toyu onun yanında muştuluq olsun!».

Qəfildən maqnitofonun səsi kəsildi, lent xışıltıyla bir az fırlandı, sonra kişi səsi eşidildi:

– Xeyransa, bir qələtdir eləmişəm dədə-babamnan! Bir də eləmərəm! Qurban olum, Xeyri!

– Kəs səsini, biqeyrət! Gündə bir bəhanəylə evə gəlməyin canımı boğazıma yığıb! Gah guya iclasda olursan, gah xəstə yoldaşına baş çəkirsən, gah yası, gah toyu üzünə pərdə tutursan. İndi də yalandan deyirsən ki, ad günündə ləngimişəm. Bax gör saat neçədir, ay piyaniskə! Ağzından çaxır boçkasının iyi gəlir, alkaş oğlu, alkaş!

– Xeyransa!..

– Zəhrimar Xeyransa, çor Xeyransa! Dur ayağa, şərəfsiz! Əlbət o Suquşdur, Ququşdur, nədir, onun da qabağında belə diz çöküb dilini bir qarış çıxarırsan ki, yadına arvad-uşaq düşmür də, bambılı köpəkoğlu!

– Xeyri, dədəmin goru haqqı…

– Dədənin yanında səni basdırım! Sən deyildinmi o gecə yuxuda sayaqlayan: «Mənim Suquşum, mənim mələyim, sənsiz ya-şaya bilmirəm!». Qurumsaq!

– Xeyransa, Şəkərin, Şirinin canı üçün, mən o Suquşu görəndə zoopark yadıma düşür, porsuğa oxşayır. Eləsinin yüzü qurban olsun sənin bir telinə!

Suquş xanımı elə bil əqrəb sancdı. «Yaxşı, köpəkoğlu, sənin o lopa bığını qayçılamasam, dədəm Fərzalının qızı deyiləm!».



Məmmədqulu maqnitofonda yalvarışında davam edirdi:

– Xeyransa, yoldaş Mamedoviçin canı üçün, mənim o əntərlə heç bir işim yoxdur!

– Papamın adını çəkmə, əclaf! İtin biriydin, küçələrdə sülənirdin, səni adam elədi ortalığa çıxardı, vəzifəyə qoydu. İndi də onun gölgəsinin hesabına hürürsən. Yoxsa məni çoxdan boşayıb o gözəlçə «Ququş»unun yanına getmişdin!

– Xeyransa, həzrət Abbas haqqı, Suquşun sir-sifətinə baxanda adamın öyüməyi gəlir. Üz-gözünü kraskaynan, kremnən o qədər «şpakilovka»layır ki, sirk təlxəyinə oxşayır. Kömbə dodağının üstünə burun əvəzinə elə bil sarı bir xiyar yapışdırıblar. Ona heç 20 il dul gəzən «Eşşək Kərəməli»nin da tamahı düşməz. Hesabını çək ki, «Donqarbel Qəni»nin də onlan zəhləsi gedir…

Suquş xanım dəli kimi yerindən dik atıldı. Maqnitofonu başının üstünə qaldırıb yerə elə zərblə çırpdı ki, darmadağın oldu. Bununla ürəyi soyumadı. Sıçrayıb döşəməyə düşmüş kasseti dikdaban ayaqqabılarının altına salıb, üzərində «Tərəkəmə» oynayırmış kimi atılıb-düşdü, xıncım-xıncım elədi.

… Məmmədqulu bu vaxt iş yoldaşları ilə yemək-içmək məclisində əyləşib, Əbdüləzimin: «Kim arvadından qorxmur, əlini qaldırsın» təklifinə cavab olaraq sağ əlini şəstlə yuxarı qaldırmışdı və aşağı salmaq istəmirdi ki, istəmirdi. Bu yazıq bədbəxt bilmirdi ki, arvadı Xeyransa bir az əvvəl Suquş xanıma zəng edib «onu soruşub». Altı yaşlı oğlu «Ciqan Şirin» isə gecə anasıyla atasının söz-söhbətini gizlicə lentə alıb. Həmin lent də qalıb idarəyə apardığı maqnitofonun içində…

Məmmədqulunu işdə hirsindən dodağını gəmirən katibəsi Suquş, evdə isə əsəbi halda var-gəl edən hikkəli arvadı Xeyransa səbirsizliklə gözləyirdilər.

**1991-ci il.**

## TƏRBİYƏ YAXŞI ŞEYDİR, ƏGƏR OLSA

Mənim bu yazıda qarşıma qoyduğum məqsəd televiziya kanallarını zəbt etmiş və özlərinə «peşəkar», «ulduz» kimi adlar yapışdıran bəzi aparıcıların və müğənnilərin ekran tərbiyəsizliyindən danışmaqdan ibarətdir.

Xalqımızın ədab-ərkan irsinin, əxlaqının, bir sözlə, milli-mənəvi dəyərlərinin televiziya ekranı kimi geniş auditoriyadan bu qədər alçaldılmasına, ayaqlar altına salınıb tapdalanmasına, gözümüz görə-görə, qulağımız eşidə-eşidə tərbiyəsizcəsinə təhqir olunmasına dözmək olmur, adamın bütün varlığı sızıldayır, əsəblər tətiyə çevrilir. Dünyamızın bu gərgin çağında, Qarabağ boyda xəcalətli dərdimiz ola-ola, Vətən nisgilli, Vətən haraylı 20 milyon qaçqın, köçkün soydaşımızın yerə-göyə sığmayan kədərini bilə-bilə bizim özəl televiziya kanallarında səhərdən-axşama, axşamdan səhərə qədər verilən, üzr istəyirəm, ismətsiz verilişlərə baxın! Adamın üzündə bir az da olsun su olmazmı?! Suallar dəmir çəkicə dönüb beynimizi döyəcləyir: «Niyə bu biabırçılıqların qarşısını alan yoxdur?! Yoxsa səlahiyyət sahibləri azdır? Nə üçün bu iyrənc şouların yiyələrinə və bunlarla məşğul olanlara bir «ha-ho!», «hiş!» deyən tapılmır?! Nə olsun ki, özəl kanaldır? Məgər bu kanallar Azərbaycan xalqına xidmət etməli deyilmi? Niyə onsuz da itib getməkdə olan abır-həyamızın olub-qalanını da bu şoular, bu əxlaqsız verilişlər tökür?! Qərbin və Şərqin ən çirkin dəblərini və tərbiyəsizliklərini televiziyadan-kənar həvəslə əxz edib bu millətə sırıyanlar azdırmı? O kanalları işğal edən sahibi ixtiyarların, o təlxək səhnələrində məsxərə göstərənlərin görəsən, anaları, bacıları, qızları yoxdurmu? Əgər varsa, onların əxlaqına şübhə ilə baxmaqda mənəmmi günahkar? Ayıb deyilmi? Utanmırlarmı? (Yox, utanmırlar. Atalar demişkən: «Utanmasan oynamağa nə var ki?»). Bir atalar məsəli də var: «Övladım mənə əzizdir, tərbiyəsi isə ondan da əzizdir». Belə ucalıqdan qiymətləndirilən və dünənimizə qədər gəlib çıxan tərbiyəmizə, ismətimizə 5-10 nəfər «televiziya bambılısı» ləkə salmalıdırmı? Yoxsa mənəviyyatları cındırdan seçilməyən,



şəxsiyyətlərini pul qarşısında yağır donqarbelə döndərən, əxlaqlarına (əslində əxlaqsızlıqlarına) hamının yaxşı bələd olduğu mənliksizlərə qarşı mübarizəyə bizim gücümüzmü çatmır? Bəs onda hardadır mənəviyyatlı ziyalılarımız? Onlar bu eybəcərliklərə necə dözə bilirlər? Yenə bir atalar məsəli çəkmək istəyirəm: «Məscidin qapısı açıqdır, bəs…». Yaxşı, tutaq ki, bazar iqtisadiyyatıdır – çox şeylər alınıb-satılır, o cümlədən özəl kanalların verilişləri də. (Hər saniyənin, hər dəqiqənin, hər saatın öz nırxı – öz qiyməti var). Lakin, görünür burada təkcə alınıb-satılan veriliş deyil, çox şey, çəkinməsəydim deyərdim ki, hətta… «Görünən dağa nə bələdçi?».

Çox fikirləşmişəm. Axırda bu qənaətə gəlmişəm ki, tərbiyə sahəsində nə qədər ki, cəzasızlıq mühiti var, nə qədər ki, abır-həyanı azərbaycanlıların milli mentalitet əndazəsinə salmaq mümkün deyil və nə qədər ki, bizim əxlaq kodeksimiz belə tərbiyəsizlik hallarını tənzimləmir və ciddi qanunvericilik aktlarımız çatışmır elə belə də olacaq və hələ Allah bundan betərindən saxlasın! Çünki televiziya kanallarında gizli (və ya açıq) alverin qarşısını almaq üçün konkret heç bir iş görülmürsə, elə hər şey alınıb – satılmaqda davam edəcək.

Amma elə şeylər də var ki, onlar nə bizim eradan əvvəl, nə də indi alqı-satqı predmeti olmayıb və olmasa yaxşıdır. Bu günkü, dırnaq içində desək, «şoumen»lər isə bu alveri edirlər. Belə biabırçılığa şadlıq saraylarında, «palatka toylar»da cuşa gələn «bozbaş müğənnilər»in, sərməst «tamadalar»ın əttökən, şit hərəkətlərini və duzsuz sözlərini də əlavə etsək, görün, necə bir «mənzərə» alınır. Hələ pul üstə düşən davalardan danışmıram. (Həqiqətən, adam bir azərbaycanlı kimi bunların əvəzinə xəcalət çəkir).

Əvvəllər – indi bəyənmədiyimiz Sovet rejimində kimin ağzı nəydi «ayağını cızıqdan kənara qoysun», çərçivədən artıq bir hərəkət etsin, mövcud normanı pozsun və yaxud yerinə düşməyən bir söz danışsın? İndi isə gecənin qaranlığında iki mərhəm insanın biri-birinə pıçıltı ilə belə deməyi ayıb saydığı sözləri televiziya ekranlarından qışqıra-qışqıra, utanmadan-qızarmadan bu Millətin üstünə yağdırırlar və biz də bu təhqirlərə dözürük. (Lakin biz buna layiq deyilik).

Bilirəm, mənə irad tutanlar tapılacaq ki, özü tərbiyədən danışır, amma jurnalistdən tələb olunan etik normaları gözləmir, ağzına nə gəldi deyir, təhqirli ifadələr işlədir. Deyim ki, mədəni adamlardan mədəni jurnalist kimi mədəni yazmağı bacara bilərəm və insanlara çox böyük hörmətlə yanaşmağı özümə borc, şərəf hesab edirəm. «Azərbaycan Jurnalistlərinin Peşə Davranış Qaydaları»ndan da xəbərsiz deyiləm. Amma belələrini adam kimi başa salmağın da ayrı yolunu bilmirəm.

«Palatka müğənniləri»nin şou proqramlara ayaq açmasına səbəb, bayaq dediyim kimi, əlbəttə, puldur, yəni «kasıb halva yeyər öz pulunun minnətinə». Bunu hamı bilir ki, elə üzdəniraq müğənnilərin və aparıcıların televiziya ekranlarına yol tapması pulun gücünədir. Pul olan yerdə isə kimə gərəkdir ki, maraqlansın: ekrana, yəni xalq qarşısına çıxan buna layiqdir, ya yox və yaxud Məşədi İbad demişkən, bu adam arvaddır, ya kişi?

Gizli alver televiziya kanalları üçün həyat tərzidir. Biz demirik ki, cinayət hərəkətinə yol verirlər, kimisə zorla soyurlar və yaxud qarət edirlər, yox, deyirik ki, gizli, pərdə dalında alverlə məşğuldurlar, yəni «biznes» qurub pul qazanırlar. Biznes məsələsi isə dünyanın hər bir yerində var və qadağası yoxdur. Çünki qorxulu heç nə baş vermir. Terror aktı deyil ha! Nə olsun ki, bizdəki şou biznes kirlidir, məkrlidir?! Adı biznesdirmi? Pul alanlar məlum, pul verənlər məlum və hər iki tərəf udur – birinci tərəf birbaşa, yəni nəğd pulunu alır qoyur cibinə, ikinci tərəf isə dolayısıyla, yəni özünü reklam edib, toylar üçün məzənnəsini artırıb qazanır. Bəs itirən kim olur? Əlbəttə, dövlət və xalq. Çünki elə nəzarət mexanizmi yoxdur ki, səsindən «sarımsaq iyi gələn» «manıs»ların bir toydan nə qədər qazandıqlarını və küncdə – bucaqda televiziya kanallarının «xüsusi Adamlar»ına nə verdiklərini aşkarlaya bilsin. Belə oyunlar gedən bir aləmdə halal vergidən danışmağa dəyərmi?

Hörmətli oxucular!

Sizə də məlumdur ki, indi Azərbaycan müharibə şəraitindədir. Nə qədər şəhid vermişik, nə qədər torpaqlarımız işğal olunub, yurd-yuvamız dağılıb, nə qədər qaçqın, köçkün soydaşlarımız var! Əlillərimiz, veteranlarımız, girov qız-gəlinlərimiz və



müharibənin yaratdığı nə qədər digər problemlər!... Bu ağır günlərimizdə bizə yaraşarmı belə abırsız şoulara meydan verək? Mən demirəm ki, oturub daim ağlayaq və yas quraq. Amma belə səviyyəsiz, bütün milli adət-ənənələrimizi təhqir edən, tərbiyəsiz verilişlərin əvəzinə olmazmı ki, vətənpərvərlik hissləri aşılayan, məsələn, bir şəhidimizin həyatına, bir əlilimizin döyüş yoluna, bir soydaşımızın Vətən, Torpaq həsrətinə həsr olunmuş verilişlər nümayiş etdirilsin? Axı, insanların əsəbiylə bu qədər oynamaq olmaz! Onsuz da müharibənin, ondan əvvəlki və ondan sonrakı dövrün stresslərini bu xalq üzüntüylə yaşayıb. Bu bəs deyilmiş kimi ona əlavə əsəb zərbəsi vurmaq nəyə və kimə lazımdır? Vətən torpağı uğrunda ərənlərimiz qurban gedəndə indi lütlənib ekrana çıxan və bütün hərəkətləri ilə seksuallıq nümayiş etdirən Aygünlər, Röyalar, Rəqsanələr, onların tayı olan Faiq Ağayevlər və yaxud bunların valideynləri harada idilər, nə işlə məşğuldurlar? İndi əlinə bir televiziya kanalı keçirib, oranı əxlaqsızlıq yuvasına çevirən, pozğun yollarla gündə ətək-ətək pul qazanan nadürüstlərin ailəsindən, heç olmasa bircə nəfəri müharibədə şəhid olsaydı, arvadı, gəlini və ya qızı ermənilərə girov düşsəydi, vallah, bəlkə də yol verdikləri mənəviyyatsızlıqdan xəcalət çəkərdilər, heç olmasa bir azca utanardılar! (Onsuz da şəhidlərimizin ruhunu narahat edən belə yaramaz insanlar gec-tez Allahın qəzəbinə düçar olacaqlar!)

Nisə Qasımova ağbirçək arvaddır. Görəsən bunu özü bilmir? Niyə ona deyən yoxdur ki, ay Nisə xanım, yaşının bu çağında televiziya kanalına çıxıb atılıb-düşməkdən, əcaib qiyafəndən, yersiz hərəkətlərindən, qışqır-bağırından, düşük danışığından əl çək, get sənətinlə məşğul ol.

Aygün Kazımova bu xalqın mənəviyyatında yaman yaradır – yəni çarəsi olmayan bir eybəcər dərddir. Belə birisinə veriliş tapşıranda, əlbəttə, o camaat qarşısına hansı formada istəsə, lap lüt şəkildə də (onsuz da geyimi bədəninin çox yerini örtmür) çıxacaq, bir kişinin qucağında oturub, əlində mikrafon o birisini sorğu-suala tutacaq. Arif Qazıyevlə, Məhəbbət Kazımov kimiləri də ona deyəcəklər ki, sənə bütün geyimlər yaraşır, geyimsiz daha gözəlsən.

Gəlin «əyri oturaq, düz danışaq». Kimə gərəkdir ki, bilsin Aygünün həkim çıxaran iki qabırğası hardadır və yaxud o, Namiq Qaraçuxurlu ilə evlənəcəkmi? Onun iki yox, lap on iki qabırğasını çıxarıb atsalar, (ya atmasalar) bunun tamaşaçılara nə dəxli varmış? Və yaxud Aygün üçün Namiq Qaraçuxurlu ilə evlənmək nə çətin bir işiymiş ki? (Taki Namiq razı olsun).

Röyanın yanında Aygün toya getməlidir. Elə «Lider»də apardığı verilişin adından da («Özümüz bilərik») məlum olur ki, bu «ulduz» heç kimi saymır, utanc hissindən 40 verst uzaqdır. «Manananın ərə getdiyini» özünə dərd eləyən Röya Aygünün əksinə olaraq ər tapa bilməməsinin xiffətini çəkir. Amma, ayıb olmasın, çox yeri açıq olan bu «tərbiyəsizlik manikeni» durub ekrandan hamıya əxlaq normalarından, geyimdən, milli mentalitetdən «dərs keçir». Adam nə qədər sırtıq olmalıdır ki, Röyanın bir hərəkətini təqlid edə bilsin? Efir mədəniyyətindən xəbərsiz, bəzi türk verilişlərində aparıcıların jestlərini yamsılamağa çalışan Röya bu xalqın gözləri qarşısında «barmaq işarəsi»ni gülə-gülə Flora Kərimovanın ünvanına göndərməkdən çəkinmir. Hələ utanmaz-utanmaz Röyanın bu bədnam hərəkətini televiziya ekranlarında müzakirəyə qoyub, onu haqlı çıxarmağa çalışırlar. Ayıb olsun!

Doğduğu uşaqları «bic hesab etməyən» Rəqsanə bu millətə nə demək istəyir? Əlbəttə, yalnız sən özün bilirsən ki, uşağının atası kimdir. (Bəlkə bundan da xəbərin yoxdur?). Bicdir də bizə nə, bic deyil də bizə nə?

«Şou – ulduzu»nun bu «məşhur kəlam»ını eşidəndə yadıma bir əhvalat düşdü.

Biri dostunun uşaqlarını göstərib, deyir:

– Dost, bu uşaqlardan heç biri sənin özünə oxşamır, axı!

Dostu cavab verir:

– Allah pis qonşunun üzünü qara eləsin, qoyur ki, uşaq atasına oxşasın!

Rəqsanənin uşaqları da güman ki, sifətdən kimlərəsə oxşayacaq. Burda nə problem var ki?

Və yaxud Rüfət Axundov ekrandan ultumatum verib, deyir ki: uşaq mənim familiyamı daşıyacaq! Əşi, daşısın da, bizə nə?



Amma Rüfətə məsləhətim budur ki, qoy uşaq anasının familiyasını daşısın, çünki o hər şeyi yaxşı bilər.

İlhamə cavanların nənəsi yaşındadır. Öz işidir, istəyir oğlu yaşında birinə ərə getsin, istəyir ərinin yanına (xarici ölkəyə) ayda bir dəfə yox, beş dəfə səfər eləsin, bunun bu xalqa bir isti-soyuğu yoxdur. Azərbaycan azad ölkədir, kimi ər seçirsən, özün bilərsən, ərinin yanına neçə dəfə gedirsən, yenə özün bilərsən. Amma millətimiz üçün vacib olan əxlaq normalarımızı pozma, a «dünya gözəli»! Bir söz də deyim: «Hörmətli İlhamə xanım, yaş hər yerdə, hər işdə özünü göstərir. İllər insan ömründən havayı ötmür ha! Hər ötən ilin izi qalır insanın görkəmində. Sən özünü cavan göstərməyə çalışmaqnan, dünyanın bütün müasir kosmetikasından bolabol istifadə etməknən heç nəyə nail ola bilməyəcəksən. Kim sənə deyirsə ki, gözəlsən, inanma, yalan deyir, səni aldadır. Daha sənin «poezdin uşyol». Barı, hökumətin sənə verdiyi addan və imtiyazlardan ayıblan. Bir də Flora Kərimova ilə ədavətin qurtarmayıbsa, get tap onu, gücün çatırsa, yapış yaxasından, sürü elədən-elə, belədən-belə. Allah ya sənə verə, ya ona! Nəhayət, əl çək əcaib proqramlardan onun ünvanına təhqirlər yağdırmağından. Floranı nəyəsə bənzətməkdən, şit-şit hərəkətlərindən və sözlərindən qurtar. Siz nənələrə dingiş hərəkətlər etmək yaraşmaz, axı! Ağır otur, batman gəl… Sizə baxıb, tərbiyəsiz cavanlara öyüd verməyə adam utanır.

Ələlxüsus, bu «ATV» kanalı elə bil öz proqramlarında «şou tərbiyəsizlik» yaymağa and içib. Bunun məramı və məqsədi sanki milli-mənəvi dəyərlərimizi təhqir etməkdən ibarətdir. Milli Televiziya və Yayım Şurası və onun möhtərəm sədri Nuşirəvan Məhərrəmli, Gənclər və Turizm Nazirliyi və onun hörmətli başçısı Azad Rəhimov hara baxırlar? Bəlkə onların da bu məsələlərdə maraqları var?

«ATV» kanalda Elçin Əliyevin (Əlibəyli), aparıcısı olduğu «El içində» (verilişlərin adları ilə özləri düz gəlmir), Dilarə Əliyevanın aparıcısı olduğu «Çal-çağır» proqramlarında haq-nahaq adamlar biri-birini nə qədər alçaldar, nə qədər təhqir edər?! Bu «aparıcılar» bəzən hörmətli adamları da ələ salmaq üçün qəsdən eybəcər «səhnələr» düzəldirlər.

İstedadına, peşəkarlığına və şəxsi insani keyfiyyətlərinə uzun illərdən bəri böyük hörmət bəslədiyim gözəl jurnalistimiz Flora Xəlilzadəni bir dəfə bu verilişlərin birində tərbiyəsiz iştirakçılar (əlbəttə, aparıcının bilərəkdən yaratdığı şəraitə uyğun) danışmağa belə qoymadılar. Farsların bir deyimi var: «Necəsən qanmayım, dədən yansın?!». Anormal adamlar biri-birinə aman vermədən Flora Xəlilzadənin hətta jurnalistliyini şübhə altına almaq istəyirdilər. Şəxsən mən bu xanım-xatın qadının yerinə əzab çəkdim.

Turan kimiləri heç kəsə düzəməlli danışmaq imkanı verməden, nəyi bilir, nəyi bilmir (bildiyi isə daş armuddur), hamıya «sırımaq» istəyir. Hətta atası, babası yaşında olan elm adamlarını, professorları bəyənmir, deyir ki, ağıl yaşda deyil, başdadır. Bəli, bu düzdür, amma baxır hansı başda və kimin başında?

Özləri səviyyədə olan cavanlar arasında «moda minmiş» aparıcılar Fərda və Xəyalə «sevgini isbat eləmək üçün» hansı hoqqalardan çıxmırlar, nələrə əl atmırlar?! «Sevirsənsə iri bir soğanı ye, bahalı mobil telefonunu yerə vurub sındır, köynəyini cırıqla», nə bilim daha nələr, nələr… Və qəribədir ki, ağlıdayaz gənclər də bu «göstərişlərə» kor-koranə əməl edirlər. (Belə yerdə rəhmətlik Mirzə Ələkbər Sabirin şeirləri yada düşür). Deyən də yoxdur ki, a bala, soğan yeməklə, telefon sındırmaqla sevgi isbat olunmaz. Sənin sevgin sənin o yox başına dəysin!

Bir «aparıcı» da var – Zaur Baxşəliyev («Yağ kimi»). Qarderobdan qadınların alt paltarlarını çıxarıb, teleekrandan camaata nümayiş elətdirir. Beləsinə nə deyəsən, nə ad qoyasan?! Adamın «tərbiyəsiz» sözünə də heyifi gəlir. Ə, bala, ananın, bacının paltarlarını da belə eləyərsənmi?

Türk İlham Özbay daha hansı hərəkətləri etməlidir ki, ona desinlər: «A, kişi, həvəsdir, bəsdir!».

Kamran Həsənli kimiləri mədəniyyətimizin və mənəviyyatımızın əlində altıncı barmaqdır və ya bir dözülməz ağrıdır. Bu adam bir düşmən olub, düşüb milli-mənəvi dəyərlərimizin canına. Yalnız cərrah bıçağı belə altıncı barmaqlardan və ağrılardan tərbiyəmizi xilas edə bilər. Bu bıçaq isə dövlət nəzarətidir. Onda televiziyamıza ilk düşüklük gətirən Yusif Ağayev kimilərinə yer olmaz.



Belə tərbiyədə olan çox adamların adlarını çəkmək olar. Lakin məqsədimiz ad sadalamaq deyil, bu biabırçılığa qarşı etiraz səsimizi ucaltmaqdır və güman edirəm ki, yuxarı dairələrdə də səsimizi eşidən tapılacaq.

Hər televiziya kanalının, o cümlədən hər verilişin səviyyəsinə uyğun da öz adamları var. Əgər onlar mənəviyyatsızlığı və tərbiyəsizliyi təbliğ etməsələr, adam deyər ki, cəhənnəmə, öz simalarını göstərirlər də!

Həzrəti Məhəmməd deyib: «İnsan hər şeydən əvvəl öz zəmanəsinin övladıdır». Lenin isə həmişə etdiyi kimi bu kəlamı da özəlləşdirərək yazıb: «İnsanın şüurunu düşdüyü mühit formalaşdırır».

Düzdür, Azərbaycan xalqının mentalitetini və milli-mənəvi dəyərlərimizi istər şəhər olsun, istər kənd, eyni müqəddəslikdə qorumalıyıq. Amma, Bakı mühitini Tərtər rayonunun erməni quldurları ilə üz-üzə qalmış Qapanlı kəndinin mühitilə şübhəsiz ki, eyniləşdirmək olmaz. Nəyi demək istəyirəm? Teleməkanda baş verən adi bir yüngül hərəkət və yaxud yersiz bir söz ucqar bölgələrdə daha ciddi etirazla qarşılanır. Bu hesabla kənd camaatı, görün, o tərbiyəsiz verilişlərə görə nə qədər narazı qalırlar! Axı kəndlərimizdə köhnə və urvatlı ədəb-ərkanlarımıza daha çox hörmət qalıb.

Biz heç vaxt qərbə inteqrasiyanın, sivil xalqların yaxşı ənənələrindən bəhrələnmənin əleyhinə deyilik. Bu günkü qloballaşan dünya ilə xalqımızın və dövlətimizin mənafeyi naminə hərtərəfli ayaqlaşmaq gərəkdir – iqtisadiyyatımızla da, siyasətimizlə də, mədəniyyətimizlə də. Amma o yerdə ki, Azərbaycan xalqının milli mentalitetinə ziyan dəyir, o yerdə ki, əxlaq və mənəviyyatımıza zidd nələrsə baş verir, onlardan qorunmaq vacibdir.

Bizim dilimiz, dinimiz, vətənimiz qədər də tərbiyəmiz əziz olmalıdır.

Zənnimcə qaldırılan bu problemlər xalqımızın əxlaq, mənəviyyat, mədəniyyət, bir sözlə, müqəddəs milli-mənəvi dəyərlərilə bağlı olduğu üçün bu məsələyə çox ciddi yanaşılmalı və dövlət səviyyəsində münasibət bildirilməlidir. Məncə, o kifayət edər ki, tərbiyəsizlik aşılayan bütün proqramlara, gülünc, lağ-lağı və təh-

qir məkanı olan bütün televiziya verilişlərinə ciddi qadağa qoyulsun. Mənliyini pula satmış kimlərinsə qazanmaları hesabına böyük və ulu bir xalqın mənəviyyatı ilə oynamaq olmaz. Kim daldada hansı tərbiyəsiz işlərlə məşğuldursa, özü bilər. Heç kəsə ixtiyar verilmir ki, öz əxlaqsız və səviyyəsiz həyat tərzini xalqa məxsus olan televiziyaya gətirsin. Daha bəsdir!

**2008-ci il.**



# «ALLAH BİZƏ DƏ KAŞ BELƏ ÖLÜM QİSMƏT ELƏSİN!»

Qələm dostum Ramiz Xasıoğlunun yenicə çapdan çıxmış «Şəhidlər» kitabını (Bakı, Səda, 1993) əlimə alanda üz qabığındakı mükəddər ana surəti, torpağın dərdi kimi sinəsindən dikəlib qalxmış baş daşları, alov və qan görüntüləri onu hələ oxumamışdan bütün varlığımı sarsıtdı və fikrimi Bakı faciəsinə, Daşaltı, Xocalı, Şuşa, Laçın, Kəlbəcər…dəhşətlərinə, bu bölgələrdəki qırğınlara çəkib apardı. Bir xalqın soyqırımına yönəldilmiş məkrli əməllərin son nəticəsi kimi meydana çıxmış haqsız, ədalətsiz və zorakı erməni müharibəsi Azərbaycanın ürəyinə elə dağlar çəkib ki, bu dağların sağalmaz yara şırımları əbədiyyətə qədər qövr edəcək, sızım-sızım sızıldayacaq, göynəyəcək, qaysaqlanmayacaq! Dişləri qana batmış erməni quduzlarının törətdikləri dəhşətləri öz gözlərilə görən, ana-bacıları, cavan həyat yoldaşları, həddibuluğa çatmamış 13-16 yaşlı qızları, ərən oğulları girov götürülərək başları kəsilmiş, min bir əzab-əziyyətlə qətlə yetirilmiş, daha hansı məhrumiyyətlərə düçar edilmiş şəxsi tanışlarımın ətürpədən, ürəksıxan sızıltılı xatirələri yenidən qulaqlarımda uğuldadı. Danışırdılar ki, əsir düşənləri məcburi sıraya düzüb gözlərinin qabağındaca oğulların başlarını qanırıb bıçaqla qoyun başı kimi kəsirdilər, dünyanın axırına qədər insan övladının ağlına gəlməyəcək fiziki əzablarla uşaq qızlarımızın, cavan gəlinlərimizin başlarına yüz oyun açırdılar, həmin vaxtlar Allahın ucuz bir ölümünü necə də ürəkdən arzulayırdıq!..

«Namusu itə atıblar, it yeməyib» - deyən dədələrimizin bişərəf vəzifəli törəmələri bu xalqı niyə öz namuslarını yeməyə, qeyrətlərini satmağa məcbur etdilər?! Yaxın keçmişdə əsgəri xidmətdə olarkən rus üçün ən adi bir söz kimi işlənən söyüşə görə böyük dava-mərəkə qoparan, alacağı ağır cəzadan pəhsinməyən oğullarımız gör necə ağlar günə qalıblar ki, gözlərinin qabağında erməni gədələri namusumuzu tapdalayırlar!

Mənə elə gəlir ki, dostum Ramiz ilk kitabı haqqında bir neçə kəlmə ürək sözünü demək istəyən həmkarının bu əsəbi girişini ba-

bağışlaya biləcək. Həm də elə Ramizin «Şəhidlər» kitabındakı ürək duyğulanmaları da bu göynərtilərdən, bu sızıltılardan mAya tutub, mövzulanıb, mərsiyəyə, ağıya dönüb.

Kitab bütövlükdə Vətən torpağını, Vətən namusunu, Vətən qeyrətini özünün bütün varlığından uca tutan, öz ölümlərilə özlərinə əbədi həyat qazandıran şəhidlər haqqında şəhidlik dastanıdır. Şərt onda deyil ki, bu kitabda yalnız Ramizin özü ilə birbaşa ünsiyyətdə olmuş qohum və tanışlarının şəhidliyi haqqında yazılıb, əslində bu kitab müharibədə şəhid gedənlərin hamısı üçün əbədiyaşar xatirə toplusudur. Daha doğrusu, Vətən torpağı uğrunda canlarını fəda edənlərə ana-bacı fəryadından, ata, övlad kədərindən yonulmuş tarixi bir abidədir.

Kitabı oxuduqca adamın bu ər igidlərə, bu cavan, nakam balalara ürəkdən heyfi gəlir! «Topxana» meşəsində bir ağacın ölüm naləsinə dözməyən Azərbaycan xalqı bığ yeri yenicə tərləyən minlərlə oğullarının, çiçək qoxulu məsum qızlarının qanlarına qəltan olmalarına necə dözür bəs?!

Ramizin şəhidlər haqqındakı yazıları oxucuların ovqatında uçuntuya, acı ürək iniltisinə çevrilir, yaddaşlarda xəcalət ləkəsi kimi kök salır. O mənada ki, bu qurbanların əsl günahkarı bizim içimizdən çıxan öz qeyrətsizlərimizdir!

Ramiz bu kitabı yazarkən qarşısına o məqsədi qoymuşdur ki, şəhidlərin keçdikləri çox qısa, lakin tarixdə izi qalan və nəsillərə örnək olası həyat yolları gələcəyimizə görk qalsın!

Ramiz bu kitabda şəhidlik zirvəsinə ucalmış 16 doğmasından, gah onların bacılarının, gah analarının, gah da öz dili ilə elə yanıqlı, elə kövrək danışır ki, adam bu yanğıya dözə bilmir, yarımçıq talelərin, nakam ömürlərin dərdinə qarsalanır, kədərinə pörşələnir, tüstüsü təpəsindən çıxır, səssiz naləsi ərşə bülənd olur!

Kitabda bacısı Aidənin dililə şəhid Azad Sadıqov, öz dililə Mehman və Hafiz Həmidovlar, anasının dililə Elşad İsrəfilov haqqında sanki xatirə yazmır, yanıqlı bayatı deyir, yas tutub qara bağlayır. Bu ovqat onun Vidadi Əzizov, Fəxrəddin Qasımov, Tariyel Səmədov, Babək Sadıqov, Gündüz Civəzadə, Xosrov Əhmədov, Eldəniz Əlimuxtarov, Müzəffər İmanov,



Müşfiq Hacıyev və Arif Mahmudov haqqındakı yazılarının da cövhərini təşkil edir. Vətənin bu qeyrətli oğulları Ağdam, Əsgəran, Xocalı, Şuşa, Laçın, Zəngilan, Ağdərə, Goranboy bölgələrində erməni quldurlarına qarşı aparılan müharibədə qəhrəmanlıqla həlak olmuş igidlərdir.

Ramizin qələmi şəhidləri nə qədər dil deyib ağlasa da, oxucunu ümidsizlik girdabına atmır, əksinə, onu qələbəyə inandırır. O hətta şəhidlərə qibtə edir: «Allah bizə də kaş belə ölüm qismət eləsin!».

Doğrudan da, şərəfsiz həyat kimi şərəysiz ölüm də dəhşətdir!

«Şəhidlər» kitabı Ramiz Xasıoğlunun yaradıcılıq uğurudur. Ona daha işıqlı sabahlar arzulayıram!

**11. 05. 1993-cü il.**

# BİR MƏRTƏBƏ YUXARI

Həm bir göz qırpımı, həm də uzun, məşəqqətli və taleyüklü bir ömür yoludur həyatın 70 ili. Kədərə də, sevincə də, həsrətə də, vüsala da bükülmüş anların, saatların, günlərin axarında Allahın yaratdığı hər bir insanın yaşadığı ovqatları şair də yaşayır, yazıçı da, dahi də, adi olanlar da.

Lakin ömrün də dəyərlisi, dəyərsizi olur. Bu dəyər isə həmin zaman kəsiyinin uzunluğu, yaxud qısalığı ilə ölçülmür.

**İl var bir günə dəymæz,**
**Gün var min aya dəyər.**
**(El bayatısı)**
**Və ya:**
**Bir ömrü illərlə ölçmək düz deyil,**
**Ömürlə illəri ölçəsən gərək.**
**(B. Vahabzadə)**

Bu günlərdə 70 illik yubileyi qeyd olunan sevimli xalq yazıçısı Anarın da yaşamaqda olduğu ömür dəyərli ömürlərdəndir, çünki bu illər havayı ötməyib, sanballı, ləngərli ötüb, özü üçün, hörmətli valideynləri üçün, övladları üçün və nəhayət, Azərbaycan xalqı üçün qiymətli illər yaşayıb Anar.

İki qüdrətli söz ustadının – Rəsul Rza və Nigar Rəfibəylinin övladıdır Anar. Uzun illərin təlatümlü ömür və sənət yolunu birlikdə keçmiş, biri-birinin ölümündən xəbərsiz, oğullarının «Sizsiz»i ilə nəğmələrinin ən kövrək xalları yazılmış iki unudulmaz şairimizin Anarı.

Rəsul Rza mərdliyini, cəsarətini, sözü üzə şax demək xasiyyətini, ağrı-acını içində yaşadaraq sevincini hamı ilə bölmək xarakterini, Nigar Rəfibəyli kövrəkliyini, duyğusallığını, nəğmə kimi axıcı söz düzümünü öz nəsrində birləşdirib Anar.

«Sizsiz»də özü: «Çoxları adımın hərflərini anası Nigar, atası Rəsul deyə yozurlar. Ancaq mənim adım anmaq, anım sözündəndir», – yazır.



Anar təkrarsız yazardır, məsuliyyətli və cürətli sənətkardır. Çünki onun nəsrində təkcə 60-cı illərdə ədəbiyyata gəlmiş bir yazarın yox, iki sənət korifeyinin də məsuliyyəti və cavabdehliyi öz əksini tapır. Hal-hazırda ədəbiyyatımızda nasir, dramaturq, kinossenarist kimi fəaliyyət göstərən, hələ innən beləki müdriklik yaşında həmişəcavan qələmindən çox şeylər umduğumuz Anar yenə də sözlə, fikirlə qovğadadır. Anardan umacağımız bir də ona görə çoxdur ki, o, Azərbaycan ictimai-əbədi mühitinin önündə gedən sənətkardır. Həyatımızda baş verən hadisələr, bugünkü «MƏN»i narahat edən problemlərin həlli onun yaradıcılığının başlıca meyarıdır.

Hansı əsərini oxuyuruqsa, sanki oradakı dünyanı yaşayırıq.

«Ötən ilin son gecəsi»ndə öz ocağının qırağında, doğmalarının yanında xatirələrin istisi ilə ovunan Həmidə xanımın qəhəri, «Dantenin yubileyi»ndə gülüş hədəfinə çevrilən Kəbirliniskinin bacarıqsızlığı, «Beşmərtəbəli evin altıncı mərtəbəsi»ndə uğursuz məhəbbət faciəsini yaşayan, mənən onu ittiham edənlərdən yuxarıda dayanan Təhminənin kədəri bizim üçün yad deyil.

Həsrətlə qolboyun olan Təhminənin zəng edib Zaura maqnitofon lentində oxutduğu xalq mahnısı nələri demir?

**Qırmızı gül, Sarı gül,**
**Bağçaların varı gül.**
**Gec açıldın, tez soldun,**
**Açmayaydın barı gül.**

O məqamda heç nə məhəbbətin kədərini bu sözlər kimi ifadə edə bilməzdi.

Anarın böyüklüyü bir də qəhrəmanının sevinc və kədərini oxucularına xalqın öz dili, öz yanğısı ilə çatdırmağındadır.

Anarın yaradıcılığı haqqında qucaq-qucaq kitablar yazmaq olar, amma görərsən ki, yenə nədənsə yazmamısan, qədərincə deyil, kəmdir. Amma deyilənlərin təkrarı da olsa, bəzi məqamlara toxunmaya da bilmirsən.

Anar hər hansı mövzunu qələmə alıbsa, canlı olub, zamanla, mühitlə səsləşən olub. Bir sözlə, insanlara nə demək istəyibsə, deyib, nə vermək istəyibsə, verib.

Onun qələmi istedadı ilə birləşib və nəticədə bitkin əsərlər yaranıb.

Məsələn, yazıçının «Ağ liman» povestində adi bir işçi olan Nemətin həyatı təsvir olunur. Ev-ailə, məişət qayğıları onun bütün vaxtını alır. Qızının çoxdan arzuladığı maqnitofonın alınması Nemətin ailəsində hadisəyə çevrilir. Lent yazısından dönə-dönə dinlədiyi söhbətlər ona donuq, dəyişməz, müəyyən cizgidən kənara çıxmayan öz həyatını xatırladır. Çərçivəyə salınmış ömür sürdüyünü dərk edən Nemət bu vəziyyətlə barışmır. O, yollar axtarır.

Bu əsərdə ibrət götürüləsi həyati məqamlar çoxdur.

Anarın satirik qələmlə yazdığı əsərlərində də həyatilik güclüdür. Bu səpkidə olan hekayələri oxuduqca sanki gündə qarşılaşdığımız tipləri görür və cəmiyyətimizin problemlərilə bir daha yaxından tanış oluruq.

«Şəhərin yay günləri» pyesində işlənmiş repblikalar, təbəssüm doğuran deyimlər, satirik aura kifayət qədərdir.

İndiki kimi yadımdadır. Anarın «Ulduz» jurnalında dərc etdirdiyi «Molla Nəsrəddin – 66» satirik novellalarını oxuyanda nə qədər heyran qalmışdım! Əsil yazıçı yanğısı ilə gördüyü nöqsanları və xalqın problemlərini o dövrdə qorxmadan, çəkinmədən qələmə almaq və bunları çox cəsarətlə üzə demək hər yazarın işi deyildi.

Mənim zənnimcə, «Molla Nəsrəddin – 66» silsiləsinin ən yaxşı və ən məşhur novellası «Zəncir»dir. (Sonralar Anar onu bir qədər təkmilləşdirərək «Qaravəlli» pyesini yazdı).

O zamanlar «Adamın adamı» komediyası Ümumittifaq komediya müsabiqəsində mükafat almışdı.

«Az. Yaz. Poz» idarəsinə yığışmış qohum-tanışlar işləmək əvəzinə baş qatır, intriqa yaradırlar. Onların yaramaz planları pozulduqca, fərsiz idarə müdiri İbişlinin dələduz müavinləri – Fənd Fərəc və Nazlı – Qəmzəli mifik bir «yuxarı vəzifəli şəxs» icad edib, onun kölgəsində dolanmaq xəyalına düşürlər, lakin fırıldaqlarının üstü açılır.

İlk nəzərdən adi görünən bu süjet Anar qələmində qeyri-adiləşir, maraqlı bir əsərə çevrilir.



Folklor motivlərindən güc alan «Yaxşı padşahın nağılı» hekayəsində müəllif nağıl təhkiyə üsulündan, alleqoriyadan, mübaliğədən istifadə edərək bu vasitə ilə bizim ölkəmizdə hələ də iş başında olan diktatorları, onların satqın, riyakar əhatəsini açıb göstərir.

Misalları çoxaltmaq da olar. Amma hamının yaxşı bildiklərinin təkrarına nə ehtiyac var ki?

Anarın teatr və kino sənətinin inkişafında da xidmətləri böyükdür. Onun «Şəhərin yay günləri», «Təhminə və Zaur», «Adamın adamı» pyesləri səhnəyə qoyulmuş, ssenariləri əsasında «Gün keçdi», «Təhminə və Zaur», «Uzun ömrün akkordları» bədii filimləri çəkilmişdir.

Ekranlardan düşməyən «Dədə Qorqud» filminin ssenarisi də Anara məxsusdur.

Tutalğac kimi istifadə etdiyim bu siftəliyin bir məqsədi var – pərəstişkarı olduğum istedadlı qələm sahibinə ömrünün 70 illiyi münasibətilə, gec də olsa, öz təbriklərimi çatdırmaq.

Sonda Anara Dədə Qorqudun bir alqışını arzulayıram: «Dizin təpərdən, qələmin kəsərdən düşməsin!».

Anarsevərlər Anardan hələ çox şey gözləyirlər. Çünki Anar adilərdən ən azı bir mərtəbə yuxarıdır.

**2008-ci il.**

# İŞIQLI İNSAN

***El hörmətini qazanmaq hər kəsə nəsib olan xoşbəxtlik deyil.***

İnsanların da işıqlısı, nurlusu olur – ay kimi, ulduz kimi… Bir var bu işıq, bu nur insanın öz içindən, mənəvi dünyasından gəlir, bir var ömür dediyimiz göz qırpımı müddətindəki bir yaşantıda qazanılır.

Mən Zülfüqar Abdullayev şəxsiyyəti haqqında düşünəndə həmişə gözlərimin önünə bir işıq, bir nur seli gəlir. Bu adam bütün varlığı ilə, yəni təpədən-dırnağa ziyalı, işıqlı, nurlu adamdır. Onun daxili dünyası, mənəvi aləmi kimi üzündən də, gözlərindən də nur tökülür. Həm də Zülfüqar müəllimin şəxsi həyatından ötən illərdəki əməllərində də ziya seli var.

Mən onu lap gənc yaşlarımdan tanıyıram, tanıyıram deyəndə… Zülfüqar müəllimlə şəxsi ünsiyyətim, bağlantım olmayıb. O vaxtlar o, Mirbəşir Rayon (indiki Tərtər) Partiya Komitəsinin birinci katibi idi, mən isə yerli radionun sıravi bir əməkdaşı. Yəni bu mənim üçün əlçatmaz ucalıq, bir yüksəklik idi. Hərdənbir onun apardığı partiya yığıncaqlarında iştirak etmək səlahiyyəti mənə də nəsib olurdu ki, yerli radio və qəzet üçün materiallar hazırlayım. O qədər savadlı, o qədər səlis və rəvan danışardı, özünü o qədər mədəni aparardı ki, içimdə yaxşı mənada, bir həsəd hissi yaranardı. Fikirləşərdim ki, kaş bütün rəhbərlər həyatda onun kimi ola bilsinlər! Üst-başından da mədənilik yağardı, sözlərindən də. Lakin bu mədəniyyətin, bu etik normaların içində ciddi bir tələbkarlıq, sərt bir nizam-intizam hökmü də var idi və bunu mən o dövr üçün çox təbii qəbul edirdim.

Rayon partiya komitəsinin işçilərindən həmişə giley-güzar eşidərdim: «Bu kişiyə bir arayış, bir layihə bəyəndirmək olmur, nöqtəsinə, vergülünə qədər hər şeyə diqqət yetirir. Yoxsa…». Onda yazı savadı da çox yüksəkdir. Azərbaycan dilinin qrammatikasını da, leksikasını da, ümumiyyətlə, bütün incəliklərini gözəl bilir. Həqiqətən, hər hansı bir yazılan sənəd haqqında Zülfüqar Abdullayevdən birinci dəfəyə razılıq alan adam rayonda savadlı adam sayılırdı.



Yadımdan çıxmaz… Bir dəfə yerli radio verilişlərinin diktoru hansı səbəbdənsə işə gəlməmişdi. Materialları efirə özüm oxumağa məcbur oldum. Yazıların birində şəhərin küçələrinin vəziyyəti tənqid olunurdu. Verilişi sonna çatdırıb evə döndüm. İş vaxtı qurtarmışdı. Bir az keçməmiş məni rayon partiya komitəsinə çağırdılar. Səhv etmirəmsə, rayon xalq nəzarəti komitəsinin sədri məni qəbul etdi. İçəri girən kimi «hücuma» keçdi: «Sən kiminlə razılaşıb o materialları efirə buraxmısan?! Niyə düzgün olmayan faktlarla rayon camaatının fikrini çaşdırırsan?! Bundan sonra şəxsən sənin bütün tənqidi materialların rayon partiya komitəsi ilə razılaşdırılandan sonra efirə buraxılacaqdır! Əks təqdirdə…».

Təbii ki, mən rayon xalq nəzarəti komitəsinin sədrinin belə yüksək tonla danışığından razı qalmadım və verilişdə tələb olunuan bütün qayda-qanunlara əməl edildiyini söylədim. Lakin o, mənimlə razılaşmadı.

Sonrakı gün öyrəndim ki, rayon partiya komitəsinin birinci katibi Zülfüqar Abdullayev yerli qəzetdə dərc olunan və yerli radioda efirə çıxarılan bütün materialları ciddi bir diqqətlə izləyirmiş və mənim oxuduğum bu verilişdə hansısa məqamın obyektivlikdən uzaq olması onun xoşuna gəlməyib.

O, mütaliəni çox sevir. Danışırdılar ki, katibin heç bir zaman boş vaxtı olmur. Ya qəzet-jurnal mütaliə edir, ya da bir yazı üzərində işləyir.

Həmin illərdə Tərtər rayonu üçün xeyli işlər görüldü və əlbəttə, mən bu işlərin xronologiyasına varıb, oxucuları statistika ilə yormaq fikrində deyiləm. Sadəcə olaraq onu demək istəyirəm ki, Zülfüqar Abdullayevin Tərtər rayonunda birinci katib işlədiyi illərdən vətəndaşların yaddaşında və həyatda çox izlər qalmışdır.

… Həmişə bu insanın həyatı ilə maraqlanmışam. Taleyin əlindən acı zərbələr daddığını da, ağrılı günlər yaşadığını da eşitmişəm. Bunlar da alın yazısıdır. İnsana Ulu Tanrı tərəfindən verilən ömür payında qismətdən, qəza-qədərdən kim qaça bilər ki?

Onu da eşitmişəm ki, son illər respublikamızda texniki-peşə təhsili sisteminin problemləri ilə ali mərtəbədə – Təhsil Nazirliyində məşğul olan adamlardan biridir.

İndi Zülfüqar müəllimin müdriklik çağıdır. O, el ağsaqqaları sırasında layiqli yerini ömrünün işıqlı və nurlu əməlləri ilə qazanmış bir insandır.

… Nə vaxtsa Zülfüqar Abdullayev kimi adamları göz önünə gətirərək belə bir şeir yazıb kitabımda dərc etdirmişdim:

**Elin hörmətini qazanmısan sən,**
**Yaxşılıq olubdur arzun, amalın.**
**O qədər deyiblər: «Üzün ağ olsun!»**
**Ağappaq ağarıb saçın, saqqalın.**

**Zülfüqar Abdullayevin**
**«Bir ömrün səhifələri» kitabı üçün**
**yazılmış xatirə.**
**2003-cü il.**



# «ÖLƏNDƏ GÜLÜŞ QOY QƏBRİMİN ÜSTƏ»

Şairlik – Allah vergisidir. Yazana o qalır ki, oturub yazmağın əziyyətini çəksin.

Arif Əzizbəylinin şeirlərini bu verginin ovsunu və sehri qucaqlayıb. Əsas heyrət yaradan onun yaşadığı öz aləmi, öz dünyasıdır.

Mən heç vaxt şeirin əruz, heca və yaxud sərbəst vəzndə yazıldığının fərqinə varmamışam. Vacibi odur ki, heç kimin yaşamadığını yaşayasan və duyğularını elə qələmə ala biləsən ki, onu hər oxuyan heyrət eləyə – Arif Əzizbəyli kimi.

Onun Sizə təqdim olunan bu ilk şeirlər toplusunda cəmlənmiş nümunələrin bəzilərində oxucular ola bilsin ki, hardasa bölgülər, qafiyələr, sığalsız sözlər, deyim tərzindəki narahat ifadələr və digər standart qəliblər baxımından irad axtarsınlar. Zənnimcə buna ehtiyac yoxdur. Siz əsas sözlərin fikir və məna yükünə, poetik tapıntılara, ən başlıcası isə hiss və duyğu yaşantılarına diqqət yetirin. Onda Arif Əzizbəylinin necə həssas, necə Vətəninə vurğun və necə səmimi bir şair olduğunu duyacaqsınız.

**Vətənimdə Vətən mənə yad gəlir –**
**Yaman oxşayıram qəribə, dünya.**

Elə bunun ardınca:

**Özün yetişdirdin cinlər, şeytanlar,**
**Özün qəribəsən, qəribə dünya.**
***«Qəribə dünya»***

beytlərini oxuyandan sonra Arif Əzizbəyli yaradıcılığının mahiyyətini anlayacaq və biləcəksiniz ki:

**Dərk edib yaşamaq müsibət imiş**
**Bu bivəfa, bu baş-ayaq dünyada.**
***«Kədər karvanı»***

Arif Əzizbəylinin dünyası dörd yox, iki qütbdən ibarətdir – məhəbbət və nifrət. Onun məhəbbəti də, nifrəti də adilikdən fərqlidir – sevgisində həm gül-çiçək ləçəkləri qədər zəriflik, həm də ürəyin kövrək çiskini, nifrətində isə qaya çarpanağının sərtliyi və satiranın ülgüc itiliyi yatır.

Öz tanrısına müraciətdə də sinəsindəki püskürtünü və varlığına hopmuş üsyankarlığı saxlaya bilmir:

**Bəsdir üz çevirdin, bəri də boylan,**
**Tanrım, mən də sənin qulunam axı!**
***«Yaradana müraciət»***

Görün onun köksündə Vətənlə bağlı necə gözəl ülviyyət yaşayır:

**Qəlbini verdin Vətənə, Arif, başqa nəyin var ki?**
**Təkcə qurğuşun yeməyə qaşlarının arası var!**
***«Var»***

Arif Əzizbəylinin təbiət şeirlərinin də özünəməxsusluğu vardır. Doğma torpaqlarımızı, dağlarımızı, dərələrimizi düşmən tapdağına çevirənlərin əvəzinə o necə də ürəkdən heyfsilənir:

**Nə halın sormağa çatır qüdrətim,**
**Nə də sarımağa yaranı, dağlar.**
***«Dağlar»***

Arif Əzizbəylinin şeirlərinin demək olar ki, əksəriyyətində qəm yuvalanıb və bunu təbii qəbul etmək lazımdır. Vətəni para-para olmuş, hələ də yaralarından qan sızan torpağımızın harayını eşidən bir şairin sevincində də qəm ağlamalıdır. Özünün dediyi kimi:

**İnsan kənar olsa dünya qəmindən, insan olmaz.**
***«Olmaz»***

Və bu qəmin ağuşunda ürəyinə üz tutan şairin:

**İllərin ağrısı, əzabı səndə –**
***«Ürəyim»***



deyimindən sonra:

**Dərd içində dərddən başqa nə yazım?**
***«Almasa»***

sualına cavab tapmaqda adam acızləşir.

**Vətənsiz nəyə gərək axirətin cənnəti?**
**Arifin o dünyası, bu dünyası Vətəndir.**
***«Vətəndir»***

Mənə elə gəlir ki, Vətən sevgisinin belə obrazlı ifadəsi hələ heç kimə nəsib olmayıb.

**Nə Vətəndən, nə də səndən doyaram,**
**Sevgi dolu bir dünyayam, qadası.**
***«Qadası»***

Həqiqətən də Arif Əzizbəyli bu dünyada məhəbbətlə, sevgi ilə silə ayrıca bir dünyadır. Onun məhəbbət dolu şeirlərindəki eşq Tanrı tərəfindən əta olunmuş ilahi eşqdir.

**Etdim ömrə vida, duymadım eşqin əsərindən.**
***«Vətən eşqi»***

Bu eşq Füzuli eşqinə, Səməd Vurğun eşqinə bənzəyir.

**Cəhənnəm dəhşəti nə olduğunu,**
**Sənsiz dərd əlində qalanda bildim.**
***«Bildim»***

**Səadət qatarı yollarda qalıb.**
***«Bağışla məni»***

**Ürəkdən asılan daşdı tənhalıq.**
***«Sənsiz»***

**Gözəllikdir canı, qanı Arifin –**
***«Ceyranım»***

beyt və misraları ilə Arif Əzizbəylinin hansı qüdsiyyətlə yaşadığına timsalların azacığıdır.

Onun həyat fəlsəfəsi öz məntiqinə söykənir:

**Qızıl gül koluna bənzəyir həyat –**
**Üstündə tikanı, gülü, yarpağı…**
***«Həyat gözəldir»***

**Nə olsaq, kənara atmayacaqdır –**
**Alacaq qoynuna özü torpağın.**
***«Torpağın»***

Mərhum dostu Quliyev Mətləb Zeynal oğlunun əziz xatirəsinə ünvanladığı:

**Sən birdən köçmüsən, mən yavaş-yavaş –**
***«Sənə möhtacam»***

misrası göz yaşlarıynan doludur.

Arif Əzizbəylinin hiddətində də bir qəribəlik var:

**Hardandır səndəki bu yad fikirlər?**
**Anan yaxşı bilər, anandan soruş.**
***«Millətindən xəbərsiz natiqə»***

Və nəhayət:

**Bu da bir ömürdür, yaşadıq, gedək –**
***«Gedək»***

deyən şairin kövrək hisslərinin yağmurunda çiçək qızı Jaləyə yazdığı şeirin bir misrasındakı cazibə qüvvəsi adamı heyrətə gətirməyə bilməz:

**Öləndə gülüş qoy qəbrimin üstə.**
***«Qızım»***

Bax, budur sözün məqamı! İlahi sözün ovsunu da, sehri də budur! Yazanda da belə yazasan!

Arif Əzizbəyli elə təkcə bu misrası ilə də yaddaşlarda əbədiyyət qazana bilər.

Və son olaraq, deyim ki, bu iki-üç səhifəlik ön söz get-gedə



püxtələşən, aydınlaşan, hamarlaşan və narahat sözlərdən xilas olan Arif Əzizbəyli qələmi haqqında çox qısa tanışdığın çox da qısa təqdimatıdır. Sonralar bu ürəyi bulaq suyu kimi duru və pak olan bir insanla daha yaxından tanış olub ülfət bağlayacağıq.

Sağlıq olsun!

**Arif Əzizbəylinin**
**«Yaman darıxmışam özümdən ötrü»**
**kitabına yazılmış ön söz.**
**2005-ci il.**

# QEYRİ ADİLİK

Xoşbəxt bəndə odur ki, köçüb gedəndən sonra da zaman-zaman yaşayır və belə əbədiyaşarlıq müstəsnalara qismət olan tanrı bəxtəvərliyidir. Bu həm taleyin, baxtın gətirməsidir, həm də əməllərin cövhərindəndir, qayəsindəndir.

Adiliklə qeyri-adilik bəzən bəşər övladı tərəfindən idrakla qəbul olunmur, bu, ona gah möcüzə, gah da əllaməlik kimi görünür. Hər halda, həmin qeyri adilər, adilər kimi deyillər, istər obyektiv reallıq kimi dərk edilsinlər, istərsə də əksinə. Əsl şairlər də bu qəbildəndir. Klassiklərimizdən Məmməd Araza qədər və ondan sonra olacaq qeyri adilərə qədər hamı adilərdən seçilib, iç dünyası ilə də. Davranışları da, xarakterləri də, ümumidən fərqlənib ayrı cür olub.

Bu fani dünyayla ömürləri boyu qovğalarda olan qeyri adilərin adları tarixlə dost olub. Qədirbilən tarix belə şəxsiyyətləri, nə qədər ki, bəşər övladı var, yaşadıb və yaşadacaqdır, Xasay Hacıyev kimi.

İnsanların qarşısında cismən cəmi 52 il yaşadı: heç nə. Yəni daş ömrüylə, dağ ömrüylə müqayisədə heç nə. Amma mənayla doluydu bu 52 il. Əzabdan, zülüm-zillətdən də xali deyildi.

1925-ci il aprelin 28-də Qərbi Azərbaycanın Göyçə mahalındakı Daşkənd kəndində dünyaya gəlmişdi. Nankor varlıq olan ermənilərin haram niyyətləri ucbatından öz doğma yurdundan, yuvasından ellilәri kimi didərgin düşmüşdü. Gəlib Bərdə rayonunun ərazisində yeni bir Daşkənd salmışdılar. (Görəsən bu Daşkənd o Daşkəndin yerini vermişdimi?!). Özü fizika-riyaziyyat müəllimi ola-ola xalq ədəbiyyatının vurğununa çevrilmişdi. Uşaq yaşlarından mənəvi dünyası sirli-sehirli bir aləmə qucaq açmışdı və bu qucaq Abbas Tufarqanlıdan tutmuş Aşıq Ələsgərə qədər, Nizamidən, Füzulidən baş almış Mirzə Ələkbər Sabirə, Səməd Vurğuna qədər olan söz incilərilə dolmuşdu.

1977-ci ildə bu etibarsız dünyadan köçsə də, etibarlı tarixdən köçməmişdi və o öz şeirlərilə indi də yaşayır, bundan sonra da yaşayacaqdır.



**Taleyin işini bilmək çətindir,**
**Bu gün ayaq olan, sabah baş olar.**
**Haqqa nahaq demə, bəzən düşmənin,**
**Səninlə üzbəuz, başabaş olar.**

* * *

**Gücünlə öyünmə, dayağın gedər,**
**Solar yanaqların – boyağın gedər.**
**Qəza hökm eyləyər, ayağın gedər,**
**Əzabda, zillətdə qalan baş olar.**

***«Olar»***

Siz bu şeirdəki həyat fəlsəfəsinə baxın, nə qədər sadə, nə qədər gözəl! Elə bil ki, hər söz «yüz dəfə ölçülüb, bir dəfə biçilib». Poeziya dünyasının sirri, sehri də məhz bundadır.

Arı şanında bir yuvanın tutumu bir qırıqdır. Amma bu «bir qırıqlıq» çiçəyin, gülün şəhdindən zərrə-zərrə komalanıbsa, arının yüz dəfə çəmənə uçub pətəyə dönməsindən əmələ gəlibsə, ondakı dada, tama, ondakı ətrə bax da!

Söz də belədir. Gərək bir söz çəmənindən gərək bir «çimdik boyda» elə söz tapasan ki, o çəmənin ətrini verə, rayihəsini özündə cəmləyə, Xasay Hacıyevin sözləri kimi.

**Soraqlama, tapammazsan dayazda,**
**Gəzirsənsə, dərinlərdə gəz məni.**

***«Məni»***

**Dilim quruyaydı, kaşki öləydim!**
**Söyləyə bilmədim elə dərdimi.**
**Göz yaşımla məzarımı yuyaydım,**
**Çəkməyəydim sənin belə dərdini.**

* * *

**…Qəm qoymur, gecələr yata bilmirəm,**
**Gündüzlər bir qərar tuta bilmirəm.**
**Xasayam, çıxarıb ata bilmirəm –**
**Etmişəm qəlbimə şələ dərdimi.**

***«Dərdimi»***

Sözlərdəki yanğı, mənadakı kövrəklik, hissdəki göz yaşları adamın ürəyinə büruncək olur, ovqatına bahar çiskini, payız çən-dumanı gətirir, mənəvi dünyasında bir çalxanma, bir laxlanma yaradır.

Xalqın sadə dilində fikri belə səlis, rəvan demək, belə sığallamaq, belə ovsuna çevirmək adilərin işi ola bilməz, bu, qeyri-adilərə məxsus işdir.

Nakam sevgidən hamı yazıb, hərə bir cürə gileylənib. Xasayın vüsalsız sevgisi isə tamamilə başqadır, onun şikayəti də tutumludur, mənalıdır, düşündürəndir.

**Əzəlindən olmamışam könlündə –**
**Qayıda bilmərəm ürəyinə mən.**
**Canımla bərabər dünyanı qıydım,**
**Çevrilə bilmədim gərəyinə mən.**

* * *

**…Sən Xasaya yaman atdın kəməndi,**
**Hər yandan bağladın bərəni, bəndi.**
**Nə kəmər olmadım, nə də qolbəndi,**
**Bağlanam belinə, biləyinə mən.**

*«Mən»*

Xasay Hacıyevin qələmi bulaq kimiymiş, şeirləri isə bulaq suyu. Kim duyğu təşnəsidirsə, buyursun, ovuclayıb içsin, yanğısına ilac eləsin.

İndiki «qara su», «şeirlər» ciyərimizi, ürəyimizi, gözümüzü, əsəblərimizi pörşələyib, dilimizi-dodağımızı yandırıb, bəzən su xətrinə içmişik, ta da susuzluqdan yanmışıq, yanğı üstünə yanğı gəlib.

Vətən həsrətinin tonqalına nəzər salın:

**Göyçə, sənin həsrətinə dözməyib,**
**Oğlun doğma ocağına gəlibdi.**
**Hicranından hey qalmayıb canında,**
**İsti ana qucağına gəlibdi.**

* * *



**Yaman yerdə səndən üzüldü əlim,**
**Bir xəyala döndü ilkim, əzəlim.**
**Bu nisgilli qəlbim, yaralı könlüm,**
**Pərvanədir çırağına gəlibdi.**

*«Gəlibdi»*

Etibarsız «dost» haqqında bəlkə də Xasay kimi sərrast deyən olmayıb. Vəzifə, taxt-tac, var-dövlət çox adamı dəyişdirir, dünyasını xaraba qoyur, mənən urvatsız hala salır. Şair belə bir tanışını obrazlı ifadələrlə yazıq günlərə qoyur.

**Yəqin fikirləşdin kasıblamışam –**
**Xələtə, nəmərə pulum çatışmaz.**
**Bəlkə elə bildin belim bükülüb –**
**Boyuna salmağa qolum çatışmaz.**

* * *

**Sənə ki, doğmaydı ocağım, tüstüm,**
**Nə tez gözlərindən yox oldu büstüm?**
**«Dilavər» olmusan, ay «əziz dostum»,**
**Sənlə danışmağa dilim çatışmaz.**

* * *

**İndi sən «aqilsən», Xasay da «dəli»,**
**Qanıram bunları, qanıram, bəli.**
**Mən sadə bir adam, sənsə rütbəli,**
**Uzatsam əlinə əlim çatışmaz.**

*«Çatışmaz»*

Dünyaynan tutaşmağa kimin gücü çatar ki? Bu işə girişənin ağlı yoxdu ən azı. Amma bir yandan «quzu», bir yandan bu «qurd» dünyanı nadanlara tanıtmaq, nə olduğunu anlatmaq istəyini adam saxlaya bilmir. Elə ona görə də Xasay dünyanın nəyi var, açıb qoyur ortaya:

**Neçəsini haqq yolundan azdırıb,**
**Bu tamah dünyası, oyun dünyası.**
**Neçə könüllərə şeytan saldırıb,**
**Bu paxıl dünyası, xayın dünyası.**

**Haqqa, ədalətə tələ qurubdu,**
**Dərdimənd kimsəni dərddən yorubdu.**
**Qananın qoluna buxov vurubdu,**
**Olubdu axmağın, səyin dünyası.**

* * *

**Qoynunda min döyüş, min qan olubdu,**
**Xasayın çəkdiyi hicran olubdu.**
**Əzəldən məzluma zindan olubdu,**
**Əzazil sultanın, bəyin dünyası.**
***«Dünyası»***

Dünya budu. Kim bilmirsə, bilsin. Sən ha dördəlli yapış ondan.

«Hər fəsil başında bir sitəm» olan Xasayın vətən nisgili çox göynəmli olub. Vətənini, torpağını sevməyən kəsin ana, ata sevgisinə şübhə var. Əgər kiminsə canı, qanı, büsbütün varlığı doğulduğu, böyüdüyü dədə-baba yurduna məhəbbətlə, istəklə silə deyilsə, qürbətə düşəndə o elin, o obanın həsrəti, intizarı onu üzmürsə, kefnən-damaqnan yaşaya bilirsə, həmin kimsədən danışmağa dəyməz ki!

Xasay Hacıyev mənəviyyatca, həyatca, nəfəscə öz vətəninə bağlı adam olub. Elə ona görə də doğma yurdundan uzaqda çox yaşaya bilməyib. Nisgil, həsrət, intizar qoyub ki, yaşasın?!

**Bir qərib aşiqəm bir yad mahalda,**
**İtirmişəm ceyranımı bu yerdə.**
**Yollara nabələd, yorğun səyyadam,**
**Qaçırmışam tərlanımı bu yerdə.**

**Sonra:**
**Təbibsiz, loğmansız bitab xəstəyəm,**
**Axtarıram dərmanımı bu yerdə.**
***«Bu yerdə»***

deyir, amma tapa bilmir. Dərmanı tapılmayan xəstə isə ömrün 52 aşırımını aşa bilibsə, bu, zor işdir.



Xasay Hacıyev nə mövzu sarıdan qıtlıq çəkib, nə də qələm ucbatından qəhətliyə düşüb. Yəni o, hər hansı detaldan yazıbsa, onu poetikləşdirməyə asan nail olub, fikirlərin, duyğuların təsvir olunan hər şeylə harmoniyasını yaradıb, onları qolboyun edib, qucaqlaşdırıb. Bu isə şairliyin əsas şərtidir.

Xasayın şeirlərində Azərbaycan dilinin balı, qaymağı var. Xalq dilində elə yazır, xalq deyim tərzindən elə istifadə eləyir ki, onun şeirlərini oxuyanda sanki xalq musiqisinə qulaq asırsan, dilimizin nə qədər zəngin, nə qədər gözəl olduğuna bir daha vurulursan. Az qala yaddan çıxarılan, lüğətlərdən silinən arxaik sözlər Xasayın qələmində şəkərə, qəndə dönüb:

**Ləlidim, yalvardım, yola gəlmədin,**
**Qarşında quzu tək mələdim, bəsdi.**
**Mən həqiqi Məcnun, sən özgə Leyli,**
**Gözümdən qanlı yaş ələdim, bəsdi.**
***«Bəsdi»***

**Əl açaraq ulduz, aya yalvardıq,**
**Olub-keçən haqqa-saya yalvardıq.**
**Gah seyidə, gah mollaya yalvardıq,**
**İnkir-minkir, qiyamətin ucundan.**
***«Ucundan»***

Xasay Hacıyevin şeirlərinin hansı kəlməsini «sıxsan» məna süzülər. Onun deyim tərzində də, poetik tapıntılarında da özünəməxsusluq var, kədəri, sevinci də özünündü, həsrəti, vüsalı da. Amma həsrəti daha çoxdu.

**Bu həsrətdən doyaydım,**
**Elə müjdə yayaydım.**
**Qoşulub durnalara,**
**Vətənə qayıdaydım**
**Durnalar qayıdanda.**
***«Durnalar qayıdanda»***

Müqəddəs arzuymuş. Heyif ki, yerinə yetmədi.

Heca vəzninin ən daşlı-kəsəkli yolu, ən ağır işi təcnis yazmaqdı. Burda gərək həm tapdanmış yolnan getməyəsən, həm də ən azı üç-dörd məna verən eyni sözlər, cinas tapasan. Abbas Tufarqanlıdan, Aşıq Alıdan, Aşıq Ələsgərdən, daha nə qədər belə nəhənglərdən sonra cinas «ceyranın belinə çıxıb», tapılmaz ki, tapılmaz! Amma Azərbaycan dilinin zənginliyi bu dili mükəmməl bilən təcnis ustalarını heç vaxt darda qoymayıb. Xasay Hacıyev də belə bilicilərdən olub. Onun təcnislərini oxuyub, sözlərin məna dərinliyinə vardıqca, adamı heyrət bürüyür. Şairin «O yara hər ay», «Ayağına mən», «Bir yardı», «Boyağı verər» təcnisləri bu sıradandır.

Sözümün sonunda şair Sərraf Şiruyəyə bir daha hörmət və izzətimi bildirirəm ki, belə istedad sahiblərini axtarıb-arayır, xalqın yaddaşına köçürmək üçün körpü olur.

**Xasay Hacıyevin**
**«Babamın dərdi» kitabına yazılmış**
**ön söz**
**2007-ci il.**



# OVSUN

**Bu fələknən nərd atasan,**
**Şeş-beş verən zərin ola.**
**Ortalığa bəxt qoyasan,**
**Aparmağa sərin ola.**

* * *

**Söz yığasan demək üçün,**
**Dost tapasan kömək üçün.**
**Bu dünyanı yemək üçün**
**Ağlın, huşun dərin ola.**

* * *

**Ürəyini bənd etməyə,**
**Ləblərini qənd etməyə,**
**Zülfünü kəmənd etməyə**
**Mələkmisal pərin ola.**

* * *

**Ay Şiruyə, al geyəsən,**
**Yaman gözə gəlməyəsən.**
**Bir deyənə beş deyəsən,**
**Arxanda bir nərin ola.**

Elə təkcə bu şeir bəs edərdi ki, Sərraf Şiruyə elin yaddaşına köçsün. Halbuki, belə sığallı, şirin və dərin mənalı şeirləri az deyil. Azərbaycanın bütün bölgələrində uşaqdan böyüyə qədər kimi dindirsən, bəlkə də bu şeiri əzbər deyər. Şiruyə şeiri, Şiruyə qələmi, Şiruyə təbi, Şiruyə ovsunu budur!

Mənim burada Sərraf Şiruyənin tərcümeyi-halından danışmaq fikrim yoxdur. Şairin şeirləri elə onun tərcümeyi-halıdır. Yalnız onu deməklə kifayətlənmək istərdim ki, şair Məmmədhüseynin, Aşıq Nəcəfin, Xəyallı Həsənin yurdunda dünyaya gələn Şiruyə elə beləcə, indiki Sərraf Şiruyə olmalı idi.

Nənəsi Başxanım Şəfiqızının ilahi təbindən baş alan atası Xəyallı Həsənin ilham dəryasında Şiruyə adlı bir dalğa yaranmalı

malı idi və yarandı da. Onun doğulduğu şairlər ocağının Şiruyə ilhamı sözün ilahi məqamına yetməliydi. Belə də oldu.

Deyirlər ki, zirvələr uzaqdan əzəmətli, vüqarlı görünür. Ucalığa yaxınlaşdıqca əvvəlki heyrət azalır.

Yaxınlarının gözündə Sərraf Şiruyə bəlkə də elə adi Şiruyə müəllimdir. Bu, təbiidir. Lakin onu da bilmək lazımdır ki, Şiruyəni şeirlərilə uzaqdan tanıyanların nəzərində o bir istedad zirvəsidir ki, bu ucalıq hələm-hələm belə urvatla sevilməz. Haqdan gəlmə vergili şair ayrı necə ola bilər ki?

Büllür gözlü həzin bir bulağın «Segah»ının ovsunundan kim sehirlənməyib, zirvələrdən sellənən şaqraq bir şəlalənin «Mənsuriyyə» ecazından kim heyrətlənməyib ki, Sərraf Şiruyənin cilvəli şeir çağlayışından da beləcə sehirlənməsin, heyrətlənməsin?! Şiruyənin poeziyası ulu xalqımızın müdrikliyindən qaynaqlanır. Onun söz düzümündən hansı mövzu nəğmələnirsə nəğmələnsin, o mövzunun cövhəri, mayası istəkdən, sevgidən, vurğunluqdan yoğrulur. Həsrətin göynəmindən gizildəyən Şiruyə şeirlərinin nüvəsində də həmin istək, həmin sevgi, həmin vurğunluq uyuyur. Yəni onun öz dərdinə də, həsrətinə də vurğunluğu var. Çünki dünyanın necə dünya olduğunu bilir, insan ömrünün fəlsəfəsini anlayır:

**Bu dünya insan üçün**
**Yalanıymış sən demə.**
**Verdiyini hər nə var**
**Alanıymış sən demə.**
***(«Sən demə»)***

**Dünya oyuncaqdır naşı gözündə,**
**Olur ağılsızın başı gözündə.**
**Şahların quruyub yaşı gözündə,**
**Gözlərində yaş apara bilməyib.**
***(«Bilməyib»)***

Mənə Sərraf Şiruyənin iki kitabına ön söz yazmaq şərəfi qismət olub və hiss edirəm ki, hər ikisində də onun çağlar ilhamına layiq söz deyə bilməmişəm.



Şiruyəni tanımamışdan onun sözlərini, nəğmələrini tanımışdım.

Sərraf Şiruyə məncə, çoxdan bu elin, bu obanın yaddaşına köçüb və orada özünə elə yurd salıb ki, qərinələr keçsə də, bu iz, Qobustan qayalarının yazıları kimi silinməyəcək, aşınmayacaq, sazlı-sözlü Azərbaycan dünyasının yaddaşında nəsildən-nəsilə keçərək, əbədiyaşarlıq tapacaqdır. Çünki Şiruyənin şeir dili, şeir danışığı öz doğma xalqının dili, xalqının danışığıdır.

Onun Vətən sevgisi, Vətən istəyi pak sevgidir, halal istəkdir. Bir daşı, bir ovuc torpağı, hətta budağı, yarpağı da Vətən bilən şairin yurd sevgisinə heyrət etməmək olmur.

**Hər nazik bir cığır, adi bir keçid,**
**Hər bələn, hər sızqa bulaq Vətəndir.**
***(«Vətəndir»)***

O, Vətənə biganəliyi heç kimə, hətta doğma qardaşına, könül sirdaşına belə bağışlamayan vətəndaş şairdir.

**Şiruyə, yurdunu düşmən oxlasa,**
**Bir ocaq yerini girov saxlasa,**
**Bir yağı tapdasa, yad ayaqlasa,**
**Torpaq qan ağlayar, daş ağrı çəkər.**
***(«Ağrı çəkər»)***

Mənim fikrimcə, əsl poeziya nümunəsi odur ki, onda nəinki hər misraının, hətta hər sözün də pətəyi poetik fikirlə elə dolsun ki, oxucusunu sehirləməyi, ehtizaza gətirməyi bacarsın. O şeir ki, səni məhvərindən oynatmadı, mənəvi dünyanı silkələmədi, səni çalxalandırmadı, nəyə gərəkdir ki?! Şeir gərək ovqatda dəyişiklik yaratsın. Şiruyə şeiri də məhz belə şeirdir.

Sərraf Şiruyənin şeirlərində Aşıq Ələsgər şeirinin hikməti, Aşıq Alı şeirinin göynəmi, Dədə Şəmşirin nəfəsi var, lakin, bunlar o demək deyildir ki, təqlid var, eynilik var. Sadəcə duyğuların eyniliyi var, gözəlliyə məftunluq eynidir, vətənə məhəbbət eynidir, nəhayət, dərdə, məlala, hicrana dözüm eynidir.

Dostu Yelmara ünvanladığı şeirdə:

**Hər tərəfdən dərd yeriyib üstümə,**
**Köməyə gəl, bir bərəm ol, bəndim ol.**
**Taleyimdən gələn qismət acıdı,**
**Bircə dəfə şəkərim ol, qəndim ol.**

* * *

**Nə rütbəm var, nə vəzifəm – adsızam,**
**Ona görə ağızlarda dadsızam.**
**Kimsəsizəm, yuvasızam, yurdsuzam,**
**Sən obam ol, ocağım ol, kəndim ol –**

deyərək, dostluğun təmənnasız dünyasında hansı tələblərin şərtləndiyinin sətiraltı mənasından başqa, həm də dar gündə, dar məqamda dostların nə qədər arzulandığını və gərəkli olduğunu oxuculara çatdırır.

«Həyatın qiymətini biz ölümə borcluyuq» – deyən Bəxtiyar Vahabzadə fəlsəfəsi Şiruyə qələmində ayrı məcraya yönəlir:

**Sevinci qəm, dərmanı dərd,**
**Şirini acı sevdirər.**
**Dostu düşmən, mərdi namərd,**
**Qardaşı bacı sevdirər.**

* * *

**Hikmət deyək təzadlara,**
**Al günəşə, yağan qara.**
**Baharı qış, ağı qara,**
**Gündüzü gecə sevdirər.**
***(«Sevdirər»)***

Zənnimcə, şairləri şair edən səbəblərdən biri məhəbbətdirsə, digəri təbiətin gözəlliyidir. Şiruyə ömrünün indiki çağında da təbiətdən və məhəbbətdən elə hərisliklə, çılğınlıqla yazır ki, görməyənlər deyər: «Bu şairin bığ yeri təzəcə tərləyir».

Abbas Tufarqanlıdan, Aşıq Alıdan, Aşıq Ələsgərdən, Növrəs İmandan sonra yaranmış cinas qəhətliyində yeni söz tapıb, təcnis yazmaq, həqiqətən, zor işdir. Amma Şiruyə üçün bu, elə



bil ki, sığallı qoşmalar yazmaq qədər asandır. Handa da qala dodaqdəyməz cığalı təcnis ola.

**Talanan şəhərin, dağılan kəndin**
**Qalsa, nişangah tək hasarı qalar.**
**Aşıq hasarı qalar,**
**Dərddən ha Sarı qalar.**
**Dağın qartalı getsə,**
**Yerdə ha sarı qalar.**
**Dindirsən yar deyib, yaxşılar ağlar,**
**İstəkdən yadında ha Sarı qalar.**
***(«Hasarı qalar»)***

Yazarlar yaxşı bilirlər ki, əruz sirli-sehirli bir aləmdir. Əruzun bəndi-bərəsi elə müdhiş sıldırımlıdır ki, yazmaq istəyəni vahiməyə salır. Şiruyəni isə…

**Gözəlim, istərəm ki, can ilə canan qovuşa,**
**Bu həsrət könlüm ilə istədiyi can qovuşa.**

* * *

**O qədər vəslin üçün ahu-nalə eyləmişəm,**
**Qorxuram kirpiklərim arasında qan qovuşa.**

* * *

**Bizim vüsal gecəmiz həsrəti-hicranı yıxa,**
**Qovuşa bir-birinə, qovuşa, hər yan qovuşa.**

* * *

**Neçə şair-şüəra vəsf eyləyə bu gecəni,**
**Şiruyə bu aləmə ürəkdən, candan qovuşa.**

Sərraf Şiruyənin yaradıcılığı o qədər çoxcəhətli və çoxşaxəlidir ki, həqiqətən, adam bilmir hardan başlayıb, harda qurtarsın. Bəlkə də, hiss elədiniz, mən ha çalışdım ki, fikrimi yığcam şəkildə sizə çatdırım, amma etiraf edirəm ki, bunu bacarmadım. Çünki bir şeirindən danışmaq istəyirsən, o biri inciyir, o birindən söz açmaq istəyirsən, bu biri küsür. Heç birindən də keçmək olmur.

Buna görə də mənim yazım qısa yox, yarımçıq alındı. Güman edirəm ki, bu günahımı Şiruyə müəllim bağışlayar.

Şiruyənin irihəcmli əsərləri, ələlxüsus, poemaları maraqlı diskussiyaların mövzusudur. Həmçinin, qəzəllərinin, divanilərinin, təcnislərinin, gəraylılarının, bayatılarının hər biri ayrı-ayrılıqda sirli-sehirli dünyadır. Ümumiyyətlə, Şiruyə hansı mövzudan yapışır-yapışsın, onu çox asanlıqla şirin bir şeirə çevirir.

Sərraf Şiruyənin son dövrlərdə yazdığı poemalarının mövzusu əsasən ağrılı yaramızdan – Qarabağ müharibəsindəndir. Bu irihəcmli əsərlərdə məkrli, xəyanətkar niyyətlərinə çatmaq üçün hər vasitəyə əl atan ermənilərin Azərbaycan xalqının başına zaman-zaman gətirdikləri müsibətlərin, məşəqqətlərin poetik bir dillə, tarixi faktlarla ifadəsi, torpağımız uğrunda ölüm-dirim savaşına qalxan, şəhid olan ərən igidlərimizin şücaətləri, qəhrəmanlıqları öz əksini yetərincə tapmışdır. Bu əsərləri oxumağa başlayan andan sona qədər şair sanki millətin yaxasından tutub silkələyir, erməni erməni kimi tanımadığı üçün onu qınayır və daldığı qəflət yuxusundan oyatmaq istəyir, hamını, əsl vətəndaş, əsl yurddaş olmağa səsləyir.

Onun «Vətən sizə oğul dedi», «Od oğlu odun içində», «Cəsurlar», «Ölümdən sonrakı ömür», «Ölümdən betər», «75 yara və ya «Dəmir Yelmar»» kimi irihəcmli poemaları məhz bu qəbildəndir. Sərraf Şiruyənin bu əsərlərinin hər biri erməni separatizminin, erməni vandalizminin, erməni vəhşiliyinin Azərbaycan xalqının taleyində yaratdığı göynəmli ağrıların, qanlı izlərin və iyrənc xislətin real faktlarla ifadəsi, həmçinin Vətən, Torpaq uğrunda döyüşən, canlarını qurban verən oğul və qızlarımızın qəhrəmanlıq dastanıdır.

Şiruyənin «Loğman dağı» və «Ana torpaq» poemaları da onun nə qədər geniş poetik imkanlara malik olduğunu təsdiqləyən əsərlərdir.

Şiruyənin dastanlar müəllifi kimi qazandığı şöhrət də yetərincədir. Onun «Aşıq Nəcəf və Gülüstan» dastanı Dədə Ələsgərin şəyirdi Göyçənin Daşkəndindən olan çox istedadlı saz-söz ustası Aşıq Nəcəfin faciə ilə bitən həyatının qəmli hekayətidir. Qəddar və qansız ermənilər tərəfindən Aşıq Nəcəfin üç igid oğlunu gözləri qabağında çala qazıb diri-diri basdırmaları, özünün isə kürəyinə qaynar samovarı bağlayıb öldürmələri bu məhəbbət dastanının gözüyaşlı səhifələridir.



Yazıqlar olsun ki, möhtəşəm bir söz zirvəsi olan Aşıq Nəcəfin ibrətamiz həyat və yaradıcılığı Azərbaycanda barmaqla sayılası qədər az-az adama bəllidir.

Şiruyə belə nadir şəxsiyyətləri üzə çıxaran, onların həyat yollarını öz qələmiylə örnəyə çevirməyi bacaran sənətkarlarımızdandır.

Onun «Göyçəli Hacı Rəhim dastanı» sanki tarixi bir qəhrəmanlıq salnaməsidir. Müəllif bu əsərdə Hacı Rəhimin necə qorxmaz, cəsarətli bir igid olmasının təsvirilə yanaşı, onun həcc ziyarətinə getməsindən, tədbirli, sanballı, sözü ötkəm, ümumiyyətlə, «köhnə kişi»lərdən olmasından çox maraqlı və şirin bir dillə danışır, o dövrün adlı-sanlı, qoçaq kişilərilə bizi tanış edir. Dastanda ən maraqlı məqamlardan biri Hacı Rəhimin erməni generalı Selikovun başını xəncərlə necə kəsdiyini təsvir edən səhnədir (Həmin xəncəri nadir xatirə kimi Sərraf Şiruyə bu günə qədər saxlayır).

Biz gərək özümüzə bağışlamayaq ki, belə xalq qəhrəmanlarımızı hələ də millətimizə yaxşı tanıda bilməmişik, onların adlarını əbədiləşdirmək üçün heç nə etməmişik! Heyiflər olsun!

Coşqun təbli Sərraf Şiruyənin uzun illər boyu bədii düşüncələrinin məhsulu olan «Ağlama, bülbül, ağlama» (1994), «Ölümdən sonrakı ömür» (1997), «Cəsurlar» (2000), «İgid ölər, adı qalar» (2002) kitabları çağdaş poeziyamızın sanballı nümunələrindəndir.

Yaratdığı belə gözəl əsərlərinə və bənzərsiz şeirlərinə görə Sərraf Şiruyə Azərbaycan Yazıçılar Birliyinə və Azərbaycan Jurnalistlər Birliyinə üzv qəbul olunmuş, «Məmməd Araz», «Qızıl Qələm», «Həsən bəy Zərdabi» mükafatları laureatı diplomlarına layiq görülmüşdür.

Əlbəttə, yaradıcı adamların əməyinin dövlət tərəfindən qiymətləndirilməsi, onlara fəxri adların verilməsi çox yaxşı haldır. 60 yaşını haqlamış Sərraf Şiruyənin də yüksək dövlət qayğısına mənəvi ehtiyacı var. Amma xalqın öz nəzərində «Xalq şairi» olmaq da heç pis deyil.

**2006-cı il.**

